**AZƏRBAYCAN DİLİ və ƏDƏBİYYAT TƏDRİSİ**
Elmi-metodik jurnal. 1954-cü ildən nəşr olunur.
ISSN 2790-0738 (Print); ISSN 2791-0911 (Online)

Azərbaycan Respublikası Təhsil Nazirliyinin 5 may 1997-ci il tarixli Nizamnaməsi ilə təsdiq edilmiş, Azərbaycan Respublikası Mətbuat və İnformasiya Nazirliyində dövlət qeydiyyatına alınmışdır. Seriya AB № 022436, Qeydiyyat № B236

“Azərbaycan dili və ədəbiyyat tədrisi” humanitar elmlər istiqaməti üzrə dilçiliyin və ədəbiyyatşünaslığın bütün sahələrinə aid Azərbaycan, türk, ingilis və rus dillərində orijinal, yüksək keyfiyyətli elmi məqalələr dərc edən, dilimizin saflığı və işləkliyini qoruyan, Azərbaycan dili və ədəbiyyatın (həmçinin xarici ədəbiyyatın) tədrisi metodikasını, onun tədqiqi və təbliği məsələlərini araşdıran resenziyalı, açıq girişli elmi-metodik jurnaldır. İl ərzində dörd dəfə nəşr olunur. Jurnal dilçilik məsələləri, metodika, qrammatika, dialektologiya, mətnşünaslıq, Azərbaycan ədəbiyyatı, türk dili və ədəbiyyatı, xarici ədəbiyyat, uşaq ədəbiyyatı və folklorşünaslıq mövzularını əhatə edən bölmələrindən ibarətdir. “Nəşrlər” bölməsində elmi-pedaqoji sahədə yeni nəşr edilən kitablar tanıdılır. Jurnal Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının tövsiyə etdiyi dövri elmi nəşrlər sırasındadır.

---



**TEACHING of AZERBAIJANI LANGUAGE and LITERATURE**
Scientific-methodical journal. Published since 1954.
ISSN 2790-0738 (Print); ISSN 2791-0911 (Online)

Approved by the Charter of the Ministry of Education of the Republic of Azerbaijan dated May 5, 1997, registered with the Ministry of Press and Information of the Republic of Azerbaijan. Series AB № 022436, Registration № B236

"Teaching of Azerbaijani language and literature" publishing original, high-quality scientific articles in Azerbaijani, Turkish, English and Russian languages in all fields of linguistics and literary (including foreign literature) criticism in the field of humanities is a peer-reviewed, Open Access scientific-methodical journal that studies the methodology, its research and promotion. Published four times a year. The journal consists of sections covering linguistics, methods, grammar, dialectology, textology, Azerbaijani literature, Turkish language and literature, foreign literature, children's literature and folklore. In the section "Publications" are presented new books published in the scientific and pedagogical field. The journal is among the publications recommended by the Supreme Attestation Commission under the President of the Republic of Azerbaijan.

---

# İÇİNDƏKİLƏR / № 3, 2023

## D İ L Ç İ L İ K   M Ə S Ə L Ə L Ə R İ



## M E T O D İ K A

# CONTENTS / № 3, 2023

## L I N G U I S T I C   I S S U E S



## M E T H O D S

## G R A M M A R



## A Z E R B A I J A N I L I T E R A T U R E

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 3 (277), 12-22
doi.org/10.48445/x9025-2947-8025-a

D İ L Ç İ L İ K   M Ə S Ə L Ə L Ə R İ

# Şifahi nitq və onun tərkib hissələri

***Nərminə Rəcəbova***
Müəllim, İngilis dili kafedrası (humanitar fakültələr üzrə), Bakı Dövlət Universiteti. Azərbaycan. E-mail: narmina_87@yahoo.com
https://orcid.org/0000-0003-2558-5458

**XÜLASƏ**
Məqalə şifahi nitq və onun tərkib hissələrindən bəhs edir. Şifahi nitq biliklərimizi, hisslərimizi ifadə etmək üçün istifadə etdiyimiz danışıq sözlərindən ibarətdir. O, yalnız deyilən və eşidilənlərdən ibarət olmayan mürəkkəb bir sistemdir. Fonoloji bacarıqlar, morfoloji sistem, lüğət ehtiyatı və ya semantika, sintaksis, praqmatika, diskurs bu mürəkkəb sistemə daxildir. Kommunikasiya üçün bu komponentlərin hər birinə ehtiyacımız var. Onlar bir-biri ilə vəhdət təşkil edir. Biz bu komponentləri fonetikadan diskursa doğru mərhələlərlə öyrənirik. Cümlə qura bilərik, amma əsas məsələ diskursda ondan istifadə etməkdir. Müəllim tələbəyə bu sistemlərdən istifadəni öyrədir. İngilis dilinin tədrisində əsas məqsədin kommunikasiya və şifahi formada fikirlərimizi ifadə etmək olduğunu nəzərə alsaq, bu məqalənin mühüm elmi əhəmiyyətə malik olduğunu söyləyə bilərik.

**AÇAR SÖZLƏR**
şifahi nitq, fonoloji bacarıqlar, morfoloji sistem, söz ehtiyatı və ya semantika, sintaksis, qrammatika, praqmatika, diskurs

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 12.07.2023
qəbul edilib: 15.08.2023

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO. 3, VOL. 277, 12-22
doi.org/10.48445/x9025-2947-8025-a

L I N G U I S T I C   I S S U E S

# Oral speech and its components

***Narmina Rajabova***
Teacher, Department of English Language (for humanities faculties), Baku State University. Azerbaijan. E-mail: narmina_87@yahoo.com
https://orcid.org/0000-0003-2558-5458

**ABSTRACT**
The article is dedicated to the oral language and its components. Oral language is a system of words that we use for expressing our ideas, thoughts and feelings. It does not contain only the thing that is spoken and heard. It is a complex system. Phonetic skills, morphological system, vocabulary or semantics, syntax, grammar, pragmatics and discourse are included into this complex system. For communicating we need these components together. They are integrated into one another. We learn these components stage by stage, beginning from phonetics and ending with discourse. We may form a sentence, but the main thing is how to use this sentence in the discourse level. Teachers help students to learn how to manage these stages. By taking into account that, the main goal of teaching English is communication and expressing ideas in the oral form, the article is scientifically very important.

**KEYWORDS**
oral speech, phonetic skills, morphological system, vocabulary or semantics, syntax, grammar, pragmatics, discourse

**ARTICLE HISTORY**
Received: 12.07.2023
Accepted: 15.08.2023

**Giriş / Introduction**

Hər bir insan fikrini ifadə etmək üçün şifahi və ya yazılı nitqdən istifadə edir. Lakin şifahi nitq vasitəsilə daha çox ünsiyyət saxlanıldığından məqalədə yalnız şifahi nitq və onun tərkib hissələri haqqında araşdırma aparılmışdır. Şifahi nitqdən istifadə zamanı yalnız səs və sözlərə aid biliklərə yiyələnmək kifayət deyildir. Bunun üçün dilin *mikro* və *makro* bacarıqlarına malik olmaq lazımdır. *Makro* bacarıqlar dedikdə, oxuma, yazma, eşidib-anlama və danışma, *mikro* bacarıqlar dedikdə isə fonoloji, morfoloji, semantik, sintaktik, praqmatik və diskurs bacarıqlar nəzərdə tutulur.

**Şifahi nitqin tərkib hissələri**

Şifahi nitq biliklərimizi, hisslərimizi ifadə etmək üçün istifadə etdiyimiz danışıq sözlərindən ibarət sistemdir. O, yalnız deyilən və eşidilənlərdən ibarət olmayan çox mürəkkəb bir sistem olub, aşağıdakı komponentlərdən ibarətdir [Moats L.C., 2010]:

- Fonoloji bacarıqlar;
- Morfoloji sistem;
- Lüğət ehtiyatı və ya semantika;
- Sintaksis;
- Praqmatika;
- Diskurs.

Bu komponentlər bir-biri ilə sıx əlaqədə olaraq vəhdət təşkil edir. Danışmaq, öz fikrini ifadə etmək, eyni zamanda qarşı tərəfi anlamaq üçün yuxarıda adları sadalanan bacarıqlara malik olmaq lazımdır.

**Fonoloji bacarıqlar**

Bəzən fonetika və fonologiya elm sahələri bir-birilə qarışdırılır. Lakin bu elm sahələrinin tədqiqat obyektləri bir-birindən fərqlidir. *Fonetika* nitq səslərini öyrənir. Belə ki, fonetika fizioloji, artikulyar, akustik, eşitmə və qavrama kimi sahələri özündə ehtiva etdirir. *Fonologiya* isə səslərin izah edilməsi və sistemləşdirilməsi haqqında elm sahəsidir. Fonologiya saitləri, samitləri və supraseqmental elementləri, başqa sözlə, vurğu və intonasiyanı öyrənir.

Bildiyimiz kimi, sözlər hərflərdən ibarətdir. Fonoloji bacarıqlar heca və ritmin səslərindən ibarət dilin səsi haqqında məlumat verən bacarıqlardır [Armbruster B.B., Lehr F. & Osborn J., 2001]. Digərləri fonoloji bacarıqlar üzərində formalaşdığından onları *baza* bacarıqları da adlandırmaq olar. Bir qayda olaraq, hərfləri yazırıq və görürük, səsləri isə deyirik və eşidirik. Sözlərin bölündüyü ən kiçik hissə səslərdir. Səslər birləşərək hecaları, hecalar isə sözləri əmələ gətirir. Biz bəzən bir sözü digərindən daha qüvvətli deməklə həmin sözü xüsusi vurğulayırıq. Bütün bunları öyrənən sistemə *fonoloji bacarıqlar* sistemi deyilir. Şifahi nitqin inkişafında bu

bacarıqlar fundamental rol oynayır. Məlum olduğu kimi, ingilis dilində sözlərin yazılışı və tələffüzü fərqlidir. Tələbələr ilkin mərhələdə oxu zamanı səsləri hərflərə uyğunlaşdırmağı bacarmalıdırlar. Məsələn, "c" hərfi həm [s], həm də [k] kimi oxunur. Tələbə bilməlidir ki, əgər "c" hərfindən sonra "i", "e", "y" hərfləri gələrsə [s], digər hərflər gələrsə [k] kimi tələffüz edilir. Buna görə də ingilis dilini ikinci dil kimi öyrənən tələbələr üçün fonoloji biliklərə sahib olmaq müstəsna əhəmiyyətə malikdir. Sözün düzgün tələffüz edilməsi və anlaşılması fonoloji bacarıqlara yiyələnmənin əsas göstəricisidir. Erkən fonetik bilikləri mənimsəmək həm oxu [3, p.223–238], həm də yazı bacarıqları ilə əlaqədardır [7, p.41–54]. Bəzi tədqiqatçılar tələffüzün tədris olunmasının əleyhinədir. Lakin hər hansı bir səsin səhv tələffüzünün fikrin yanlış anlaşılmasına səbəb olduğunu nəzərə alsaq, tələffüzün tədrisinin əhəmiyyətini anlayarıq. Məsələn, *"sea"* və *"see"* sözlərinin yalnız kontekstdən müxtəlif məna kəsb etdiklərini müəyyən etmək olar:

*I want to see new library.*

*I want to swim in the sea*.

Supraseqmental elementlərdən qeyri-dəqiq istifadə də yanlış anlaşma ilə nəticələnə bilər. Məsələn, *"I haven't said you were guilty"* cümləsində "mən" sözünü qüvvətləndirmək istəyiriksə "I" sözünü vurğulu deməliyik. Eynilə bütün cümlə üzvlərinin məqsəddən asılı olaraq vurğusunu dəyişdirə bilərik.

Buna görə də Gerald Kelli bildirir ki, tələffüzün tədrisi əvvəlcədən planlaşdırılmalıdır. Planlaşdırılmış dərsləri üç qrupa bölmək olar:

- Qarışıq (integrated) dərslər – bu tip dərslərdə tələffüz dil analizinin əsas hissəsini təşkil edir.
- Düzəldici (korreksiyaedici) dərslər – tələbələrin çətin tələffüz etdiyi səslər üzərində işlənilir.
- Təcrübi (praktika) dərslər – tələffüz edilən hissə ayrılır və onun əsasında müxtəlif çalışmalar yerinə yetirilir.

Məlum olduğu kimi, ingilis dilinin müxtəlif – Britaniya, Amerika, Kanada, Avstraliya, İrlandiya variantları mövcuddur. Müəllimlərin qarşısına çıxan əsas problemlərdən biri də hansı variantın tədris edilməsinin seçimi məsələsidir. Baxmayaraq ki, digər variantlar, xüsusilə də Amerika variantı daha asandır, lakin Britaniya variantı akademikdir. Bu varianta bəzən "Kraliçanın İngilis dili" və ya "BBC İngilis dili" də deyilir. Digərlərinin də Britaniya variantı əsasında yarandığını nəzərə alsaq, tələbələrə məhz bu variantın tədrisi daha məqsədəuyğun hesab edilir.

**Morfoloji bacarıqlar**

Morfoloji sistem dilin fonetik sistemindən sonrakı bölməsidir. *Fonetik sistem* sözləri, *morfoloji sistem* isə sözlərin hissələrini öyrənir. İngilis dilində sözlər kökdən,

ön (prefiks) və son (suffiks) şəkilçilərdən ibarət olur. Mürəkkəb sözlər isə iki və daha çox söz birləşməsindən yaranır. İngilis dilində şəkilçi birləşdiyi sözə görə müxtəlif məna verə bilər. Məsələn *"-s", "-es"*. *He divides Jane's apple into three parts.* Bu cümlədə "divides", "Jane's" və "parts" sözlərinin sonundakı *"-es"* və *"-s"* şəkilçisi formaca eyni olsa da, müxtəlif mənaları ifadə edir. Birinci, feilə əlavə olunaraq üçüncü şəxsin təkində (divide+*s*), ikinci ismə əlavə olunaraq yiyəlik halda (Jane+'*s*), üçüncüsü isə ismə əlavə olunaraq cəmdə (part+*s*) olduğunu bildirir. Tələbə *"-un"* ön şəkilçisini gördükdə bilməlidir ki, bu prefiks əsas sözün əksini ifadə edir. Məsələn, *happy-unhappy*. Morfoloji biliyə malik olan tələbə deyilən sözü hissələrə ayıra və şəkilçinin hansı məna daşıdığını müəyyən edə bilər. Bu zaman tələbə nitq hissələrini bilməli, kommunikasiya zamanı kontekstdən asılı olaraq mənaların necə dəyişdiyini anlamalıdır.

**Lüğət ehtiyatının formalaşması**

İnsan kiçik yaşlarından etibarən hər gün söz ehtiyatını təkmilləşdirir, yeni sözlər öyrənir. Bu baxımdan tələbənin söz ehtiyatı bir günə deyil, zamanla formalaşır. Lüğət ehtiyatı başqa cür semantik bilik də adlandırılır. Xarici dildə nə qədər çox söz öyrənilərsə, insan fikrini bir o qədər asan və dəqiq ifadə edər. Məsələn, hər hansı bir sözün mənasını bilmədiyimiz zaman onu kontekstə uyğun olaraq müəyyənləşdiririk. Beləliklə, ümumi mətnin məzmununu qavramağa çalışırıq ki, bu da insanda qavrama qabiliyyətini formalaşdırır. Söz ehtiyatındakı sözlərin yalnız mənalarını deyil, eyni zamanda düzgün tələffüzünü də bilmək önəmlidir. Nitq nə qədər səlis və rəvan olarsa, dinləyici də nitqi bir o qədər yaxşı anlayar. Şifahi nitqdəki sözləri iki qrupa bölmək olar: ifadə etmək (danışmaq) üçün sözlər; qavramaq üçün sözlər. Birinci qrupa daxil olan sözlərdən bir qayda olaraq nitqdə, yazıda və ya ünsiyyət prosesində, ikinci qrupa aid olan sözlərdən isə əksinə, oxu və dinləmə zamanı istifadə edilir. Çünki bu zaman tələbə qarşı tərəfi oxucu və ya dinləyici kimi anlamağa çalışır. Bu qrupda sözlər həyat təcrübəsi ilə qazanılır. Bəzən söz ehtiyatının həcmini ayrılıqda yazdığımız və başa düşdüyümüz sözlərin sayı ilə müəyyən edirik. Bu yanlış fikirdir. Bir söz müxtəlif kontekstlərdə fərqli mənalar verir. Buna görə də sinonimləri, omonimləri, antonimləri və hətta sözün ikinci, üçüncü mənalarını da bilmək lazımdır. Sözləri mətn daxilində, müəyyən kontekstlərdə öyrənmək onları daha yaxşı yadda saxlamağa kömək edir. Danışıq zamanı istifadə edilən sözləri − ifadə edən və qavrayan olmaqla iki qrupa bölmək olar. Tələbənin danışarkən və ya yazarkən istifadə etdiyi sözlər ifadə etmək, deyilənləri anlamaq və başa düşmək üçün istifadə etdiyi sözlər isə qavramaq üçün olan söz qruplarına daxildir.

Dildə mövcud olan sözləri şifahi nitqdə istifadə edilən və elmi terminlər olmaqla qruplara ayırmaq olar. Şifahi nitqdə istifadə olunan lüğət fondu ilə sosial ünsiyyət arasında sıx əlaqə var. Çünki zəngin söz ehtiyatına malik tələbə fikrini daha səlis ifadə edə bilir. Sözlərin omonim, antonim, sinonimini, eyni zamanda ikinci və üçüncü mənalarını bilmək tələbənin söz ehtiyatının zənginliyindən xəbər verir.

Cudi Montqomeri söz fondunu dörd qrupa ayırır: dinləmə, danışma, oxuma və yazma üçün sözlər [Judy K., 2007]. Dinləmə və danışma üçün olan sözlər danışıq lüğətinə, oxuma və yazma üçün olanlar isə yazılı lüğətə daxildir. Yazılı lüğət danışıq lüğəti əsasında formalaşır. Danışarkən istifadə etdiyimiz və dinləyərkən qavradığımız bütün sözlər şifahi, oxuyarkən anladığımız və yazarkən istifadə etdiklərimiz isə yazılı sözlər adlanır. Tələbələr danışıq ilə müqayisədə daha çox söz oxuya və başa düşə bilir. Yazma üçün lüğət daha dar miqyasda olur, çünki yalnız yazılışını bildikləri sözlərdən istifadə edirlər. İngilis dili lüğətində sözlər təxminən 450.000–750.000 arasındadır [Steven S.A., 1999].

Nitqdə mövcud olan sözləri istifadə tezliyinə görə aşağıdakı kimi təsnif etmək olar:

- əsas (baza) sözlər;
- tez-tez istifadə olunan sözlər;
- mövzu və ya elm sahələri ilə əlaqəli sözlər.

**Semantika və sözün mənaları**

*Semantika* söz və cümlənin mənasını öyrənir. Beynəlxalq elmi lüğətdə semantika *semasiologiya* da adlanır. Semantikanın üç alt qrupu var:

- formal semantika – söz və cümlənin qrammatik mənasını;
- konseptual semantika – sözlərin izahını;
- leksik semantika – söz strukturunu öyrənir.

*Semantik bilik* danışılanı anlamaq bacarığıdır. Bir söz bəzən özlüyündə heç bir məna kəsb etmir, bəzən bir neçə mənası olur, bəzən isə kontekstə görə mənası dəyişir. İnsanların həyatı, təcrübələri, yaşadıqları mühit onların ətrafı anlama bacarıqlarını formalaşdırır. Məsələn, ingilis üçün “bir günün normal havası” dedikdə həm günəşli, həm yağışlı, həm dumanlı gün, sibirli üçün isə soyuq və qarlı hava şəraitidir. Bu da insanlar arasında yanlış anlaşılma ilə nəticələnə bilər. Lakin bəzi hallarda fikirlər bütün dünya xalqlarında eyni olur. Bu da semantikanın necə əhəmiyyətli olduğunu göstərir. Semantika müxtəlif kontekstlərdə söz və onlar arasındakı əlaqəni başa düşməyi özündə ehtiva edir. Hər hansı bir sözün kontekstdən asılı olaraq bir neçə mənası olur:

*Konseptual və ya əsas məna* − sözü ayrılıqda gördükdə fikrimizə gələn ilk mənasıdır.

*Konnotativ məna* − mədəniyyətə, yaşa və təcrübəyə görə fərqlənir. Məsələn, qara rəng kədəri, hüznü əks etdirir.

*Təsiredici məna* − natiqin hissindən, məsələyə münasibətindən asılı olaraq dəyişir. Bu zaman natiq səsinin ton və intonasiyası vasitəsilə sevincini, kədərini, hirsini, ironiyanı ifadə edə bilər. Məsələn, hava tutqun olanda ironiya ilə "The weather is really love" deyilir və bu ironiya səs tonu, intonasiya vasitəsilə daha aydın izah olunur.

*Stilistik məna* − sosial yönümlüdür. Məsələn, dostlarla danışdığımız tərz elmi müzakirə zamanı istifadə etdiyimiz tərz ilə eyni deyildir.

*Kollokativ məna* − sözlərin birləşərək ifadə etdiyi bir mənadır, sözlərdən hər hansı birini, hətta sinonimi ilə əvəzlədikdə həmin mənanı vermir. Məsələn *"give up"*.

Tələbələrin qarşılaşdığı semantik problemlərə bunları aid etmək olar:

- Düzgün sözün tapılması;
- Sözün düzgün təsnif edilməsi;
- Qısa müddətli yaddaşa malik olmaq;
- Vaxt azlığı;
- Kinetik (toxunaraq yadda saxlamaq) və ya vizual (görərək yadda saxlamaq) yaddaş.

Semantik biliyi inkişaf etdirmək üçün müxtəlif növ çalışmalardan istifadə edilir. Bunlara müqayisəli suallar vermək, əksmənalı əşyalar haqqında danışmaq, müəyyən mövzu ilə bağlı sözləri ümumiləşdirmək, sözləri təsnif etmək, uyğun olmayan sözü çıxartmaq, situasiyanı oxuyub dinlədikdən sonra adlandırmaq, söz ailəsini müəyyən etmək və s. Məsələn:

*This summer I went to a foreign country. I was in it's capital. This city is very beautiful. It's nickname is "City of Light". But people call it "City of Love". Louvre Museum and Eiffel Tower are the main sightseeings, but there are a lot of other museums, parks, library, cinema and theatre.*

*Now find: "Where was I?"*

Digər çalışma da tələbələrin semantik biliyinin möhkəmləndirilməsi üçün yararlıdır.

Uyğun olmayan sözü seçin:

| **A** | **B** | **C** | **D** |
|---|---|---|---|
| policeman | doctor | apple | engineer |
| eraser | pencil-sharpener | hair | book |

| | | | |
|---|---|---|---|
| arm-chair | eye | sofa | shelf |
| fruit | finger | lungs | stomach |
| river | lake | ocean | green |

Bu cür nəzarət edilən tapşırıqları (controlled exercise) yerinə yetirə bilən tələbələr daha yaradıcı və müstəqil növ tapşırıqların öhdəsindən gəlməlidirlər. Buna misal olaraq, hava ilə bağlı sözlər − *weather, rain, cloud, rainbow, temperature, pressure, forecast, shower, sunrise, dry, humidity, cold, heat, wind, cloudy, snow, sun* tələbələrə təqdim edilir və onlar bu sözlərdən istifadə edərək mətn qururlar.

**Sintaktik biliyin əhəmiyyəti**

Fonoloji və morfoloji biliklərə, həmçinin söz ehtiyatına sahib olmaq, sintaktik biliklərə isə yiyələnmədən şifahi nitq mümkün deyildir. Sintaksisə bəzən dilin qrammatik sistemi də deyilir. Müasir ingilis dilinin Lonqmən Lüğəti qrammatikanı sözlərin formaca dəyişərək cümlə formasında birləşməsi haqqında elm sahəsi kimi izah edir [Shaffer D., 2007]. Burada iki istiqamət ayrılır – qrammatikanın qaydaları, bu qaydaların tədqiqi və tətbiqi. Savadlı yazı yüksək qrammatik biliyin göstəricisidir. Azərbaycan dilindən fərqli olaraq, ingilis dilində cümlədə söz sırası fərqlidir. Azərbaycan dilində cümlənin əvvəlində mübtəda, sonra tamamlıq gəldiyi halda, ingilis dilində mübtəda, sonra isə xəbər gəlməlidir. Məsələn, *Alex gave Jane a flower*. Bu cümlədəki söz sırasının yerini dəyişsək cümlənin mənası da tamamilə dəyişəcəkdir. Digər bir misala baxaq: *"We must keep environment clean"* və *"Environment must be kept clean"*. Bu iki cümlədə söz sırası fərqli olsa da, məna eynidir. Bu nümunələrdən də aydın görünür ki, sintaktik biliklərə malik olmadan sözlərin mənalarını anlamaq və düzgün fikir ifadə etmək mümkün deyil. Şifahi nitqdə olduğu kimi yazılı nitqdə də sintaktik biliklərin müstəsna əhəmiyyəti vardır.

**Praqmatika və onun tədqiqat obyekti**

*Praqmatika* dil ilə istifadəçi arasındakı əlaqələri tədqiq edir. Praqmatika kommunikasiyanın sosial qaydalarını özündə ehtiva edir [9, p.112–133]. Bu bölmə dildən sosial məqsədli istifadəni öyrənir. Müxtəlif ünsiyyət formaları zamanı söhbətə necə başlamaq, necə sonlandırmaq, qrupda iştirak etmək, necə davranmaq və bu zaman lazımi söz və ifadələrdən düzgün istifadə praqmatikanın tədqiqat obyektidir.

Bəzən praqmatikanı semantika, sintaksis və semiotika ilə müqayisə edirlər. Lakin onların hər birinin öz tədqiqat obyekti vardır. Semantika – ifadələrin linqvistik mənaları haqqında qaydalar sistemini öyrəndiyi halda, sintaksis – cümlə yaratmaq üçün söz və ifadələrin necə birləşdiyini öyrənir. Semiotika isə nişan və simvolların

istifadəsi və təfsirindən bəhs edir. Praqmatika − yalnız hərfi deyil, eyni zamanda dili fiziki və sosial məzmunda öyrənir. Göründüyü kimi, bu linqvistika sahələrinin hər biri söz və ifadələri tədqiq etsə də, funksiyaları fərqlidir.

Praqmatikanın *koqnitiv* (idraki), *mədəniyyətlərarası* və *dillərarası* kimi növləri var. *Koqnitiv praqmatika* kommunikasiyanın mental proseslərini, məsələn, travma zamanı beynindən xəsarət alan şəxsin nitqində baş verən pozuntuları öyrənir. *Mədəniyyətlərarası praqmatika* isə müxtəlif mədəniyyətlərə malik fərqli dillərdən istifadə edən insanların kommunikasiya prosesini öyrənir. Mədəniyyətlərarası praqmatika dillərarası praqmatika ilə sıx bağlıdır. Çünki dillərarası praqmatika xarici dili ikinci dil kimi öyrənmə prosesini tədqiq edir.

Xarici dili öyrənməkdə əsas məqsəd müxtəlif situasiyalarda qarşı tərəflə təbii və dəqiq danışmaqdır. Buna görə də ingilis dili müəllimləri dil funksiyalarını müxtəlif çalışmalar vasitəsilə tələbələrə aşılamalıdırlar. Qarşılıqlı əlaqə zamanı praqmatika vasitəsilə tələbələr nitqdəki linqvistik və strateji seçimləri mənimsəyirlər. Danışıq təcrübəsi, qarşıya qoyulan məqsəd, düzgün strategiyanın seçilməsi və doğru ifadələrdən istifadə praqmatik səriştənin göstəriciləridir. Situasiyada düzgün ifadələrdən istifadə etmək üçün nitq aktı dəstini formalaşdırmaq lazımdır. Dəvət etmək üçün, ilk növbədə diqqəti cəlb etməli, sonra əsas fikir bildirilməli, yəni dəvət aktı yerinə yetirilməli və nəhayət, fikir tamamlanmalıdır. Qarşı tərəf isə diqqətli olduğunu göstərməli, dəvətə münasibətini bildirməlidir.

***Joe:*** *− Hi, Jane. How are you?*

***Jane:*** *− Fine. I heard very good news. You are going to marry.*

***Joe:*** *− Yes, you are right. That's why I called you. Next Sunday is my wedding. I want to invite you to my wedding.*

***Jane:*** *− Congratulations, dear. I'm really happy for you.*

***Joe:*** *− Thank you.*

***Jane:*** *− Bye.*

Müəllim əvvəlcə tələbələrə bu tip dialoqlarla düzgün strategiyaları göstərməli, sonra isə tələbələr özləri müstəqil dialoqlar qurmalıdırlar.

**Diskurs və onun növləri**

Şifahi və yazılı kommunikasiya eyni zamanda *diskurs* da adlanır. Beyker və Paul bildirirlər ki, şəxsi və ictimai dünya arasında körpü olan dil heç vaxt neytral ola bilmir [Baker Paul and Sibonile Ellece., 2013]. Diskurs bir deyil, bir neçə cümlədən ibarət olur. Lakin bəzən fikri bir və ya iki sözlə də çatdırmaq olur, məsələn, "Dayan". Hinkel və Fotosun fikrincə, diskurs bir və çox sayda sözdən ibarət ola bilər [Hinkel Eli and Sandra Fotos., 2002]. Digər alimlərin fikrincə, *diskurs* leksika, sintaktika və məzmundan söhbət zamanı necə istifadə edildiyini öyrənən elmdir. Bu, yuxarıda

haqqında danışılanlardan daha mürəkkəb sistemdir, çünki burada fikir sistematik və ardıcıl olmalıdır. Məsələn, nağıl danışarkən və ya yazarkən onu necə başlayacağını, xarakterləri necə təsvir edəcəyini, hansı söz və ifadələrdən istifadə edəcəyini bilmək lazımdır. Bunlar isə diskurs səviyyədə öyrənilir. Diskursun *təsviredici, nəqledici, izahedici* və *mübahisəli* növləri vardır.

*Təsviredici diskurs* özü də statik və prosesdə olan növlərə ayrılır. Statik diskurs zamanı yalnız sözlərdən istifadə olunaraq məlumat verilir, prosesdə olan diskursda isə müxtəlif dərəcələrdən istifadə edilərək fikir daha canlı ifadə edilir. Təsviredici diskursun texniki (aydın təsvir edir) və təsəvvüredici (əlavə sözlərdən də istifadə edir) formaları var.

*Nəqledici diskurs,* adətən hadisələrlə əlaqəli olur və bu hadisələr xronoloji ardıcıllıqla nəql edilir. Bu tip diskursa bədii janrda rast gəlinir.

Müəyyən izahatlarla, nümunələrlə fikrə aydınlıq gətirilməsi *izahedici diskursun* mahiyyətindədir.

Adından da göründüyü kimi, *mübahisəli diskurs* dinləyicinin ya deyiləni qəbul etməsi, ya da inkar etməsi ilə əlaqəli olan diskurs növüdür.

**Nəticə / Conslusion**

Məqalədə müxtəlif alim və metodistlərin tədqiqatlarından istifadə olunaraq şifahi nitq və onun tərkib hissələri təhlil edilmişdir. Müəyyən edilmişdir ki, şifahi nitq yalnız deyilən və eşidilənlərdən ibarət olmayan mürəkkəb bir sistemdir. Şifahi nitqin tərkibinə daxil olan fonoloji bacarığın fonetik sistemlə fərqi müəyyən edilmişdir. Tədris prosesində ingilis dilinin müxtəlif variantları arasında "Kraliçanın İngilis dili" və ya "BBC İngilis dili" adlanan variantın tədrisinin daha doğru olması əldə edilmiş digər nəticədir.

Məqalədə tədqiq edilən digər sahə semantikadır. Semantik bacarıqlara sahib olarkən tələbələrin qarşılaşdığı çətinliklər müəyyən edilmiş və onları aradan qaldırmaq üçün müxtəlif çalışma nümunələri verilmişdir. Praqmatik bacarıqların qavranılması mürəkkəb prosesdir. Belə ki, bəzən praqmatika semantika, sintaksis və semiotika ilə müqayisə edilir. Araşdırma zamanı onların tədqiqat obyektlərinin fərqli olduğu göstərilmişdir. Sonda müəyyən edilmişdir ki, diskurs bacarığına malik olan tələbə fərqli situasiyalarda lazımi söz və ifadələrdən doğru istifadə edə bilər. Beləliklə, şifahi nitq bu bilik və bacarıqların qarşılıqlı vəhdəti zamanı mümkündür. Mətn, nitq cümlələrdən, cümlələr sözlərdən, sözlər kök və şəkilçilərdən, kök və şəkilçilər isə hərflərdən ibarətdir. Bunlardan birini bilməyən digər sistemləri öyrənə

bilməz. Buna görə də müəllim diqqəti yalnız onlardan birinə yönəltməməli, əksinə onları bir vəhdət şəklində tədris etməlidir.

**İstifadə edilmiş ədəbiyyat / References**


1. Armbruster B.B., Lehr F. & Osborn J. (2001). Put Reading First: The Research Building Blocks for Teaching Children to Read. Kindergarten through Grade 3. Jessup, MD: National Institute for Literacy, 62 p.
2. Baker Paul and Sibonile Ellece. (2013). Key Terms in Discourse Analysis. 1st ed., Bloomsbury Academic, 241 p.
3. Deacon S.H., Kirby J.R. (2004). Morphological awareness: Just "more phonological?" The roles of morphological and phonological awareness in reading development. Applied Psycholinguistics, p.223–238.
4. Hinkel Eli and Sandra Fotos. (2002). New Perspectives on Grammar Teaching in Second Language Classrooms. Lawrence Erlbaum, 288 p.
5. Judy K. (2007). Montgomery's book: The Bridge of Vocabulary: Evidence Based Activities for Academic Success, 136 p.
6. Shaffer D. (2007). Longman Dictionary of Contemprary English. 4th edition, 1660 p.
7. Mackenzie N.M. & Hemmings B. (2014). Learning to write: What predicts success with writing in the first year of school? Issues in Educational Research 24 (12), p.41–54.
8. Moats L.C. (2010). Speech to print: Language essentials for teachers (2nd edion). Baltimore: Brookes, 10 p.
9. Snow C. & Uccelli P. (2009). The challenge of academic language. In Olson R. & N.Torrance (Eds.). The Cambridge Handbook Literacy. Cambridge: Cambridge University Press, p.112–133.
10. Steven S.A. (1999). Vocabulary Development, from reading research to practice (Tom 2). Reading to Practice. Brookline Books, 59 p.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 3 (277), 23-33
doi.org/10.48445/h0021-1494-7291-f

**M E T O D İ K A**

# Kiçikyaşlı məktəblilərdə mütaliə mədəniyyətinin formalaşmasının psixoloji xüsusiyyətləri

***Gülnarə Əlixanova***
Psixologiya üzrə fəlsəfə doktoru, baş müəllim, Pedaqoji psixologiya kafedrası, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan.
E-mail: gülnare.alixanova@mail.ru
https://orcid.org/0000-0002-5241-0250

**XÜLASƏ**
Mütaliə, şagirdi bədii və elmi-populyar ədəbiyyatla, həmçinin dövri mətbuatla tanış edən unikal vasitə, uşağın idrak, nitq və yaradıcılıq qabiliyyətlərini inkişaf etdirməyin universal yolu, mənəvi keyfiyyətləri tərbiyə edən, estetik hissləri inkişaf etdirən güclü vasitədir. Dövrün dəyişməsi ilə əlaqədar kitab asudə vaxtın təşkilində əsas məlumat mənbəyi kimi qəbul olunmur. Artıq internet, televiziya və sosial şəbəkələr onunla rəqabət aparır. Uşaqlarda mütaliəyə maraq yaratmaq və onlarda bu həvəsi qoruyub saxlamaq üçün müəllimlərin bu istiqamətdə bacarıq və səriştələrə malik olması xüsusilə vacibdir.

**AÇAR SÖZLƏR**
kitab, mütaliə mədəniyyəti, oxucu marağı, səlis, şüurlu, aparıcı amil, yaradıcılıq

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 05.07.2023
qəbul edilib: 20.08.2023

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO. 3, VOL. 277, 23-33
doi.org/10.48445/h0021-1494-7291-f

**M E T H O D S**

# Psychological characteristics of the formation of reading culture in junior schoolchildren

***Gulnara Alikhanova***
Doctor of Philosophy in Psychology, senior lecturer, Department of Pedagogical Psychology, Azerbaijan State Pedagogical Universitety. Azerbaijan.
E-mail: gülnare.alixanova@mail.ru
https://orcid.org/0000-0002-5241-0250

**ABSTRACT**
Reading is a unique tool that introduces the student to artistic and scientific-popular literature, as well as periodicals, a universal way to develop a child's cognitive, speech and creative abilities, a powerful tool that nurtures moral qualities and develops aesthetic feelings. Due to the change of times, the book is not considered as the main source of information in the organization of leisure time. Internet, television and social networks already compete with it. It is especially important for teachers to have skills and competencies in this direction in order to create interest in reading in children and to maintain this interest in them.

**KEYWORDS**
book, reading culture, reader interest, fluent, conscious, leading factor, creativity

**ARTICLE HISTORY**
Received: 05.07.2023
Accepted: 20.08.2023

## Giriş / Introduction

Hazırda mühüm problemlərdən biri kiçikyaşlı şagirdlərdə kitaba maraq yaratmaq və onlarda mütaliə mədəniyyətini formalaşdırmaqdır.

Mütaliə ədəbi dili şagirdin yaddaşına daxil edir, uşaqda söz ehtiyatını inkişaf etdirir, özünü və dünyanı tanımağa kömək edir. "Ümumi təhsil pilləsinin dövlət standartları və proqramları (kurikulumları)" (2010) sənədində oxu bacarıqları və mütaliə mədəniyyətinin formalaşması şagirdin şəxsi inkişafına, onun cəmiyyətə uyğunlaşma qabiliyyətinə təsir göstərən, məsuliyyətli, təşəbbüskar və bacarıqlı vətəndaş yetişdirmək vəzifəsini həll edən bir vasitə hesab edilir.

Adı çəkilən sənəd məktəblilər arasında təhsil səriştələrinin, fundamental oxu bacarıq və biliklərinin, mətni dərketmə üsullarının, oxuma texnikasının mənimsənilməsinin, oxucu marağının inkişaf etdirilməsinin zəruriliyini göstərir. Oxucu maraqları, əsasən, insanın şəxsiyyətini müəyyən edir, ona görə də onların məktəblilər arasında formalaşması prosesinə təkcə pedaqoji, psixoloji, metodoloji deyil, həm də sosial problem kimi baxılır. Son vaxtlar oxucu marağının, mütaliə səviyyəsinin aşağı düşdüyünü fərq etməmək mümkün deyil. Bunun kifayət qədər obyektiv səbəbləri var.

Mütaliə marağının azalmasına kütləvi informasiya vasitələrinin təsir gücünün artması, uzun müddət televizor və ya kompüter arxasında olmaqla kiçikyaşlı şagirdlərin mütaliə mədəniyyətinin formalaşdırılması üçün məqsədyönlülüyün olmaması, oxu fəaliyyətinə münasibətin dəyişməsidir. Böyüklərin uşağa kitab oxumağa marağı azaldığı üçün, nəticədə təhsilin ilk illərində kiçikyaşlı məktəblilərin müxtəlif kitablarla sistemli və tam əlaqəsi pozulmağa başlayır. Bəzən valideynlər övladlarının kitab oxumalarına diqqət etmir, dövri nəşrlərlə maraqlanmırlar.

Oxucu marağı – şagirdin kitablardan aldığı həyat təcrübəsinin tətbiqinə yönələn maraqdır. A.S.Puşkin qeyd edirdi ki: "Oxumaq ən yaxşı təlimdir". Çünki uşaq kitabdan istifadə etməklə dünyanı bütün təzahürləri ilə araşdırır, daha çox öyrənir və insan həyatını daha dəqiq başa düşür. Mütaliə uşağın həyatında təsvirolunmaz rol oynayır, o, dünyanın müəyyən mənzərəsini, davranış qaydalarını və yüksək bədii zövqü təşkil edir [1, s.76].

Kitab uşağın həyatının ən çətin vaxtında ona insani hissləri: sevinc və kədəri dünyasına tanıdır, özündə insanlığı tərbiyə edir. Bu baxımdan uşağın şəxsiyyətinin formalaşmasında və tərbiyəsində kitabın güclü təsirindən tam istifadə etmək lazımdır. Kitab uşağın qarşısında xeyirxahlıq, şərəf, cəsarət, şəfqət ideallarını açmalı, özünə və başqalarına düzgün münasibət yaratmalıdır. Kitaba ilkin maraq gələcəkdə uşağa

müxtəlif oxu qaydalarını, o cümlədən müstəqil mütaliəni mənimsəməyə kömək etmiş olar. Klassik ədəbiyyat uşaq üçün mədəniyyət mənbəyidir. Şagirdlərin mənəvi inkişafı üçün dahi yazıçı və şairlərin əsərlərini mütaliə etmək ilkin şərt hesab olunur. Oxu vasitəsi ilə uşağın nitqi inkişaf edir, söz ehtiyatı artır. Kitab gənc oxucuya fikirlərini ifadə etməyi və başqalarının dediklərini anlamağı öyrədir. Kiçikyaşlı oxucu kitabın müəllifini və onun üçün illüstrasiyaları çəkən rəssamı tanımalı, müəlliflə rəssamın birgə əməyi sayəsində kitabın şah əsərə çevrildiyini dərk etməlidir.

Uşaqların oxu qabiliyyəti və formalaşan mütaliə mədəniyyəti gələcəkdə bütün təlim prosesinin keyfiyyətini müəyyənləşdirir. Təcrübədən məlum olduğu kimi, kifayət qədər yaxşı oxumayan uşağın savadı çox aşağı olur, şifahi nitqi yaxşı formalaşmır. Şagird yaxşı oxumağı öyrənmədən riyaziyyatda problemi həll edə, başqa fənlər kursunda materialı düzgün və ya başqasının köməyi olmadan öyrənə bilməyəcəkdir [2, s.134].

İbtidai sinfin əsas vəzifəsi səlis, şüurlu, düzgün və ifadəli oxu bacarığını inkişaf etdirmək olsa da, bu yetərli deyil. Artıq təlimin ilkin mərhələsində oxu bacarıqlarının formalaşması mütaliəyə marağın yaranması və inkişafına əsaslanmalıdır. Bu proses şagirdin fərdi xüsusiyyətləri nəzərə alınmaqla müxtəlif materiallar əsasında aparılmalıdır; oxumağı öyrətməklə oxu bacarıqlarının formalaşdırılması və mütaliə marağının yaranması prosesləri uşağın ümumi inkişafında birləşdirilməlidir.

Mütaliəyə maraq ilkin olaraq koqnitiv problemlərin həlli vasitəsi kimi istifadə edilir. Bunun üçün əvvəl maraq, sonra isə mütaliə bacarığı formalaşmalıdır. Bu iki hadisə o qədər sıx bağlıdır ki, onları bir-birindən ayırmaq çətindir. Bu baxımdan hadisələrin bir-birindən asılı vəhdətdə öyrənilməsi və oxu vərdişinin formalaşması prosesində mütaliəyə marağın yaranması və inkişafını təmin edəcək təlim sisteminin təşkili müasir dövrümüzün həll olanmalı problemlərindəndir.

İstənilən yaradıcılıq fəaliyyətində olduğu kimi, oxu fəaliyyətində də ən yaxşı nəticələr təkcə bilavasitə tədris yolu ilə əldə edilmir, eyni zamanda mütaliə marağının formalaşması öz-özünə baş vermir, bütün tədris və dərsdənkənar tədbirlər də əsas götürülür. Kiçik yaşlı şagirdlərdə mütaliə mədəniyyətini inkişaf etdirmək üçün şərait yaratmaq ibtidai sinif müəllimlərinin mühüm işlərindən biridir. Bu sahədə mükəmməl nəticələrə nail olmaq üçün aşağıdakı vəzifələrin həlli planlaşdırılır:

– müxtəlif dərs formalarından və sinifdənkənar fəaliyyətlərdən istifadə etməklə mütaliəyə ehtiyacın (müstəqil, təşəbbüskar) inkişafı;
– ədəbi oyunlar, yaradıcılıq müsabiqələri, teatrlaşdırma elementləri olan dərslər vasitəsilə şagirdlərin mütaliə səriştəsinin inkişafı;
– uşaqların yaradıcılığının stimullaşdırılması.

A.N.Leontyev, S.L.Rubinşteyn, V.İ.Slobodçikov, N.E.Şçhurkovanın əsərlərində uşaqlarda mütaliə mədəniyyətini formalaşdırmaq üçün müəyyən edilmiş fəaliyyət yanaşması və dialoq təhsilin əsas prinsiplərinə əsaslanır:

– həssas dövrlərin nəzərə alınması prinsipi;
– "yaxın inkişaf zonası"nın müəyyən edilməsi, uşaqların və böyüklərin birgə fəaliyyətinin təşkili prinsipi;
– hər növ fəaliyyətin yüksək motivasiyası prinsipi;
– hər hansı fəaliyyətin məcburi refleksivlik prinsipi;
– müxtəlif formalarda idarəetmənin təşkilində əməkdaşlıq prinsipi;
– dialoq prinsipi [9, c.45].

Azərbaycanda uşaq mütaliəsi xəritəsinə şagirdlər arasında çoxdilliliyi inkişaf etdirmək məqsədilə müxtəlif dillərdə və tərcümə olunmuş xarici ədəbi əsərlər daxildir.

Müstəqil oxumaq üçün bədii əsərlər seçilərkən aşağıdakı meyarlar nəzərə alınır:

1. klassik ədəbiyyata aid olan;
2. işin aktuallığı;
3. inkişaf yönümlülük: a) şagirdin mənəvi keyfiyyətləri; b) vətəndaşlıq və vətənpərvərlik hissləri; c) oxu bacarıqları.
4. çoxjanrlı;
5. məktəblilərin yaş xüsusiyyətlərinin nəzərə alınması;
6. əlçatanlıq və oxucu marağı.

Uşağın mütaliə ehtiyacını anlamasına kömək etmək, ən yaxşı kitabları oxumağa maraq oyatmaq və onları istedadla oxumaq istər valideyn, istər yazıçı, naşir, müəllim, kitabxanaçı, pedaqoq olsun, böyüklərin vəzifəsidir [3, s.98]. Uşaqlar üçün sinifdənkənar oxu məşğələlərinin təşkilində valideynlərin fəal iştirakına xüsusi diqqət yetirmək, onların bu problemin həllinə mütəmadi cəlb edilməsi vacibdir. Bunun üçün valideyn iclaslarında valideynlərə bu yaşda uşaqların oxuması tövsiyə olunan bədii ədəbiyyatların siyahısını, tanınmış insanların açıqlamalarını və mütəxəssislərin mütaliə mədəniyyətinin aşılanmasının vacibliyi ilə bağlı seminarlar təşkil etmək lazımdır. Məktəb, kitabxana və ailənin pedaqoji-psixoloji qarşılıqlı fəaliyyətinin nəticəsi şagirdlərin müstəqil mütaliə fəaliyyətinin formalaşdırılması, onların yaradıcılıq potensialının, ünsiyyət bacarıqlarının inkişafı hesab edilir.

*Birincisi*, kiçikyaşlı şagird mətnə, ilk növbədə emosional reaksiya verir. Mətnlə bağlı uşaqların təcrübələri ibtidai məktəb üçün böyük əhəmiyyət kəsb edir. Hazırda şagirdlərin emosional reaksiyalarını məktəb psixoloqlarının köməyi ilə həll etmək

mümkündür. Bunun üçün dərsin xüsusi metodologiyası və təhsil dövründə şagirdin oxu inkişafını qiymətləndirmək meyarları nəzərə alınır.

İbtidai məktəbyaşlı oxucuların növbəti xüsusiyyətini bədii aləmlə real dünyanın identifikasiyası adlandırmaq olar. Təsadüfi deyil ki, oxucunun inkişafındakı bu dövrü "sadəlövh realizm" dövrü adlandırırlar. Bu canlı, real olan obraza inamı nümayiş etdirmək xarakterik münasibətlə ifadə olunur.

*Üçüncüsü*, kiçikyaşlı şagirdlərin sözə, bədii təfərrüata həssaslığı təzahür edir. Şagird bəzən böyüklərin diqqət yetirmədiyi psixoloji xüsusiyyətlərə dərhal reaksiya verir.

*Dördüncüsü,* varlığın sözdə təsirinin kiçikyaşlı məktəblilər üçün xarakterikliyi uşağın obrazda yaşamaq qabiliyyəti ilə ifadə olunur.

*Beşincisi,* gənc oxucunun mənfi xüsusiyyəti bədii forma haqqında rəyinin olmamasıdır [4, s.201].

Uşaqlar oxuyarkən, ilk növbədə personajları, süjeti, ayrı-ayrı hadisələri ifadə etsələr də, misralara, epitetlərə, durğu işarələrinə, abzaslara bölünməyə fikir vermirlər. Uşaq onları anlamadan üzərindən keçir, lakin mahiyyətini başa düşə bilmir. Şagird oxu bacarıqlarını, mütaliə mədəniyyətini fomalaşdırdığı zaman özü və digər insanlar haqqında, həmçinin dünya barədə əldə etdiyi biliklərini artırmaq üçün müxtəlif imkanlar qazanır.

Kiçikyaşlı məktəblilərin mütaliə mədəniyyətinin formalaşması problemi N.A.Rıbnikovun, V.G.Qoretskinin, L.F.Klimanovanın, N.N.Svetlovskayanın əsərlərində öz əksini tapmışdır. Hazırda mütaliə milli dəyər kimi tanınır. Məhz buna görə də ibtidai siniflərdə şagirdlərdə mütaliə mədəniyyətinin formalaşdırılmasına xüsusi diqqət yetirilməlidir.

Pedaqoji-psixoloji ədəbiyyata görə, Y.A.Komenski oxu maraqlarının inkişafı problemi ilə əlaqədar yazırdı: "Hər hansı bir fənni öyrənməzdən əvvəl uşaqlarda ona məhəbbət oyatmaq lazımdır". L.S.Vıqotskinin fikrincə isə uşağı hər hansı bir fəaliyyətə cəlb etməzdən əvvəl onun həmin fəaliyyətə hazır olduğunu aşkar etməyə diqqət yetirmək lazımdır [8, c.35-40].

Mütaliə mədəniyyəti məktəb yaşında formalaşırsa, şagird kitabdan ayrılmır. Pedaqoji və psixoloji problemin müxtəlif şərhlərində hər kəs marağın əsas funksiyasını şagirdi öyrənməyə sövq etməkdə görürdü. Yəni öyrənmə şagird üçün arzu olunan hala gətirilməli və ehtiyaca çevrilməlidir.

Psixoloji lüğətdə maraq, əsasən, "daxili müstəvidə baş verən idrak fəaliyyətini təşviq edən ehtiyac münasibəti və ya motivasiya vəziyyəti kimi başa düşülür. O, reallığın müəyyən sahəsinə idrak cazibəsi (istək) əsasında yaranır və onun inkişafı

prosesində öz subyektinə aktiv, fəal münasibət üçün sabit şəxsi ehtiyaca, meyilliyə çevrilə bilər". A.B.Orlovaya görə, "maraq" anlayışı "koqnitiv maraq" kimi konkretləşir.

XIII əsr elm aləminin böyük mütəfəkkiri Xacə Nəsirəddin Tusinin ədəbi irsində kitab və mütaliə ilə bağlı söylədiyi dəyərli kəlamlar və ibrətamiz fikirlər müasir dövrümüzdə də aktual olaraq səslənir. O, özünün məşhur "Əxlaqi-Nasir" əsərində "insanlara nəsihət verməklə heç nəyi əsirgəməməsini" gərəkli hesab edir və beləliklə, kitabın, mütaliənin tərbiyə işində çox dəyərli olması barədə qiymətli fikirlər yürüdür. Alimin fikrincə, mənəvi zənginliyi, əxlaqi saflığı və fiziki kamilliyi özündə ahəngdar şəkildə birləşdirən kamil şəxsiyyətin formalaşmasına təsir göstərən amillər sırasında kitabın, kitabxana və mütaliənin müstəsna rolu vardır [6, s.167].

XVII əsrdə mütaliəyə maraq problemi haqqında Y.A.Komenski "Böyük didaktika" kitabında yazırdı: "Hansı dərsə başlasanız da, ilk növbədə bu fənnin üstünlüyünü, faydalılığını, xoşluğunu və mümkünlüyünü sübut edərək şagirdlərdə ona ciddi məhəbbət oyatmalısınız". N.R.Morozovanın fikrincə, oxuya maraq üç əsas xüsusiyyətlə xarakterizə olunur:

– fəaliyyətə münasibətdə müsbət emosiya;
– bu duyğunun idraki fəaliyyətinin, yəni bilik sevincinin olması;
– fəaliyyətin özündən irəli gələn motivin olması.

L.M.Fridman və K.N.Volkova hesab edirlər ki, fənnə maraq həm də "motiv" rolunu oynayır. Bəzi hallarda maraq fəaliyyət motivi sayıla bilər. G.İ.Şukina hesab edir ki, "maraq" və "motiv" anlayışları bir-biri ilə bağlıdır, lakin müxtəlif psixi xassələri təmsil etdikləri üçün onları müəyyən etmək mümkün deyil.

Pedaqoji-psixoloji ədəbiyyatda "maraq" insanın müəyyən obyektlərə və fəaliyyətlərə sabit, seçici, emosional rəngli oriyentasiyası, habelə idrak ehtiyacının xüsusi təzahür forması kimi müəyyən edilir. Oxucu marağının inkişafı prof. N.N.Svetlovskaya tərəfindən öyrənilmişdir. O, "oxucu marağı" terminini dar və geniş mənada nəzərdən keçirmişdir. Dar mənada oxucu marağı oxunma mexanizmi, işarələrin tərcümə üsulu kimi mütaliəyə maraqda özünü göstərir. Yenicə öyrənməyə başlayan uşaq kitabda yazılanları anladığını və oxuma prosesini necə mənimsədiyini başqalarına göstərməyə çalışır. Sözün geniş mənası – oxucu marağı, yəni oxucunun kitablardan insan təcrübəsinə fəal münasibəti hesab olunur.

L.S.Vıqotskinin fikrincə, "oxucu marağı mürəkkəb struktura malikdir ki, bu da marağın özünü, eləcə də maraq obyektinə emosional cazibəni ehtiva edir". Eyni zamanda marağın özü idrak məqamı, emosional cazibə isə həvəsləndirici qüvvə kimi qəbul edilir. R.V.Nikitinanın fikrincə, oxucu marağının mühüm komponenti

müəlliflər, onların tərcümeyi-halı, əsərləri haqqında bilikləridir. İnsan müxtəlif kitabları, mövzuları, janrları bilirsə, o, maraqlarına və idrak ehtiyaclarına cavab verən bir kitab seçəcəkdir [7, c.18-23].

Deməli, kitab gənc oxucu üçün onu cəlb edəcək qədər rəngarəng olmalı, onu hərtərəfli maraqlandırmalıdır. Valideynlər adətən öz uşaqlarının hobbilərini yaxşı bildikləri üçün mütaliənin ilkin mərhələsində bunu xüsusilə nəzərə almalıdırlar. Uzun müddət ev heyvanı bəsləmək arzusunda olan bir uşağa əvvəlcə həmin heyvan haqqında hekayə oxumaq imkanı verilməlidir. Əlbəttə ki, zaman keçdikcə məktəblilərin imkanlarını tədricən genişləndirmək, onlara digər mövzularda mütaliə etmək üçün kitablar təklif etmək lazımdır. Şübhəsiz, yeni mövzular öncə uşağın maraq dairəsinə uyğun olmalıdır. Mütaliəyə ehtiyacın inkişafı adətən ümumi inkişafla paralel getdiyi təqdirdə mümkün olur: məsələn, valideynlərin teatrlarda, muzeylərdə, sərgilərdə və s. müxtəlif sahələrdə toplanmış biliklərini uşaqla bölüşmək üçün zaman ayırması mövzuların geniş qavranılması üçün əsas şərtdir.

"Lazımlı" və "həmin" kitabı seçərkən gənc oxucunun yaşını nəzərə almaq vacibdir. İbtidai məktəb çağında illüstrasiyalar hələ də böyük rol oynayır, onsuz kitab darıxdırıcı və simasız görünə bilər. Mütaliə prosesində uşaqların gözlərinin sağlamlığı da unudulmamalı, belə ki, yazı şrifti böyük və oxunaqlı olmalıdır. Evdə sevimli və dəfələrlə təkrar oxunan əsərlərin xüsusi yer tutduğu uşaq kitabxanasının olması da məqsədəuyğundur.

Kitab mağazasına, kitabxanaya müntəzəm səfərlər xoş ənənəyə çevrilməlidir. Valideynlərə əvvəlcə uşaqlarını orada müşayiət etmələri məsləhətdir ki, onlarla müxtəlif kitablar arasında əlaqəni tapsınlar. Kitabxanada gənc oxucunun yaşına uyğun bədii və elmi-populyar ədəbiyyatın olduğu stendlər göstərilməlidir. İdeal olaraq nəzəri cəhətdən onun üçün maraqlı ola biləcək bir neçə kitab götürmək vacibdir.

Kitabxanaçıdan uşaqlarda mütaliə mədəniyyətinin formalaşması üçün hansı işlərin görüldüyü soruşula bilər. Bunlar uşaq yazıçılarının yaradıcılıq gecələri, ədəbi dərnəklər, tematik kitab sərgiləri və ya baxış müsabiqələri ola bilər. Unutmayaq ki, bu gün kitabxanalar həm də əlavə təhsil mərkəzləridir, burada ab-havanın özü oxumaq üçün əlverişlidir.

Beləliklə, oxumaq üçün kitablar seçildikdə vacib bir sual yaranır – kitabı necə oxumaq olar? Təbii ki, kiçik məktəbli oxuduğunu başa düşməli, bu fəaliyyətdən zövq almalı və mütaliə dairəsi kifayət qədər geniş olmalıdır. Azyaşlı məktəblilər arasında belə uşaqlar çox azdır. Çoxlarının hələ də onları düşünülmüş mütaliə ilə tanış edəcək,

onlara təkcə oxumağı deyil, həm də oxuduqlarının mənasını anlamağı öyrədəcək bir şəxsiyyətə ehtiyacları var [5, s.108].

I–IV siniflər üçün hazırlanan "Ədəbi qiraət" dərsliklərində G.S.Merkin, B.G.Merkin, S.A.Bolotova qeyd edirlər ki, uşaq nə qədər səlis oxusa da, onlara ucadan kitab oxumaq üçün zaman ayırmaq çox vacibdir. Bunu, məsələn, yatmazdan əvvəl, günün bütün qayğıları bitdikdə etmək daha əlverişlidir. Ailədə mütaliə vərdiş halını almalıdır. Uşaqlara kitabları yavaş-yavaş oxumalı, uşağın dinləyib-dinləmədiyini, deyilənləri başa düşüb-düşmədiyini, oxu prosesinin özünün onun üçün maraqlı olub-olmadığını anlamaq üçün vaxtaşırı olaraq mütaliəyə ara verərək onlara suallar verilməlidir. Kiçikyaşlı məktəbliləri maraqlandıran sualların üzərində daha ətraflı dayanmaq lazımdır.

Uşağın müzakirə prosesində fəal iştirakını təmin etmək və təxəyyülünü inkişaf etdirmək üçün onun qəhrəmanın yerində olsaydı, bu və ya digər vəziyyətdə necə hərəkət edəcəyini soruşmaq məqsədəuyğundur. Mütaliə zamanı arada fasilə verərək, uşaqdan məzmunun necə bitəcəyinin təxminini, oxunun sonunda isə ona hekayəni davam etdirmək tapşırığı da vermək olar. Qeyd etmək lazımdır ki, birlikdə oxumaq imtahan xarakterli olmamalıdır. Uşağın əhvali-ruhiyyəsi həssaslıqla diqqətdə saxlanılmalı və imtina etdikdə o suallara cavab verməyə məcbur edilməməlidir.

Mütaliə prosesində uşağın həyat təcrübəsinin aktuallaşdırılması xüsusi yer tutur. Kitab ona tanış olan mövzudan bəhs edirsə, onu daha yaxın və başadüşülən edəcək həyati epizodu xatırlatmaq vacibdir. Oxuma zamanı başa düşülməsi çətin olan sözlərə və ya epizodlara da şərh verilməlidir. Bu kənarlaşmalar ümumi inkişaf və idrakın inkişaf etdirilməsi xarakteri daşıyır. Uşaqla ilk olaraq başa düşülməyənləri aydınlaşdırmaq üçün oxuma zamanı istənilən sualı verə biləcəyi haqda müzakirə aparmaq lazımdır.

Əgər sənət əsəri teatr tamaşasında oynanılıbsa, tamaşanı yaxın gələcəkdə uşağa göstərməyə dəyər. Eyni obrazların və ideyaların müxtəlif sənət növlərində necə əks olunduğunu müqayisə etmək kiçik məktəbli üçün maraqlı olacaq. Kitabla tanışlıqda öz-özlüyündə müzakirə obyektinə çevrilə bilən illüstrasiyaları nəzərdən qaçırmamaq lazımdır. Uşaqdan təsvir olunan personajlar müəllifin təsvir etdiyi obrazlara bənzədiyini, rəssamın hansı epizodları təsvir etdiyini, bu kitabı özü tərtib etsəydi, hansı hadisəni və hansı obrazı çəkəcəyi haqda fikri soruşula bilər. Əgər onun rəsmə meyli varsa və oxuduqları üçün öz illüstrasiyalarını yaratmaq istəyirsə, bu işdə ona dəstək olmağa dəyər.

Beləliklə, ailə uşaqda mütaliə mədəniyyətini formalaşdırmaq üçün əlindən gələni etməyə çalışırsa, məktəb nə edə bilər? Kitabın oxunması mütaliə mədəniyyətinin

formalaşması üçün sonsuz ədəbi imkanlar yaradır. Məktəbdə uşaqlar arasında mütaliə təcrübəsi mübadiləsinə şərait yaradan sinifdənkənar oxu dərsləri xüsusi yer tutur. Yoldaşların emosional rəylərini eşidən uşaq müəyyən bir kitab mətninə maraqla yanaşmağa çalışır.

Məktəbdə keçirilən hər bir fənn üzrə tövsiyə olunan əlavə ədəbiyyat siyahıları şagirdlərin dünyagörüşünü genişləndirir, bilik əldə etmək yolu kimi mütaliəyə pozitiv münasibət formalaşdırır. Qeyd etmək lazımdır ki, bəzən yeni mövzunun izah edildiyi materialın özü şagirdi oxumağa həvəsləndirir. İdrak prosesinin inkişafı üçün təşəbbüs tətbiq olunan mövzu üzrə tapşırıqların hazırlanması ilə stimullaşdırılır. Yeni müasir dərsliklərdə bu cür üsullardan fəal şəkildə istifadə edilir.

## Nəticə / Conclusion

Gələcək nəsillərin savadlı, mədəni, ağıllı şəkildə formalaşması üçün ən əsas vasitələrdən biri kiçik yaş dövründə uşaqlarda mütaliə mədəniyyətinin düzgün formalaşdırılmasıdır. Müasir dövrdə ibtidai sinif şagirdinin mütaliəyə cəlb edilməsi problemi xüsusilə aktualdır. Çox vaxt bu, vaxtın çatışmaması ilə əlaqədardır. Həqiqətən, müasir bir uşaq hər gün dərsə gedir, ev tapşırıqlarını yerinə yetirir, boş qalan vaxtını isə onlayn ünsiyyətdə, yeni oyunla əylənməkdə və ya həmyaşıdları ilə söhbətdə keçirir. Belə çıxır ki, oxumağa sadəcə vaxt və ehtiyac yoxdur, oxumadan həyat olduqca maraqlı və dinamik görünür, çünki müasir əyləncə darıxdırıcı istirahət fəaliyyəti üçün bir çox imkanlara yol açır. Bu gün kitab müasir şagird həyatının reallıqları ilə rəqabətə girməyə məcburdur və bu mübarizədə çox vaxt uduzur. Bəs bu hal niyə baş verir və bunu aradan qaldırmaq üçün nə etmək olar?

Əsas səbəb odur ki, uşaqlar böyüklərin təkliflərini həvəslə yerinə yetirirlər. Onlar mütaliəyə məhəl qoymadan özlərini tam olaraq nədən məhrum etdiklərini anlamırlar. Bu baxımdan uşağa kitab dünyasını açmaq, bu dünyanı onun həyatının mühüm hissəsinə, mənəvi-əxlaqi və estetik tərbiyənin aparıcı amillərindən birinə çevirmək və ideal olaraq kitabla ünsiyyətin uşağın şüurlu seçiminə çevrilməsini təmin etmək üçün həm ailə, həm də məktəb hər cür şərait yaratmalıdır. İlkin olaraq hər bir ailə bununla bağlı şəxsi nümunə göstərə bilər. Uşaq valideynlərin mütaliə etdiyini gördükdə, aralarında yeni kitabların müzakirəsini eşitdikdə, onların oxuduqları ilə əlaqədar yaranan emosiyaları dərk etdikdə onda mütaliəni maraqlı ünsiyyət üçün fürsət kimi təsəvvür etməyə başlayır. İkincisi, valideynlər uşağın gününün necə keçdiyini, hansı fəaliyyət növü ilə məşğul olduğunu və ən əsası, onun asudə vaxtının necə təşkil olunduğunu təhlil etməlidirlər. Şagirdin internetdən sui-istifadə etdiyi bilinərsə, onda onların istifadəsinə məhdudiyyət qoyulmalı, boş vaxtları kitablarla ünsiyyətə cəlb

edilməli, ona əyləncəsinə alternativ olacaq bir kitab oxumağı məsləhət görülməlidir. Bu zaman çox vacib bir sual yaranır: nə oxumaq lazımdır? Aydındır ki, kiçikyaşlı məktəblilərin böyük əksəriyyəti hələ müstəqil şəkildə bu seçimi edə bilmir. Bu işdə onlara kömək etmək ilkin olaraq valideynlərin vəzifəsidir.

Bugünkü məktəbin ən mühüm məqsədi savadlı, hərtərəfli inkişaf etmiş mədəni şəxsiyyət formalaşdırmaqdır. Bu məqsədə nail olmaq şagirdlərin oxuya daha sıx cəlb edilməsi, onlarda mütaliə mədəniyyətinin formalaşdırılması, bütövlükdə bəşəriyyətin və öz ölkəsinin, xalqının inkişaf etdirdiyi mədəni və əxlaqi nümunələri, mədəni irsini öyrənməkdən ibarətdir. Çox kitab oxuyan insan zəngin söz ehtiyatına sahib olmaqla yanaşı, geniş düşüncə qabiliyyətinə də malik olur.

Beləliklə, məlum olur ki, hər şey öz əlimizdədir. Hamımız birlikdə − valideynlər, məktəb və müəllimlər gücümüzü birləşdirərək uşaqların oxu həvəsini və mütaliə mədəniyyətini formalaşdırmaqla onların kitablara bağlılığını təmin edə bilərik.

**İstifadə edilmiş ədəbiyyat / References**

1. Əlizadə Ə.Ə. (2015). Məktəblinin psixologiyası. Bakı, Renessans. 113 s.
2. Əlizadə Ə.Ə. (2010). Pedaqoji psixologiya, I kitab. Bakı, ADPU. 319 s.
3. Əlizadə Ə.Ə. (2010). Pedaqoji psixologiya, II kitab. Bakı, ADPU. 288 s.
4. Əmrahlı L.Ş. (2010). Yeniləşən təhsilin psixoloji problemləri. Bakı, Mütərcim. 275 s.
5. Müasir təhsilin aktual sosial-psixoloji problemləri. (2014). Azərb. Resp. Təhsil Naz., Azərb. Resp. Təhsil Probl. İn-tu. Bakı, Mütərcim. 255 s.
6. Tusi N. (2005). Əxlaqi-Nasiri. Bakı, Lider nəşriyyat. 280 s.
7. Алексеевская А.Т. (2008). Формирование читательских интересов младших школьников. Москва, с.18–23.
8. Зобнина М.А. (2007). Как пробудить у младшего школьника интерес к чтению? Начальная школа, № 8, с.35–43.
9. Ниталимова Л.В., Семенова С.Н. (2007). Развитие читательского интереса младших школьников. Москва, Ментор. 302 с.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 3 (277), 34-41
doi.org/10.48445/a7055-6165-3252-k

METODİKA

# İbtidai siniflərdə oxunun ifadəliliyini təmin edən amillər

***Fəridə Səfərəliyeva***
Pedaqogika üzrə fəlsəfə doktoru, dosent, Azərbaycan Dövlət Pedaqoji Universiteti.
Azərbaycan. E-mail: f.safaraliyeva@mail.ru
https://orcid.org/0000-0003-1161-5759

**XÜLASƏ**
İbtidai siniflərdə təşkil edilən oxunun mühüm keyfiyyətlərindən biri onun ifadəliliyidir. Şagirdlərin ifadəli oxu üzrə ilkin vərdişləri mənimsəmələri müəllimin özünün bu vərdişə nə dərəcədə yiyələnməsindən asılıdır. Bu prosesdə müəllim yaradıcı təsəvvürün köməyi ilə oxuduğunu görməli və onu şagirdlərə təsvir etməyə çalışmalıdır. O, məzmun və formaya uyğun olaraq oxumağı bacarmalıdır. Mətnin məzmununun şüurlu şəkildə mənimsənilməsi oxunun ifadəliliyinin təmin edilməsi üçün ilkin şərtdir. İfadəlilik isə şüurluluğu artıran vacib amildir. Bəzən şagirdin dolaşıq nitqi olur, sürətlə danışarkən bəzi sözləri aydın tələffüz edə bilmir və ya şəkilçiləri buraxır. Oxunun düzgünlüyünə xidmət edən vasitə kimi müəllim şagirdlərə tez-tez yanıltmac oxutdurmalıdır.

**AÇAR SÖZLƏR**
Azərbaycan dili dərsliyi, oxu, ifadəlilik, intonasiya

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 10.08.2023
qəbul edilib: 15.09.2023

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO. 3, VOL. 277, 34-41
doi.org/10.48445/a7055-6165-3252-k

**M E T H O D S**

# Factors ensuring the expressiveness of reading in primary grades

***Farida Safaraliyeva***
Doctor of Philosophy in Pedagogy, Associate Professor, Azerbaijan State Pedagogical University. Azerbaijan. E-mail: f.safaraliyeva@mail.ru
https://orcid.org/0000-0003-1161-5759

**ABSTRACT**
One of the important qualities of reading in primary grades is its expressiveness. In primary grades, students' acquisition of the initial habits of expressive reading depends on the extent to which the teacher himself acquires this habit. Here, the teacher should see what he is reading with the help of creative imagination and try to show it to the students. He should be able to read for content and form. Conscious mastering of the content of the text is a prerequisite for ensuring the expressiveness of the reading. Expression is an important factor that increases awareness. Sometimes the student has slurred speech, fails to pronounce certain words clearly while speaking quickly, or omits suffixes. As a tool for the correctness of reading, the teacher should teach the students false reading.

**KEYWORDS**
Azerbaijani language textbook, reading, expressiveness, intonation

**ARTICLE HISTORY**
Received: 10.08.2023
Accepted: 15.09.2023

**Giriş / Introduction**

Məlumdur ki, ümumtəhsil məktəblərində ana dili təliminin başlıca məqsədi şagirdlərdə nitq bacarığını formalaşdırmaqdır. Bu yanaşma Azərbaycan dili ilə bağlı indi də işlənməkdə olan ənənəvi proqramlarda əsas götürülür. Ancaq onun məzmunu şagirdlərin nitq inkişafına deyil, dilin daxili quruluşunu əks etdirən qaydaların mənimsənilməsinə xidmət edir. İbtidai siniflərdə ana dili fənni *dinləyib-anlama və danışma, oxu, yazı və dil qaydaları* məzmun xətləri üzrə tədris olunur. Bu bacarıqlar iki formada açıqlanır: birinci, hər bir təhsil səviyyəsi üzrə və siniflərin yekununda şagirdlərdən gözlənilən ümumi nəticələr; ikinci, konkret siniflər üzrə zəruri bacarıqları ifadə edən əsas və alt standartlar şəklində. Dil təliminin əsas məzmun xətti olan *oxu* vasitəsilə şagirdlərə yeni sözlərlə tanış olmaq, onun mənasını dərk etmək, sözə münasibət bildirmək, mətnin üslubunu və tərkib hissəsini anlamaq kimi bacarıqlar aşılanır. Oxu fəaliyyət növü sonadək dəyişməz qalan bu standartlar formasında göstərilir:

"Şagird:

2.1. Mətndə tanış olmayan sözləri mənimsədiyini nümayiş etdirir.

2.2. Mətnin məzmun və strukturunu mənimsədiyini nümayiş etdirir" [3, s.48].

Yeni proqramda oxunun metodikası məsələlərinə böyük diqqət yetirilir. Oxu əsas tədris fənni olub, onun vasitəsi ilə şagirdlərə vətənpərvərlik hissləri və müsbət əxlaqi keyfiyyətlər aşılanır. Sözsüz ki, oxunun əsasını bədii əsərlər təşkil edir. Onlar məzmunla formanın vəhdəti şəklində meydana çıxır. Bədii əsərlərin və obrazların dərindən qavranılması üçün onların ideya məzmunu ilə yanaşı, bədii forması da əsas götürülür. Kitab uşağın sürətlə, səhvsiz oxuya bilməsi və onun əqli, əxlaqi və estetik inkişafı üçün olduqca əhəmiyyətlidir. Oxu bacarıqlarına malik olmaq şagirddə sözün mənasına və incə çalarlarına həssas yanaşma keyfiyyəti aşılayır. Bəzi ibtidai sinif müəllimləri tədris prosesində lüğət üzrə işi yalnız oxu dərslərində həyata keçirirlər. Müəllim işin aparılmasını düzgün planlaşdıra bilmir və nəticədə siniflər arasında əlaqə unudulur. Yeni nəşr olunmuş dərsliklərdə "Sözlük" başlığı altında şagirdə tanış olmayan sözlər verilmişdir. Peşəkar müəllim şagirdin qeyri-fəal lüğət fondundakı sözləri fəal lüğət fonduna gətirməyə çalışmalıdır.

*Diksiya* hər bir sözün aydın, düzgün tələffüz olunmasını tələb edir. Normal diksiyanı təmin etmək üçün ayrı-ayrı səslərin artikulyasiyası və tələffüzünə görə yaxın səs (b-p, q-ğ, d-t, s-ş və s.), həmçinin hecaların tələffüzü üzrə məşqlər təşkil olunmalıdır. Əlifba təlimi dövründən başlayaraq şagirdlərin sözləri yazıldığı kimi tələffüz etmələrinə yol verilməməlidir.

Oxunun ifadəliliyi onun ədəbi tələffüz normalarına nə dərəcədə uyğun olması ilə də müəyyən edilir. Orfoepik normaların öyrədilməsi üçün şeirlər daha əlverişli vasitədir. Şeirlərdəki yığcamlıq və bədiilik orfoepik normaların qabarıq şəkildə ifadə edilməsini təmin edir. Məsələn, II sinif Azərbaycan dili dərsliyində verilmiş "Vətənin keşiyində" şeirinə diqqət yetirək:

Laylasında anam mənə
Belə demiş dönə-dönə:
"Bir anan mən, biri Vətən,
Yadda saxla bunları sən.
Canın kimi sev Vətəni,
O bəsləmiş, oğul, səni!
Bayrağını möhkəm saxla,
Sərhədini tez-tez yoxla.
Qəhrəman ol, oğul, sən də
Qoru bizi böyüyəndə".
Gözəl Vətən, gözəl Vətən,
Keşiyində durmuşam mən
[4, s.39].

Şeirin sonunda şagirdlərdən əmr cümlələri ilə ifadə olunmuş misraları seçib yazmaq tələb olunur. Artıq II sinifdə şagird cümlənin məqsəd və intonasiyaya görə növlərini bir-birindən ayırmağı bacarır. Şeiri ilk növbədə müəllim ədəbi tələffüz qaydalarına əməl edərək oxuyur. Daha sonra şagirdlərə sual edir: Şeirin müəllifi kimdir? Şeir hansı mövzudadır? Şeiri yazmaqda müəllifin məqsədi nədir?

Müəllim üçün metodik vəsaitdə mövzu ilə bağlı təlim məqsədləri aşağıdakı şəkildə verilmişdir:

- Həyatda gördüklərinə əsasən verilmiş atalar sözünə uyğun nümunə gətirir (st. 1.2.2.);
- Şeiri məzmununa uyğun intonasiya ilə oxuyur (st. 2.2.1.);
- Cümlənin məqsəd və intonasiyaya görə növlərini müəyyən edir (st. 4.1.7.);
- Vasitəsiz nitqlərdə (dialoqlarda, obrazların nitqində) durğu işarələrindən (tire, qoşa nöqtə, dırnaq) yerli-yerində istifadə edir (st. 4.1.7.);
- Dinlədiyi mətnlə bağlı analoji həyat hadisələrindən, cizgi filmlərindən misal gətirir, müqayisələr aparır (st. 1.1.1.);
- Həyatda gördüklərinə əsaslanaraq fikir yürüdür (st. 1.2.1.).

Dərsin qısa planı isə aşağıdakı kimi əks olunmuşdur:

| | |
|---|---|
| 1. Mövzuya yönəltmə | “Əsgər marşı”nın səsləndirilməsi |
| 2. Danışma | Atalar sözlərinin izahı |
| 3. Oxu | “Vətənin keşiyində” şeirinin oxusu |
| 4. Dil qaydaları | Obrazın nitqinin dırnaq içərisində yazılması |
| 5. Dinləmə | “Əsgərə hörmət” mətninin dinlənilməsi |
| 6. Yazı | Şəkillər üzrə mətnin qurulması |
| 7. Danışma | Əsgər geyiminin rəngi üzrə müzakirə |
| 8. Formativ qiymətləndirmə | |

Müəllim üçün metodik vəsaitə nəzər saldıqda görünür ki, dərsin qısa planında məzmun xətlərinin hər biri reallaşmışdır. Azərbaycan dili dərsliyinin məqsədi ana dilini şagirdlərin bilik səviyyəsinə uyğun olaraq sistemli şəkildə tədris etməkdir. Buna görə də ümumtəhsil məktəbləri üçün tərtib olunan Azərbaycan dili dərs vəsaiti nəzəri və praktik cəhətdən mükəmməl olmalıdır.

Məlumdur ki, şeirlər şagirdlərin hafizəsini möhkəmləndirmək, nitqini inkişaf etdirmək, dünyagörüşünü genişləndirmək, eləcə də estetik zövqünü formalaşdırmaq baxımından müstəsna əhəmiyyətə malikdir. Orfoepik vərdişləri ibtidai siniflərdən başlayaraq geniş mənada dərk etmək lazımdır. Bu, yalnız vurğunu düzgün işlətməklə, yaxud sözü düzgün tələffüz etməklə deyil, həm də dilimizin saflığını qorumaqla, ədəbi dil normalarına əməl etməklə həyata keçirilməlidir. Orfoepik vərdişləri möhkəmləndirmək üçün ilk olaraq şagirdlərdə məzmunlu, düzgün və mədəni danışıq bacarıqları yaratmaq tələb olunur. İkincisi, ibtidai sinif müəlliminin ədəbi dil normalarına yiyələnməsi böyük əhəmiyyət daşıyır. Üçüncü şərt isə, orfoepik vərdişləri tərbiyə etmək üçün müntəzəm olaraq aşağıdakı tapşırıqların aparılmasıdır:

a) şifahi nitqin düzgün və ifadəli olması üzrə iş;
b) şagirdlərə yalnız onların yaş səviyyəsinə uyğun şeir nümunələri deyil, həm də bədii, elmi-kütləvi əsərlərin bir hissəsini əzbərlətmək;
c) şagirdlərin oxu mədəniyyətini artırmaq məqsədilə müəllimin rəhbərliyi;
d) şagirdlərin şifahi və yazılı nitqindəki qüsurları müntəzəm surətdə aradan qaldırmaq;
e) orfoepik məşğələ zamanı əyani vəsaitlərdən (bədii, elmi-kütləvi əsərlərdən, orfoepik cəhətdən gözəl nitq nümunələrini əks etdirən cədvəllərdən) istifadə etmək.

Oxunun ifadəliliyinə təsir edən amillərdən biri də onun sürətidir. İfadəli oxunun sürəti təxminən normal şifahi nitqin sürətinə bərabər olmalıdır. Həddən artıq sürətli, yersiz fasilələrlə oxu zəif qavranılır. Sürət, sözsüz ki, şeirin məzmununa görə seçilir.

Əgər oxunun ifadəliliyindən danışırıqsa, bu zaman intonasiyanı da qeyd etmək lazımdır. Nitqdə, eyni zamanda oxu prosesində intonasiyanın rolu böyükdür. *İntonasiya* sözün mənasını gücləndirməklə bəzən sözdən daha dərin məna kəsb edir. İntonasiya geniş və dar mənada olur. Professor Yəhya Kərimov yazır ki, geniş mənada intonasiya dedikdə, səslənən nitqin birgə təsir göstərən komponentlərinin mürəkkəb kompleksi nəzərdə tutulur. Nitqdə və cümlələrdə bu iki komponent özünü göstərir:

● Vurğuda ifadə olunan və nitqin dinamikasını müəyyən edən qüvvə;

● Müxtəlif hündürlükdə səslər üzrə səsin hərəkətində ifadə olunan və nitqin melodikasını müəyyən edən istiqamət; uzun səslənmə və fasilələrdə ifadə olunan, həmçinin nitqin sürətini, ritmini müəyyən edən sürət və nitqin səslənməsinin xarakterini müəyyən edən tembr. Səslənən nitqin səs qabığı olan bütün bu komponentlər, həmçinin melodiklik və ritm ümumilikdə ifadəliliyi təmin edir [2, s.203].

Şifahi nitqin ifadəliliyini təmin edən əlavə vasitə olaraq mimika və jest də önəmlidir. *Mimika* üz əzələlərinin ifadəli hərəkəti ilə insanın düşdüyü situasiyadan asılı olaraq müxtəlif hisslərin aşkara çıxarılmasına kömək edir. *Jest* isə oxucunun əsərdəki hadisələrə müvafiq əl-qol hərəkətlərini bacarıqla seçməsini, məzmunun obrazlı mənimsənilməsini təmin edən xüsusi vasitədir. Oxunun ifadəliliyi oxu vərdişinə yiyələnməklə bağlıdır. Düzgünlük, şüurluluq, ifadəlilik, optimal sürət normal oxuya verilən tələblərdir. Bir çox hallarda şagirdlər oxu sürətinin aşağı, diksiyanın zəif, nitqin fiziki cəhətdən nöqsanlı olması səbəbindən, həmçinin ifadəli oxunun tələblərinə əməl edə bilməmələri baxımından astadan, pıçıltı ilə oxuyurlar. Oxu müəllimin nəzarəti altında uca səslə aparılmalıdır. İbtidai sinif müəllimi bilməlidir ki, oxu bacarığının yoxlanması zamanı üç məsələ önəmlidir:

- Məzmunluluq (oxu bacarığı anlayışına nələr daxildir və nəyi yoxlamaq lazımdır?);
- Təşkilati (yoxlama nə vaxt və necə keçirilir?);
- Qiymətləndirmə (oxu bacarığı necə qiymətləndirilməlidir?).

*Oxumaq bacarığı* dedikdə, oxu vərdişlərinin inkişafı − düzgünlük, şüurluluq, ifadəlilik, optimal sürət nəzərdə tutulur. Yoxlama prosesində düzgün oxunun başlıca göstəricisi onun sürəti, ifadəliliyi deyil. Oxunun məqsədi mətnin məzmununu başa düşmək, dərk etməkdir. Buradan belə bir nəticəyə gəlirik ki, oxu vərdişləri deyil, oxumaq bacarığı (oxu texnikasına yiyələnmək) ön plana çəkilir. Oxumaq bacarığının qiymətləndirilməsi mübahisəli məsələdir. Burada başlıca göstərici məzmunun şüurlu mənimsənilməsi, keyfiyyət cəhəti deyil, kəmiyyəti − oxunun sürətidir.

Şagirdin dəqiqə ərzində neçə söz oxuması oxunun xarici tərəfi olduğundan onu tezliklə yoxlamaq mümkündür. Əgər şagird normaya nisbətən aşağı sürətlə, lakin ifadəli, şüurlu, səhvsiz və məhsuldar oxuyursa, onu yüksək qiymətləndirmək mümkündür. Oxunun şüurluluğu şagirdlərə tanış olmayan mətn üzrə yoxlanmalıdır. Odur ki, yeni oxu təlimi strategiyalarından, fəal təlim üsullarından istifadə etməklə mətnin düzgün, rəvan, şüurlu, ifadəli oxusunun təşkilinə nail olmaq olar. Bu isə öz növbəsində, oxu üzrə təlim nəticələrinin yüksəldilməsinə geniş imkanlar yaradır.

**Strategiyalı oxu**

Strategiyalı oxu şagirdlərin öz oxu fəaliyyətini təşkil və idarə etməsidir. Strategiyalı oxu "düşünərək oxu" deməkdir. Bu oxu zamanı şagird çevik düşünmək, sual vermək, keçmiş biliklərə əsaslanan yeni biliklər əldə etmək, fikir mübadiləsi aparmaq, nəticədə fikri dəqiq müəyyənləşdirmək və ondan həyati problemlərin həllində bəhrələnmək kimi bacarıqlara yiyələnir. Strategiyalı oxu prosesində şagird təqdim edilən mətnin mənasını dərketmə, problemi müəyyənləşdirmə, mətnin oxusunu isə problemi həlletmə forması kimi dəyərləndirir. Həmçinin şagird gözlənilən nəticəni mətnin oxusuna başlamazdan əvvəl aydın təsəvvür edir:

- suallar cavablandırılmalıdır;
- oxu plana əsasən təşkil edilməlidir;
- uğurlu nəticə üçün daha nələr edilməlidir?

II sinif Azərbaycan dili dərsliyində hekayə xəritəsi verilmişdir. O, şagirdə mətnin məzmununu dərindən qavramağa kömək edir. Hekayə xəritəsində, əsasən, mətnin adı, baş qəhrəman, məkan, məzmun, köməkçi obrazlar, zaman və əsas fikir qeyd edilir. Əgər şagird oxuduğunu şüurlu surətdə başa düşürsə, hekayə xəritəsi qurmaqda çətinlik çəkməyəcək.

İfadəli oxunun təlimi əhəmiyyətindən biri, bəlkə də birincisi sözə, söz sənətinə maraq və məhəbbət tərbiyə etməsidir. Ədəbiyyatçı Soltan Hüseynoğlu haqlı olaraq qeyd edir ki, "söz şagirdə təsir etmək üçün müəllimin ixtiyarında olan güclü vasitədir. Müəllimin sözdən bacarıqla istifadə etməsi, öz nitqini, səsini ustalıqla idarə etməsi, onu bir pedaqoq kimi səciyyələndirən mühüm keyfiyyətdir" [1, s.8]. Əlbəttə, ibtidai sinif müəlliminin nitqinin ifadəli olmasının zəruriliyi buradan qaynaqlanır. Sözsüz ki, müəllimin nitqinə verilən tələblərin çoxluğunu və mürəkkəbliyini unutmaq olmaz. Nitqin məzmunlu olması, seçilən sözlərin tutumu, nitqin quruluşu bu qəbildəndir.

İbtidai sinifdən başlayaraq müəllimin ifadəli nitqi təlim prosesinə ciddi təsir göstərir. Sönük nitq şagirdləri cəlb etmir və nəticədə keçirilən mövzunun qavranılmasında xeyli çətinlik törədir. Emosional rəngə boyanmış, intonasiya çalarları ilə zəngin nitq şagirdlərdə marağı gücləndirir, təlim materialına diqqəti

artırır. Pedaqoqlar arasında belə bir fikir yürüdülür ki, ümumiyyətlə, məktəbdə qeyri-ifadəli oxu olmamalıdır. İfadəli oxunun ən mühüm təlim əhəmiyyəti əsərin öyrənilməsi və qavranılması vasitəsi olmasıdır. Dilin gözəlliyinin duyulmasını təmin edən və bunu səslənən sözdə əks etdirən ifadəli oxu şifahi nitq mədəniyyətinin inkişafında ciddi rol oynayır. Əzbər öyrənmə, bədii nağıletmə ilə başa çatan ifadəli oxu şagirdlərin şifahi nitqinin zənginləşməsinə o vaxt səmərəli təsir göstərir ki, bu yöndə aparılan iş müntəzəm və sistemli olsun. Bir məqamı unutmaq olmaz ki, ifadəli oxunun həm də tərbiyəvi əhəmiyyəti vardır. Məhz oxu dərslərində şagirdlərdə vətənə məhəbbət və sədaqət hissləri tərbiyə olunur, onlara xeyirxahlıq, fədakarlıq, mərdlik kimi keyfiyyətlər aşılanır. Əlbəttə ki, bununla da kiçikyaşlı məktəblilərin dünyagörüşünün formalaşması üçün ilkin bünövrə qoyulur.

## Nəticə / Conclusion

İfadəli oxunun köməyi ilə şagirdlər əsər mətnini oxuyarkən yazıçının məqsədini, onun irəli sürdüyü ideyanı aydın şəkildə başa düşməlidirlər. Hər rola uyğun olaraq səs tonlarını dəyişməli, qəhrəmanın iç dünyasına daxil olmalı, onun yaşadıqlarını öz başına gəlmiş kimi təsəvvür etməlidir. Yalnız belə bir situasiya nəticəsində şagird qəhrəmanın hərəkətlərini, onun mövqeyini, hadisələrə olan münasibətini düzgün şəkildə qiymətləndirər, taleyi haqqında düşünər, ona obyektiv münasibət bəsləyər.

Şagirdlərə ifadəli oxu vərdişi aşılamaq, məzmunun şüurlu qavranmasını təmin etmək üçün bədii təhlilin aparılması, əsərlərin dili və kompozisiyası üzərində müşahidələrin təşkili böyük əhəmiyyətə malikdir.

## İstifadə edilmiş ədəbiyyat / References

1. Hüseynoğlu S. (2019). İfadəli oxunun əsasları. Bakı.
2. Kərimov Y. (2011). Ana dilinin tədrisi metodikası. Bakı.
3. “Kurikulum” elmi metodik jurnal. (2011). № 1(13).
4. Nurullayeva Ü., Bayramova İ., Xanalıyeva A., Məhyəddinova K. (2020). Azərbaycan dili (tədris dili) ümumtəhsil məktəblərinin 2-ci sinfi üçün dərslik, II hissə. Bakı.
5. Nurullayeva Ü., Zahidova Ş., Bayramova İ., Xanalıyeva A., Məhyəddinova K. (2020). Ümumtəhsil məktəblərinin 2-ci sinfi üçün Azərbaycan dili (tədris dili) fənni üzrə metodik vəsait. Bakı.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 3 (277), 42-53
doi.org/10.48445/p1325-2013-5372-s

M E T O D İ K A

# Azərbaycan dili dərslərində inteqrasiyanın yaradılmasında pedaqoji üsul və metodların istifadə imkanları

***Rəhilə Hümmətova***
Filologiya üzrə fəlsəfə doktoru, dosent, Azərbaycan Dövlət Pedaqoji Universiteti.
Azərbaycan. E-mail: rahilahummetova@gmail.com
https://orcid.org/0000-0003-2521-6361

**XÜLASƏ**
Təlim prosesində fənlərin inteqrativ əsaslarla tədrisi müasir dərsə verilən tələblərdən biridir. İnteqrasiya termini təhsildə XX əsrin sonundan etibarən daha aktiv şəkildə istifadə olunmağa başlansa da, əslində, onun ifadə etdiyi məzmun həyatın, cəmiyyətin içərisində mövcud olmuşdur. Müasir cəmiyyətdə baş verən sosial proseslər, ölkələrarası iqtisadi-mədəni əlaqələrin formalaşması və möhkəmlənməsi təhsilin inkişafında xüsusi tələblər irəli sürür. Bu tələblərdən biri də təlimdə inteqrativliyin təmin olunmasıdır. Vaxtında və mövzunun məqsədinə uyğun inteqrasiya təlim prosesində dilə bütöv bir sistem kimi yanaşmağı, hər bir mövzunun zəncirin qırılmaz həlqələri olduğu fikrini dərk etməyi tələb edir. Məqalədə inteqrasiyanın yaradılmasında, mövzuların şüurlu olaraq dərk edilməsində alqoritmik məsələ, linqvistik eksperiment, müqayisə və s. pedaqoji üsullardan istifadə imkanları, həmçinin onlara aid nümunələr əks olunub.

**AÇAR SÖZLƏR**
inteqrasiya, oxşar dil faktlarının fərqləndirilməsi, alqoritmik məsələ, linqvistik eksperiment

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 17.07.2023
qəbul edilib: 22.08.2023

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO.3, VOL. 277, 42-53
doi.org/10.48445/p1325-2013-5372-s

**M E T H O D S**

# Possibilities of using pedagogical ways and methods in creating integration in the lessons of the Azerbaijani language

***Rahila Hummatova***
Doctor of Philosophy in Philology, Associate Professor, Azerbaijan State Pedagogical University. Azerbaijan. E-mail: rahilahummetova@gmail.com
https://orcid.org /0000-0003-2521-6361

**ABSTRACT**
In the training process, the teaching of subjects on an integrative basis is one of the requirements for modern lessons. Although the term integration began to be used more actively in education since the end of the 20th century, in fact, the content expressed by it existed in life and society itself. The social processes taking place in modern society, the formation and strengthening of inter-country economic and cultural relations make special demands on the development of education. One of these requirements is the provision of integrative training. Timely and subject-oriented integration in the learning process requires treating language as a whole system, understanding the idea that each subject is an unbreakable link in the chain. In the article, the possibilities of using pedagogical methods such as algorithmic problem, linguistic experiment, comparison in creating integration and thus consciously understanding the topics and their examples are given.

**KEYWORDS**
integration,
differentiation of similar linguistic facts,
algorithmic problem,
linguistic experiment

**ARTICLE HISTORY**
Received: 17.07.2023
Accepted: 22.08.2023

## Giriş / Introduction

Məlum həqiqətdir ki, bilik insanın müdrik və şəxsiyyət kimi formalaşmasında vasitə rolunu oynayır. Müasir dünyamız təhsilin, innovativ texnologiyanın uğurlu nailiyyətlərinə əsaslanır. Ölkəmizin təhsil sisteminin dünya təhsil sisteminə uğurlu inteqrasiyasını təmin etmək üçün ciddi dəyişikliklər və islahatlar aparılır. Aparılan bu islahatların əsas qayəsi cəmiyyətimiz üçün savadlı, sağlam, demokratik fikirli, məntiqli və tənqidi düşünməyi bacaran, fikir və düşüncələrini müstəqil şəkildə ifadə edən şəxsiyyət formalaşdırmaqdır. Qeyd edək ki, təlim prosesində fənlərin inteqrativ əsaslarla tədrisi müasir dərsə verilən tələblərdən biridir. İnteqrasiya termini təhsildə XX əsrin sonundan daha aktiv şəkildə istifadə olunmağa başlansa da, əslində, onun ifadə etdiyi məzmun cəmiyyət daxilində hər zaman mövcud olmuşdur. Zaman-zaman diferensial yanaşmalar hissələrə bölünməni, ayrılmaları tənzimlədiyi kimi, inteqrasiya prosesləri də bütövləşmələrin, tamamlanmaların nəticəsi olaraq meydana çıxmışdır. Bütün elm sahələrində, o cümlədən sosiologiya və pedaqogikada inteqrasiya önəmli yer tutmuşdur. Ona görə də pedaqogikada “inteqrasiya”, “inteqrativlik”, eləcə də “təhsildə inteqrasiya” və s. anlayışlardan istifadə olunmağa başlanılmışdır[1].

**Tədqiqat işi.** Müasir cəmiyyətdə baş verən sosial proseslər, ölkələrarası iqtisadi-mədəni əlaqələrin formalaşması və möhkəmlənməsi təhsilin inkişafında xüsusi tələblər irəli sürür. Bu tələblərdən biri də, daha öncə qeyd etdiyimiz kimi, təlimdə inteqrativliyin təmin olunmasıdır. Uzun müddətdir ki, qloballaşan təhsil sistemində, eləcə də elm sahələrində inteqrasiya, inteqrativlik, inteqrativ təlim, inteqrativ dərs, inteqrativ fənn və s. ifadə və söz birləşmələrindən daha tez-tez istifadə olunmağa başlanılmışdır. Dünya dövlətlərinin təhsil sistemlərində genişlənən inteqrasiya, əlaqəli təhsil təlim edilən fənlərarası inteqrasiyanın vacibliyini şərtləndirir. İnteqrasiyanın yaradılması mövzuların daha dərindən mənimsənilməsi və uzun müddət yadda saxlanılması üçün mühüm amillərdəndir. Ənənəvi təlimdən fərqli olaraq, fəal təlimdə inteqrativlik ümumpedaqoji prinsip olub, bugünkü təlimin əsas sütunlarındandır. Vaxtında və mövzunun məqsədinə söykənən inteqrasiya təlim prosesində dilə bütöv bir sistem kimi yanaşmağı, hər bir mövzunun zəncirin qırılmaz həlqələri olduğu fikrini dərk etməyi tələb edir. Təbii ki, həlqələr bir-biri ilə möhkəm və sıx bağlanmazsa, qırılar. Mövzular da belədir. Onlar arasında zərurətdən yaranan inteqrasiya möhkəm qurularsa, hər bir mövzu təhsilalanlar tərəfindən daha dərin və

[1] http://kompy.info/fakulte-pedaqoji-ixtisas-azerbaycan-dili-ve-edebiyyat müelliml.html

şüurlu şəkildə dərk edilər. İstər üfüqi, istər şaquli, istərsə də fənnüstü inteqrasiya süni şəkildə yaradılmamalıdır. Qeyd edək ki, dilçilikdə oxşar dil faktları və hadisələri olduqca üstün mövqedədir. Əlaqəsi, oxşarlığı olan mövzuların tədrisində bu əlaqə və oxşarlıqlardan istifadə etməklə həm verilmiş elmi-nəzəri bilik və bacarıqlar xatırlanmalı, həm də yeni mövzular şüurlu şəkildə mənimsədilməlidir. Müxtəlif pedaqoji metod və üsullardan istifadə etməklə fəndaxili, eləcə də fənlərarası inteqrasiyanın yaradılmasına, mövzuların, fənlərin hərtərəfli mənimsənilməsinə nail olmaq mümkündür. Onların bir neçəsinə nəzər salaq:

**Alqoritm üsulu.** Alqoritm üsulu oxşar dil fakt və anlayışları bir-birindən fərqləndirməkdə mühüm əhəmiyyətə malikdir. Alqoritmik məsələlər qoyulmuş suallarla təhsilalanların elmi-nəzəri bilik və bacarıqları yoxlanılır, oxşar anlayışlar daha dəqiq fərqləndirilir və hər birinin spesifik xüsusiyyətləri dərindən dərk edilir. Fərqliliyi bildirmək üçün istifadə olunan bu suallara müvafiq olaraq qısa *"hə"* və ya *"yox"* cavabı verilir. Onu da qeyd edək ki, leksikologiyanın tədrisində dolaşıqlıq yaradan aktual problemlərdən biri omonim və çoxmənalı sözlərin, omoformların, omonimlərlə paronimlərin, sabit (frazeoloji) birləşmələrlə sintaktik vahid olan sərbəst birləşmələrin, morfologiyada ismin tədrisində yiyəlik hal və II şəxsin təkinin mənsubiyyət şəkilçisinin omonimliyinin, təsirlik hal və III şəxsin mənsubiyyət şəkilçisinin omonimliyinin, bəzi say və zərflərin (az, çox, xeyli, bir qədər), atributiv isimlərlə sifətlərin və s. fərqləndirilməsi ilə bağlıdır. Alqoritmik yolla bu cür dil vahidlərini asanlıqla fərqləndirmək mümkündür. Çoxmənalı sözlərlə omonimləri fərqləndirmək üçün aşağıdakı alqoritmik məsələyə diqqət yetirək:

1. Verilmiş qoşa sözlər arasında məna əlaqəsi varmı?

| | | |
|---|---|---|
| | **gül, gül** | **ayaq, ayaq** |
| *Cavab:* | *yox* | *hə* |

2. Verilmiş qoşa sözlər arasında məna əlaqəsini müəyyənləşdirmək mümkündürmü?

| | | |
|---|---|---|
| | **gül, gül** | **ayaq, ayaq** |
| *Cavab:* | *yox* | *hə* |

3. Verilmiş qoşa sözlər eyni nitq hissəsinə aiddir?

| | | |
|---|---|---|
| | **gül, gül** | **ayaq, ayaq** |
| *Cavab:* | *yox* | *hə* |
| ***Nəticə:*** | ***omonim*** | ***çoxmənalı söz*** |

Təhsilalan müəllimin köməyi ilə müəyyənləşdirir ki, *gül* – fars mənşəli söz olub, ətirli bitki, çiçək mənasını verir; *gül (gülmək)* – milli mənşəli söz olub, hərəkət, hal-

vəziyyət kimi semantik tutumlara malikdir. Bu mənalar arasında əlaqə yoxdur və onu müəyyənləşdirmək də mümkün deyil. Lakin *ayaq* – insanın aşağı ətrafı, bədən üzvü; stolun ayağı – oxşatma, bənzətmə əsasında yaranan digər məna çaları arasında əlaqə mövcuddur. Sonradan nə qədər məna yaransa da, birinci, ilkin, dominant məna ətrafında birləşir və məzmunca ona bağlı olur. Beləliklə, *gül* sözlərinin omonim, *ayaq* sözlərinin çoxmənalı olduğu alqoritm vasitəsilə bir daha sübut olunur. Eyni zamanda məlumdur ki, sözdə omonimlik müstəqil mənadır, çoxmənalılıq isə bir sözün müxtəlif semantik variantlarından ibarətdir.

Qoşma ilə bağlayıcını fərqləndirmək üçün belə bir alqoritmik məsələ qoyulur:

1. Eyni fonetik tərkibli **ilə** morfemi əlaqəyə girdiyi sözə semantik çalar qazandırırmı?

*Cümlə:* İbrahim xan **ilə** Vaqif səsə eyvana çıxdı; Sol əli **ilə** uzun saçlarını sığalladı.

*Cavab:* *yox* *hə*

2. Cümlələrdəki **ilə** morfemi əlaqə yaratdığı sözlə birlikdə cümlə üzvü vəzifəsini icra edirmi?

*Cavab:* *yox* *hə*

3. Cümlələrdəki **ilə** morfemi tabeedici xüsusiyyət daşıya bilərmi?

*Cavab:* *yox* *hə*

4. Cümlələrdəki fərqləndirilmiş sözlər tərz, iştirak, məkan məzmunu da (başqa cümlələrdə) yarada bilərmi?

*Cavab:* *yox* *hə*

5. Cümlələrdəki **ilə** morfemi əlaqəyə girdiyi sözlə birlikdə suala cavab verə bilərmi?

*Cavab:* *yox* *hə*

***Nəticə:*** ***bağlayıcı*** ***qoşma***

Oxşar dil faktları və hadisələrin fərqləndirilməsində, hər birinin səciyyəvi xüsusiyyətlərinin müəyyənləşdirilməsində alqoritmik üsuldan məqsədyönlü şəkildə faydalanmaq daha uğurlu nəticənin əldə olunmasına, mövzulararası inteqrasiyanın qurulmasına imkan yaradır. Bu cür pedaqoji üsul və vasitələrin köməyi ilə eyni səs tərkibinə malik olan, həm qoşma, həm də şəkilçi kimi işlənən *-la²; -ca²* morfemlərini də fərqləndirmək mümkündür. Göründüyü kimi, alqoritmik məsələlər qoyulmuş suallarla təhsilalanların elmi-nəzəri bilik və bacarıqları yoxlanılır. Aşağıda verilən başqa nümunələrdə əsas nitq hissəsi ilə qoşmanı fərqləndirməyə çalışaq:

1.Verilmiş qoşa sözlər əlaqəyə girdiyi sözlərlə birlikdə cümlə üzvü vəzifəsini icra edirmi?

*Cümlə:* Ağacda püstə **sarı**; Dolan gəl dosta **sarı**;
Cənazəm üstə **sarı**. Çıxaydım dağa **sarı**.
*Cavab:* *yox* *hə*

2. Verilmiş qoşa sözlər əlaqəyə girdiyi sözlərə əlavə məna çaları verirmi?
*Cavab:* *yox* *hə*

3. Verilmiş qoşa sözlərin yalnız qrammatik mənası olurmu?
*Cavab:* *yox* *hə*

***Nəticə:*** ***əsas nitq hissəsi*** ***köməkçi nitq hissəsi***
***sifət; feil*** ***qoşma***

Beləliklə, mövzunun mahiyyəti ilə əlaqədar sualların qoyuluşu alqoritmik məsələni həll etmiş olur. Bu da öz növbəsində oxşar anlayışların daha dəqiq müəyyənləşdirilməsi və hər birinin spesifik xüsusiyyətlərinin daha dərindən dərk edilməsi üçün əsas verir.

Oxşar dil faktlarından olan sabit birləşmələrlə sərbəst birləşmələri fərqləndirmək üçün də alqoritmik məsələ qurmaq mümkündür:

1. Verilmiş birləşmələr dildən hazır şəkildə götürülmüşdür?
*Birləşmələr:* **ələ salmaq;** **insanın taleyi**
*Cavab:* *hə* *yox*

2. Birləşmə məcazi məna ifadə edirmi?
*Cavab:* *hə* *yox*

3. Birləşmə daxilindəki sözlər öz müstəqilliyini itirirmi?
*Cavab:* *hə* *yox*

***Nəticə:*** ***frazeoloji birləşmə*** ***sərbəst birləşmə***
***lüğəvi vahid*** ***sintaktik vahid***

Beləliklə, yekun olaraq təhsilalan dərindən dərk edir ki, sərbəst söz birləşmələri bir neçə leksik vahiddən törəməsinə baxmayaraq, bütünlüklə leksik mənalı vahid deyil, sintaktik vahiddir. Frazeoloji vahidlər isə lüğəvi vahidlərdir, çünki həmin sözlər bütövlükdə bir məna ifadə edir. Buna görə də ifadənin tərkibindəki sözləri ayrı-ayrı cümlə üzvü kimi təhlil etmək mümkün deyil. Sərbəst söz birləşməsində sözlər öz müstəqilliyini saxlayır, lakin frazeoloji vahidlər leksik birləşmələr olduğundan bu vahidləri əmələ gətirən sözləri bir-birindən ayırmaq olmur. Sabit söz birləşməsi dildə hazır şəkildə olur, lakin sərbəst birləşmə müəyyən ünsiyyət prosesində, tələbata uyğun qurulur, nitq anında yaranır. Frazeoloji vahid sərbəst söz birləşmələrindən törəyir. Konkret söz birləşmələri və cümlə onun mənbəyidir. Frazeoloji vahidlərin böyük bir hissəsi sərbəst söz birləşmələrinin yenidən mənalandırılması əsasında meydana gəlir.

Tədris prosesində linqvistik təhlil aparmaqla, həmçinin istiqamətverici suallar qoymaqla sərbəst və sabit söz birləşmələrinin digər xarakterik əlamətləri də açıqlana bilər: *Birləşmələrdə sözlərin sırası dəyişirmi?; Sabit söz birləşmələri necə yaranır?* və s. Sabit söz birləşmələrində sözlərin sırası, əsasən, sabit olur, bu sıranı dəyişmək və aralarına söz daxil etmək mümkün deyildir. Lakin bədii dildə, xüsusilə lirik növdə frazeoloji birləşmələrdə söz sırasının dəyişməsi emosionallıq yaradan vasitə kimi çıxış edir:

**Düşdü** yenə dəli könlüm **gözlərinin xəyalinə**,
Kim nə bilir, bu könlümün fikri nədir, xəyali nə?
[İ.Nəsimi]

***Linqvistik eksperiment*** sayəsində frazeoloji (sabit) birləşmələrlə sərbəst birləşmələrin fərqli cəhətlərini dəqiq müəyyənləşdirmək mümkün olur. Linqvistik eksperiment oxşar anlayış və məfhumların fərqləndirilməsini nəzərdə tutur. "Bu zaman hər hansı məfhum və ya anlayışın özünəməxsus bir spesifik xüsusiyyəti olmalıdır ki, onu digərindən mütləq fərqləndirə bilsin" [1, s.196].

Çərşənbə günündə çeşmə başında,
Gözüm bir alagöz xanıma düşdü...
[A.Ələsgər].

Birinci misrada *çərşənbə günü* və *çeşmə başı*, ikinci misrada *alagöz xanım* ismi birləşmələrin tərəflərini ayırmaq və başqa sözlə əvəz etmək mümkündür (şənbə günü, çərşənbə axşamı, bazar günü; çeşmə kənarı, dağın başı; qaragöz xanım, gözəl xanım, alagöz qız və s.); tərəflər öz müstəqil leksik mənasını saxlayır; tərəflər arasında sintaktik əlaqə aktivdir və s. İkinci misrada *gözüm düşdü* birləşməsi frazeoloji vahiddir; məcazi məna ifadə edir; bir sözlə əvəz etmək mümkündür, yəni ekvivalenti feildir (vuruldum), dildə hazır şəkildə formalaşıb; tərəflərin arasına söz daxil olması poetik məqsəd daşıyır və s.

***Nəticə:*** çərşənbə günündə, çeşmə başında – II növ, alagöz xanım – I növ təyini söz birləşmələri; gözüm düşdü – frazeoloji birləşmədir.

Eksperiment aparmaqla sərbəst və sabit birləşmələrlə bağlı verilmiş elmi-nəzəri mühakimələri tətbiq edərək, həqiqətən də, *çərşənbə günündə, çeşmə başında, alagöz xanım* birləşmələrinin sərbəst söz birləşməsi, *gözüm düşdü* birləşməsinin isə frazeoloji vahid olduğunu müəyyənləşdiririk.

Linqvistik eksperiment aparmaqla bağlayıcı, qoşma, ədat, eləcə də modal sözlərlə digər oxşar leksem və morfemlərin mahiyyəti, funksiyası, spesifik cəhətləri barədə

dəqiq təsəvvür yaratmış və təlimdəki aktual problemləri həll etmiş olarıq. Bu cür pedaqoji vasitə inteqrativliyin yaranmasına təkan verir. Bu əlaqənin qurulmasını *ancaq* bağlayıcısı ilə reallaşdıraq. Məlum olduğu kimi, *ancaq* bağlayıcısı fonetik tərkibcə məhdudlaşdırıcı *ancaq* ədatı ilə eynidir, yəni qrammatik omonimlik yaradır. Bu cür faktları yenə də seçilmiş cümlələr üzərində müşahidələr aparmaq, uyğun üsul və metod (linqvistik eksperiment) tətbiq etməklə fərqləndirmək mümkündür. Cümlələrə nəzər salaq: *Mən* ***ancaq*** *iman etdim qollarımın zoruna* [A.İldırım]; *Saç ağardı,* ***ancaq*** *nə qəm?! Əlimdədir hələ qələm!* [S.Vurğun]. Bu cür qrammatik oxşarları eksperiment qoymaqla fərqləndirməyə çalışaq: Birinci cümlədə *ancaq* sözünü *yalnız, təkcə, bircə* sözləri ilə əvəz edə bilərik: *Mən* ***yalnız (təkcə, bircə)*** *iman etdim qollarımın zoruna.* Cümlənin ümumi semantik yükündən aydın hiss olunur ki, lirik qəhrəmanın qollarının gücündən başqa, ümid yeri yoxdur və bu məzmunun yaranmasında məhdudlaşdırıcı *ancaq* sözü xüsusi çəkiyə malikdir. Bu köməkçi dil vahidi cümlədəki fikrə emosional rəng qatmaqla yanaşı, başqa imkanların olmasını məhdudlaşdırır. Beləliklə, məlum olur ki, *ancaq* morfeminin funksiyası cümləyə emosional ovqat aşılamaq və məhdudlaşdırıcı məzmun yaratmaqdır. Həm də bu sözlər (məhdudlaşdırıcı funksiya daşıyan *ancaq, yalnız, təkcə, bircə* və s.) cümlədəki digər sözlərdən durğu işarələri ilə ayrılmır. Haqqında danışdığımız bu dil vahidləri cümlədə ifadə edilmiş fikrin mənasını qüvvətləndirməyə xidmət edən ədatdır. Əgər *ancaq* ədatını cümlədən çıxarsaq, struktur cəhətdən heç bir dəyişiklik olmasa da, semantik cəhətdən zəiflik hiss ediləcək: *Mən iman etdim qollarımın zoruna.* Əvvəlki poetik siqlətin söndüyü göz önündədir. İkinci cümlədə *ancaq* sözünə nəzər salaq: *Ancaq* sözünün ümumi cümlə semantikasından qarşılaşdırma məzmunu bildirdiyi aydın görünür. Qarşılaşdırma əlaqəli tabesiz mürəkkəb cümlənin komponentləri arasında əlaqə yaradan *ancaq* sözünü *amma, lakin, fəqət* sözləri ilə əvəzləmək mümkündür. Bu zaman mənaya xələl gəlməz. Cümləni sadələşdirsək, xüsusiləşmiş zərflikli (qarşılaşdırma, ziddiyyət məzmunlu) cümləyə çevriləcək: *Saçın ağarmasına baxmayaraq, qəm yoxdur* (nə? sual əvəzliyi cümlədə üslubi cəhətdən digər sual əvəzliyinin yerində işlənib, inkar məzmunu bildirir, yəni qəm haradadır? Qəm yoxdur mənasında). Qarşılaşdırma-ziddiyyət məzmunu yaradan *ancaq* (*amma, lakin, fəqət*) sözü qarşılaşdırma budaq cümləli tabeli mürəkkəb cümlələrdə baş cümlənin əvvəlində də işlənir: *Düzdür, yaz fəslidir,* ***ancaq*** *(amma, lakin) hava çox soyuqdur.* Bu sözlər həmcins üzvlər arasında da əlaqə yaradır: *Leyla çox oxuyur,* ***ancaq*** *(lakin) fikrini çatdıra bilmir.* Həmçinin mətni təşkil edən cümlələri bağlamağa xidmət göstərir: *"... O hər yerdə, hər məclisdə oğlundan danışar, onun boyunu sevərdi. Buna onun haqqı da var idi. Doğrudan da, bu mahalda iki savadlı vardısa, onun biri Əşrəf*

*idi. Əlbəttə, kitab-dəftərin nə olduğunu bilməyən Zərnigar xanım oxumağın da nə olduğunu başa düşmürdü.* ***Ancaq*** *o bircə şeyi bilirdi ki, oğlu, deyəsən, hamıdan, hətta doğma qardaşı Şamxaldan da seçilir”* [İ.Şıxlı].

Beləliklə, ikinci cümlədəki *ancaq* sözü tabesizlik bağlayıcısıdır, bağladığı həmcins üzvlər, cümlələr arasında qarşılaşdırma məzmunu yaradır; ondan əvvəl vergül qoyulur; sinonimi olan *amma, lakin, fəqət* bağlayıcıları ilə əvəzlənə bilir; əgər cümlədə qarşılaşdırma məzmunu intonasiyanın, antonim sözlərin köməyi ilə formalaşırsa, qarşılaşdırma bağlayıcılarını da bərpa etmək mümkün olur. Məsələn, *Dinmək istədim, imkan vermədilər* (ancaq, amma, lakin imkan vermədilər); *Mən çox deyirəm, sən az eşidirsən – Mən çox deyirəm, ancaq sən az eşidirsən.*

Gəldiyimiz nəticə belədir ki, birinci cümlədə *ancaq* sözü ədatdır. Cümlədə emosional münasibət yaradır; cümlədən çıxarılanda məhdudlaşdırıcı məzmun itir; durğu işarəsindən istifadə edilmir; *yalnız, təkcə, bircə* sözləri ilə əvəzlənə bilir. İkinci cümlədə *ancaq* tabesiz mürəkkəb cümlənin komponentləri arasında qarşılaşdırma əlaqəsi yaradır; həmçinin *amma, lakin, fəqət* bağlayıcıları ilə əvəzlənir; həmcins üzvlər arasında, qarşılaşdırma budaq cümləli tabeli mürəkkəb cümlədə baş cümlənin əvvəlində də işlənə bilir; ondan əvvəl vergül işarəsindən istifadə edilir; cümlədən çıxarılanda məzmuna xələl gəlmir; intonasiya ilə də əvəz etmək mümkündür. Beləliklə, *eksperiment* qoyuruq: *Mən qollarımın zoruna iman etdim; Saç ağardı, nə qəm?! Əlimdədir hələ qələm!*

***Nəticə:*** Birinci ***ancaq*** dil vahidi məhdudlaşdırıcı ədat; ikinci ***ancaq*** qarşılaşdırma məzmunlu tabesizlik bağlayıcısıdır.

Beləliklə, onlarla oxşar dil vahidlərini alqoritmik məsələlər qurmaqla, eksperimentlər aparmaqla (ismin halları, təsirli-təsirsiz feillər, qayıdış və məchul növ feillər, mübtəda və qeyri-müəyyən vasitəsiz tamamlıq, təyin və tərzi-hərəkət zərfliyi, mübtəda və tamamlıq budaq cümlələri, təyin və tərzi-hərəkət budaq cümlələri və s.) dəqiq fərqləndirmək mümkündür. Təbii ki, digər pedaqoji üsullardan – müqayisə, Venn diaqramı, klaster və s. istifadə etməklə də fəndaxili inteqrasiya yaratmaq, oxşar dil faktlarının spesifik cəhətlərini müəyyənləşdirmək olar. Müqayisə üsulunu tətbiq etməklə xəbərlik, kəmiyyət və şəxs şəkilçilərinin oxşar və fərqli cəhətlərini aydınlaşdırmağa çalışaq: Xəbərlik şəkilçiləri xəbərin hansı şəxslə ifadə olunduğunu müəyyənləşdirir, mübtədaya aid olan hökmü meydana çıxarır, onu ya təsdiq, ya da inkar edir. Mübtəda ilə xəbər arasındakı uzlaşma əlaqəsi məhz xəbərlik şəkilçisi vasitəsilə reallaşır. Cümlədə haqqında danışılan neçənci şəxsdirsə, xəbər də həmin şəxsin morfoloji əlaməti ilə bitməlidir. Deməli, cümlədə hökmün ifadəsi xəbərlik şəkilçisi olmasa, mümkün deyil. *Mən insanam* cümləsində ***-am*** şəkilçisi olmasa, *mən*

*insan* sözləri nə cümlə yaradar, nə də mənalı bir hökm ifadə edər. Bu da onu deməyə əsas verir ki, xəbərlik kateqoriyası şəkilçiləri də şəxslərə görə bölünür və hər hansı bir hökmün şəxsə münasibətini bildirir: *Mən insan**am**; Sən insan**san**; O, insan**dır** (tək); Biz insan**ıq**; Siz insan**sınız**; Onlar insan**dırlar** (cəm).* Mənsubiyyətdə olduğu kimi, I və II şəxslərdə subyekt yalnız əvəzliklərlə, III şəxsdə həm əvəzlik, həm də isimlərlə ifadə olunur. Bəzi məqamlarda subyektin ayrıca sözlə ifadəsi olmaya da bilər. Şəxs sonluğu ilə onu asanlıqla müəyyənləşdirmək mümkündür. Məsələn, Mən insanam – insanam. Xəbərlik kateqoriyasının inkarı *deyil* sözü ilə formalaşır və xəbərlik şəkilçisinin morfoloji əlaməti *deyil* sözünün üzərinə əlavə olunur. Məsələn, *Sən elçi deyilsən, sən göndərənsən* [N.Gəncəvi].

Xəbərlik kateqoriyası zaman etibarilə iki müstəvidə (indiki və keçmiş zaman) ifadə olunur. Bəzən üslubi cəhətdən bütün zamanlara da aid edilir. Məsələn, *Adam var, adamların naxışıdır* (Atalar sözləri). *Bu gömgöy göyün altında onlar tamam tək imiş* [Elçin].

Xəbərlik şəkilçiləri bir çox hallarda kəmiyyət və feilə artırılan şəxs şəkilçiləri ilə qarışdırılır. Səbəb isə bunların bəzən şəxs, bəzən xəbərlik şəkilçisi adlandırılmasıdır. Ə.Tanrıverdi bu haqda yazırdı: "Qeyd etdiyimiz kimi, xəbərlik və şəxs kateqoriyalarının şəkilçiləri eynidir. Həm də hər iki kateqoriyanın morfoloji göstəriciləri şəxs əvəzlikləri əsasında yaranmışdır (-q, -k, -dır istisna olunmaqla). Belə ki, qədim türk və Azərbaycan yazılı mənbələrində şəxs əvəzliklərinin feillərdən, həm də isim və isimləşə bilən sözlərdən sonra məhz şəxs şəkilçisi vəzifəsində işlənməsinə rast gəlinir: "Orxon-Yenisey" abidələrində – tutar mən = tuturam. Külüg tirig bən + Külüg tirigəm; M.Kaşğarinin "Divan"ında – mən tənqrigə sığınur mən = mən tanrıya sığınıram; mən kayda mən = mən hardayam; türkmən = türkəm. Kişvərinin "Divan"ında: görürmən–görürəm. Hər gecə duşumdə görürmən pərişan zülfüni... xəstə mən = xəstəyəm. O gözi bimardin ayru ğəribü xəstəmən" [7, s.204-205].

Şəxs və ya xəbərlik kateqoriyası yaranış etibarilə isim və feillərlə bağlıdır. Məlumdur ki, feil iş, hal və hərəkət bildirir. Hər hansı bir iş, hal və hərəkət müəyyən zaman daxilində icra edilir. Zaman kəsimlərində görülən işlər də müəyyən şəxslərə aid olur. İş və hərəkətin şəxsə olan münasibəti müəyyən morfoloji əlamətlərlə təzahür etdirilir ki, bu morfoloji əlamətlər də ayrı-ayrı şəxsləri göstərən şəxs kateqoriyası şəkilçilərindən ibarətdir. Şəxs kateqoriyası feillə ifadə olunan hərəkətin həmin iş, hal və hərəkəti icra edən şəxsə münasibətini bildirir. Daha doğrusu, şəxs kateqoriyası xəbərin mübtədaya olan münasibətini müəyyənləşdirir. Bu kateqoriya qeyd etdiyimiz kimi, adlar qrupuna da aiddir. Məsələn, 1. *Mən müəllimən. Mən gedirəm*; 2. *Sən*

*insansan. Sən alırsan*. Bu cümlələrin xəbərlərindəki şəkilçiləri müqayisə etsək, heç bir fərq görmərik. Sadəcə olaraq, 1-ci cümlələrdə I şəxsin təki, 2-ci cümlələrdə II şəxsin təkinin şəkilçilərinin işləndiyini görərik. Mübtəda ilə xəbər arasındakı münasibət, sintaktik əlaqə (uzlaşma) yalnız bu şəkilçilər vasitəsilə reallaşır. Lakin "*Mən müəlliməm*"*;* "*Sən insansan*" cümlələrində şəkilçi adlara artırılaraq hökmün şəxsə münasibətini bildirməyə xidmət göstərirsə, "*Mən gedirəm*"*;* "*Sən alırsan*" cümlələrində hərəkətin onu icra edən şəxsə münasibətini ifadə edir.

Yeri gəlmişkən, ismin kəmiyyət kateqoriyasının morfoloji əlamətlərindən olan -*lar²* şəkilçisi də feilin şəxs kateqoriyasının əlaməti olan (III şəxsin cəmi) -*lar²* şəkilçisi ilə bəzən qarışıq salınır. Məsələn, *Oğullar atalarını bəyənmirlər.* Hər bir sözdə eyni fonetik tərkibə malik olan şəkilçi morfem işlədilmişdir. *Oğullar* – isimdir; kim? sualına cavab verir; sadədir; ümumidir; konkretdir; cəmdədir; adlıq halındadır; sintaktik vəzifəsi mübtədadır; *atalarını* – isimdir; kimi? sualına cavab verir; sadədir; ümumidir; cəmdədir; mənsubiyyət və təsirlik halın şəkilçisi ilə işlənib; müəyyən vasitəsiz tamamlıqdır; *bəyənmirlər* – feildir; nə edirlər? sualına cavab verir; sadədir; təsirlidir; inkardadır; məlum növdədir; xəbər şəklinin indiki zamanındadır; III şəxsin cəmindədir; sintaktik vəzifəsi xəbərdir.

Müqayisə nəticəsində məlum olur ki, eyni fonetik tərkibə malik olan şəkilçi birinci və ikinci sözlərdə cəmlik yaradır, əşyanın çoxluğunu (*oğullar, atalarını* qrammatik cəhətdən əşya məzmunu bildirir), axırıncı isə feillərdə III şəxsin cəmini ifadə edir. Məlumdur ki, feilin təsriflənən formaları şəxsə və kəmiyyətə görə dəyişir. "Bəyənmirlər" feilindəki -*lər* şəkilçisi III şəxsin cəmini ifadə etdiyi kimi, xəbərin mübtəda ilə uzlaşma əlaqəsinin (kəmiyyətə və şəxsə görə) də morfoloji göstəricilərindəndir. Bu zaman onları cəm şəkilçisi adlandırmaq olmaz. Eyni fonetik tərkibə malik olan -*lar²* şəkilçi isimlərə qoşularaq çoxluq anlayışı ifadə edərkən -*dar², -nar², -rar², -lar²* şəklində tələffüz olunur, yəni assimilyasiya hadisəsinə uğrayır: qızlar – [qızdar], qatarlar – [qatarrar], gəlinlər – [gəlinnər], sahillər – [sahillər]. III şəxs sonluğu ilə işlənən feillərin tələffüzündə isə -*lar²* şəkilçisi dəyişikliyə uğramır, özündən əvvəlki səsi (indiki zaman və qeyri-qəti gələcək zaman şəkilçilərinin son səsi olan "r") öz məxrəcinə uyğunlaşdırır, yəni irəli və tam assimilyasiya hadisəsi baş verir: gülürlər – [gülüllər], alarlar – [alallar], oynayırlar – [oynuyullar] və s. Digər fərq isə ondan ibarətdir ki, -*lar²* şəkilçisi isimlərə qoşularaq əşyanın çoxluğunu bildirir və bu zaman vurğu -*lar²* şəkilçisində saitin üzərinə düşür: *qızla`r, qələmlə`r, evlə`r, kitabla`r* və s. Lakin -*lar²* feillərdə III şəxsə aid olub şəxsin çoxluğunu bildirərkən vurğu qəbul etmir: *almı`şlar, alı`rlar, alaca`qlar, ala`rlar* (şühudi keçmiş zamanda vurğu qəbul edir: aldıla`r) və s. Təbii ki, oxşar dil faktlarının

fərqləndirilməsində təhsilverən yaradıcı olmalı, qarşıya qoyduğu məqsədə müvafiq pedaqoji üsullardan istifadə etməklə fəndaxili inteqrasiyanın qurulmasına şərait yaratmalıdır. Biz isə məqalədə bu üsullarla kifayətlənirik.

**Nəticə / Conclusion**

Müasir təhsilin qarşısında duran əsas tələblərdən biri təlimdə inteqrativliyin təmin olunmasıdır. Zamanında və mövzunun məqsədinə uyğun olaraq yaradılan inteqrasiya təlim prosesində dilə bütöv bir sistem kimi yanaşmağı tələb edir. Təlim prosesində inteqrasiyanın düzgün qurulması mövzuların, fənlərin şüurlu olaraq dərk edilməsinə imkan yaradır. Oxşar dil faktları və hadisələrin fərqləndirilməsində, özünəməxsus səciyyəvi cəhətlərinin müəyyənləşdirilməsində, mövzuların inteqrativ əsaslı tədrisində bir sıra pedaqoji metod və üsullardan istifadə edilir. Alqoritmik məsələ, linqvistik eksperiment kimi pedaqoji üsullardan istifadə etməklə aktual problemləri həll etmək, mövzuları daha dərindən mənimsətmək mümkündür. Məqalədə bu üsullarla çoxmənalı sözlərlə omonimlər, qoşmalarla bağlayıcılar, əsas nitq hissələri ilə qoşmalar, sabit (frazeoloji) birləşmələrlə sərbəst birləşmələr arasındakı oxşarlıqlar və fərqlər araşdırılmış, həmçinin geniş tətbiq imkanına malik olan və ənənəvi təlimdə də üstün mövqeyi ilə seçilən müqayisə üsulundan istifadə etməklə xəbərlik, şəxs və kəmiyyət kateqoriyalarının morfoloji əlamətlərinin spesifik xüsusiyyətləri açıqlanmışdır.

**İstifadə edilmiş ədəbiyyat / References**


1. Balıyev H. (2007). Orta məktəbdə Azərbaycan dilinin tədrisi metodikasından mühazirələr. Bakı.
2. Cəfərov S. (2007). Müasir Azərbaycan dili. Leksika. Bakı, Şərq-Qərb.
3. Hüseynzadə M. (2007). Müasir Azərbaycan dili. Morfologiya, III hissə. Bakı, Şərq-Qərb.
4. Hümmətova R. (2019). Ana dili-2 (dərs vəsaiti). Bakı, ADPU-nun mətbəəsi.
5. Kazımov Q. (2010). Müasir Azərbaycan dili. Morfologiya. Bakı, Elm və təhsil.
6. Kazımov Q. (2000). Müasir Azərbaycan dili. Sintaksis. Bakı, Ünsiyyət.
7. Tanrıverdi Ə. (2010). Azərbaycan dilinin tarixi qrammatikası. Bakı, Elm və təhsil.
8. http://kompy.info/fakulte-pedaqoji-ixtisas-azerbaycan-dili-ve-edebiyyat müelliml.html.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 3 (277), 54-60
doi.org/10.48445/x7495-7915-5473-e

**M E T O D İ K A**

# Əlavə konstruksiyaların mətndə rabitəlilik kateqoriyasını reallaşdıran xüsusiyyətləri

***Rəfanə İsayeva***
Müəllim, Azərbaycan dilçiliyi kafedrası, Azərbaycan Dillər Universiteti. Azərbaycan.
E-mail: refane_isayeva@yahoo.com
https://orcid.org/0000-0003-2668-5602

**XÜLASƏ**
Tədqiqat işində mürəkkəb sintaktik bütövlərin tərkibində olan əlavə konstruksiyalardan bəhs olunur. Əlavə konstruksiyalar özündə mürəkkəb sintaktik bütövlərin mikromövzusu ilə məna cəhətdən sıx əlaqədar dəqiqləşdirici əlavə məlumat ehtiva edir. Bu konstruksiya təhkiyənin ardıcıllığını poza bilsə də, mürəkkəb sintaktik bütövlərin daxilindəki hərəkətlər arasındakı zaman münasibətlərinə xələl gətirmir.

**AÇAR SÖZLƏR**
Azərbaycan dili,
mətn, rabitəlilik,
əlavə konstruksiyalar,
linqvistika

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 11.07.2023
qəbul edilib: 30.08.2023

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO. 3, VOL. 277, 54-60
doi.org/10.48445/x7495-7915-5473-e

METHODS

# Features of additional constructions that realize the category of communication in the text

***Rafana Isayeva***
Teacher, Department of Azerbaijani Linguistics, Azerbaijan University of Languages. Azerbaijan. E-mail: refane_isayeva@yahoo.com
https://orcid.org/0000-0003-2668-5602

**ABSTRACT**
The research work deals with the functions of additional constructions in complex syntactic entities. Supplementary constructions contain additional information clarifying the semantically close connection with the microtheme of complex syntactic entities. Although it may disrupt the sequence of development, this construction does not disrupt the temporal relations between actions within complex syntactic entities.

**KEYWORDS**
Azerbaijani language, text, communication, additional constructions, linguistics

**ARTICLE HISTORY**
Received: 11.07.2023
Accepted: 30.08.2023

## Giriş / Introduction

Hamıya məlumdur ki, ünsiyyətin aparıcı vahidi olan cümlə bitmiş fikri ifadə edir. Lakin cümlə daxil olduğu mətnin, sintaktik bütövün tərkibində daha çox məna qazanır. Mətni təşkil edən cümlələr məna və qrammatik cəhətdən bir-birinə bağlı olur. Müasir dilçilikdə sintaksisi tədqiq etmək yalnız cümləni öyrənməklə bitmir, eləcə də müxtəlif cümlələrin məntiqi və leksik-qrammatik cəhətdən bir-birinə bağlanaraq meydana gətirdiyi "mətni" araşdırmağı da şərtləndirir. Mətnin yaranmasının öz qanunauyğunluqları vardır. Mətndə rabitəliliyin olması bir çox tədqiqatçılar tərəfindən ümumi qəbul olunmuşdur. *"Rabitəsiz mətn yoxdur; rabitəliliyin itirilməsi süni üsul olmadığı təqdirdə mətni məhv edir"* [13, c.46]. Mətndə "məna bağlılığı" və "sintaktik bağlılıq" olur [8, s.496].

Fikrimizcə, rabitəlilik mətnin linqvistik funksional-semantik kateqoriyasıdır, *"dilin bütün səviyyələrinə aid vahid sistemlərinin istifadəsi və bu kateqoriyanın ifadə üsulları funksiyası qismində çıxış edən həmin vahidlərin müəyyən istifadə yolu vasitəsi ilə mülahizələrin məlumat-məntiq ardıcıllığını ifadə edir"* [19, c.110-130]. Bu kateqoriya mətnin müxtəlif elementlərini birləşdirən və mətn elementləri arasındakı "məna münasibətlərinin bu və ya digər aspektlərini əks etdirən" leksik, morfoloji, sintaktik olmaqla, bir sıra vasitələri birləşdirir (ayrı-ayrı sözlər, mülahizələr, mülahizə qrupları) [14, c.96]. Rabitəlilik mətnin linqvistik kateqoriyası kimi həm xüsusi mənaya, həm də bu mənanı reallaşdıran dil vasitələri sisteminə malikdir. Mətn daxilində rabitəliliyi müəyyənləşdirən əsas xüsusiyyət sonradan mətndə öz formal ifadəsini tapan məzmun daxilində qarşılıqlı əlaqələndirmə, çox vaxt da mülahizələrin qarşılıqlı şərtlənməsindən və qarşılıqlı asılılığından ibarətdir. İstənilən mətnin daxilində mövcud rabitəlilik (əsasən, ədəbi-bədii əsərin mətni) dedikdə, biz, həmin mətndəki cümlələrin qarşılıqlı asılılığını, qarşılılqlı əlaqəsini və ardıcıl münasibətlərini başa düşürük.

Əlavə konstruksiyaların mətn daxilində ətraflı kontekst ilə qarşılıqlı münasibət probleminin ciddi və yeganə tədqiqatları hərtərəfli olaraq L.A.Mıltsevanın elmi işlərində öz əksini tapmışdır desək, yəqin ki, səhv etmərik [17, c.100]. Əlavə konstruksiyaların cümlə xaricində rolunu müəyyən edərkən, tədqiqatçı onların əlavə olunduğu kontekstdə əldə etdikləri, həmçinin əlavəedici cümlədən artıq olan funksional-semantik xüsusiyyətlərini də müəyyən edir. Adətən, bu cür əlavələrin iki semantik növü qeyd olunur:

a) məna baxımından əvvəlki cümlənin komponentlərindən asılı olmayan əlavə cümlələr mürəkkəb sintaktik vahidə daxil olan cümlələrin arasındakı əlaqəni kəsir və

müəllifin təhkiyəsindəki cümlələrin arasındakı qarşılıqlı əlaqə zəncirinin yeni halqası qismində çıxış edən cümlələr [Мыльцева Л.А. Ленинград, 1966];

b) əsas mənası əvvəlki cümlənin komponentlərindən asılı olan əlavə cümlələr.

Qeyd etmək lazımdır ki, hər iki növdə əlavə konstruksiyalar − əlavə cümlə qrupları mövcud olur. Bildiyimiz kimi, bu qruplar kontekstə daxil etdikləri məna çalarlarına uyğun gələn əlamətə görə fərqlənir. Belə ki, birinci semantik növdə nitq prosesində müəllifin adresat və adresantın (şəxslərin) davranışı ilə bağlı fikirlərini ehtiva edən əlavə cümlələr seçilir:

**a) mülahizənin buraxılmış hissəsinin məzmunu haqqında xəbər verən əlavələr:**

“İnsan var, bir dəfə görsən də onu,
Ürək unutmayır ömrü uzunu.
Sənin ürəyində o yuva salır,
Ölüm gününədək yadında qalır;
Günəşli-gündüzlü bir xatirə tək,
Ondan ayrılmayır bir an da ürək...”
[11, s.300].

**b) qəhrəmanların nitqinə müəllifin münasibətini bildirən əlavələr:**

O, kürsüyə sinə gərdi. Danışmadı, susdu bir dəm,
Çatıb qara qaşlarını, fikrə getdi o bir anlıq;
(Bəzən dilsiz bir vüqarla qılınc çəkir qəhrəmanlıq.
Qarşısında boyun büküb, səcdə qılır bütün aləm ...)
[11, s.262].

**c) müəllifin nitqinə qəhrəmanın münasibətini bildirən əlavələr:**

Sərin bahar nəsimi tək udur Vətən havasını;
Kim dəyişər yer üzünə öz yurdunu, yuvasını?!
(Kosmopolit tənqidçilər ömrü boyu dandı məni
Dedi: “Əsil şairlərin nə yurdu var, nə vətəni”.
Dedi: “Bütün yer üzüdür sənətkarların ana yurdu,
Bizim çoban şairi də saz üstündə şeir qurdu”
[11, s.301].

**d) müəlliflərin nitqində söylənilənlər ilə bağlı qəhrəmanların fikirlərini ehtiva edən əlavələr:**

O yenə də sükut edir, danışmayır o bir anlıq,
(Bəzən dilsiz bir vüqarla qılınc çəkir qəhrəmanlıq...)
[11, s.263].

Məlum olduğu kimi, əlavələrin ikinci növündə aydınlaşdırma təyinetmə funksiyasını, əsasən səbəb, şərt və s. çalarları ilə müşahidə olunan şəxs və yaxud predmet haqqındakı əlavə məlumat funksiyasını qarşılaşdırıcı və səbəb funksiyalı əlavə cümlələr yerinə yetirir.

Tədqiqat işində biz, leksik-qrammatik əlaqə olaraq mətn koheziyasının reallaşması aspektindəki əlavə konstruksiyaların növünü ətraflı nəzərdən keçiririk. Leksik-qrammatik əlaqələrin mahiyyəti leksik (tammənalı söz) və qrammatik mənaya malik olan sözün (əvəzlik) mənalarını ya öz aralarında, ya da kontakt və ya distant mülahizə, hətta mətn fraqmentləri kimi ayrı-ayrı sözlərin mənalarının münasibəti təşkil edir. Dilçilikdə leksik-qrammatik əlaqələrin araşdırılmasına kifayət qədər tədqiqatlar həsr olunmuşdur [12, c.18-32]. Məlum olduğu kimi, leksik-qrammatik əlaqələr özlərini üç şəkildə büruzə verir:

1) təkrar nominasiyalı;
2) bir tematik sahəyə aid olan;
3) bir kontekstual-semantik sahəyə aid olan.

Dilçilik ədəbiyyatında təkrar nominasiya hadisəsi müxtəlif terminlər ilə qeyd olunur: koreferensiya – *"mətn elementinin eyni həqiqət faktına, denotata aidliyi"* [18, c.215]; düzülmə – *"eyni anlayışların təkrarlanması"* (çox vaxt müxtəlif leksik tamamlamada) [20, c.135]; nisbi əlaqə – *"növbəti cümlə üzvlərindən birinin əvvəlki cümlə üzvünə və ya hissəsinə və yaxud əvvəlki bütöv cümləyə leksik-qrammatik uyğunluq"* [16, c.19]. Təkrar nominasiyaya əsaslanan leksik-qrammatik əlavə növlərinin təsnifatı V.Q.Borbotkonun elmi işində ətraflı araşdırılmışdır [12, c.18-32].

– Tam leksiki təkrar. Məsələn: *Bəli, belə bir fövqəladə (yəni elə tez-tez olurdu ki, bir fövqəladəliyi qalmamışdı) hadisə baş verən kimi Bikə xala başlayırdı* [5, s.359]. *İsmayıl bu teatrın həm direktoru, həm də baş rejissoru olduğu üçün bütün günü işləyirdi, ancaq hərdən (teatrın istirahət günlərində) onların səfalı həyətində oturub söhbət edirdik* [9, s.328].

– Sıfır adlandırma (söz buraxılmasının nəticəsi). Belə olan halda təkrar nominasiya aparıcı sözün (yəni artıq adı çəkilən denotata göndərilən) vasitəsi ilə deyil, sadəcə buraxılan sözün nəzərdə tutulduğu mülahizə strukturu sayəsində həyata

keçirilir. Məsələn: *Yol qısa olsa da (şəhərdəki mədəniyyət evi ilə Quşluq kəndinin arasında cəmi bir kilometr məsafə var idi, kənd şəhərə calaşıq kimi idi.), Sevil gecə vaxtı gedə bilməzdi, qorxardı: ona görə də biz həmişə bu şərtə əməl edirdik* [9, s.328].

– Adını dəyişdirmə (sinonimiya, hiperonimiya). Məsələn: *Qəza ispolkom sədrinin müavini Sadıq Cavadov (keçmişdə Süleyman bəyin faytonçusu Sadıq), qəza kuryeri Süleyman bəyin xalası oğlu Cahangir Nuru oğlu (keçmişdə Cahangir bəy Nusurbəyov) və kənd qarovulçusu Qasım (sabiqdə Qasım yüzbaşı)* [6, s.414].

– Pronominalizasiya (əvəzlik təkrarı). Məsələn: *Bu otaq həqirin (yəni özünün) külfətinə məxsusdur* [9, s.328].

Qeyd etmək lazımdır ki, müxtəlif mülahizələrin komponentləri eyni məzmuna aid olmaqla, bu növ söyləmlərin qarşılıqlı əlaqələrinə səbəb olur. Belə söyləmlərə aid nisbi sözlər koreferent deyildir, lakin bunlar mətn daxilində rabitənin reallaşma vasitəsi kimi çıxış edir. V.Q.Borbotkonun ardınca biz də, əsasən, leksik-qrammatik əlaqələrin aşağıdakı təsnifatına üstünlük veririk.

## Nəticə / Conclusion

Ənənəvi sintaksisdən fərqli olaraq, aktual sintaksisin əsas vahidi söyləm və mətndir. Mətni təşkil edən cümlələrin məntiqi və qrammatik bağlılığı sintaksisin əsas predmetidir. Bu kiçik araşdırmadan da bu qənaətə gəlirik ki, mətnin tərkibinə əlavə qeydlər vermək üçün daxil olan əlavə konstruksiyalar mətni təşkil edən əsas cümlələr arasında olan məntiqi və qrammatik bağlılığı nəinki pozmur, hətta mətnə əlavə semantik bağlılıq qatırlar.

## İstifadə edilmiş ədəbiyyat / References

1. Abdullayev K.M. (2012). Azərbaycan dilində mürəkkəb sintaktik bütövlər (Dərs vəsaiti). Məmmədov A.Y., Musayev M.M. və digərləri. Bakı, Mütərcim. 606 s.
2. Abdullayev Ə. (1998). Aktual üzvlənmə və mətn. Bakı, Xəzər Universiteti Nəşriyyatı. 190 s.
3. Abdullayev Ə.Z. (1959). Azərbaycan dilinin qrammatikası (Sintaksis), II hissə. Bakı, Azərb. EA nəşri.
4. Abdullayev Ə.Z. (2007). Müasir Azərbaycan dili (Sintaksis), 4 cilddə, IV cild. Seyidov Y.M., Həsənov A.Q. Bakı, Şərq-Qərb. 424 s.

5. Abdullayev K.M. (2016). Azərbaycan dili sintaksisinin nəzəri problemləri. Bakı, 359 s.
6. Anar. (2004). Seçilmiş əsərləri. Bakı, "Lider" nəşriyyatı. 414 s.
7. Cahangirov F. (2005). İngilis və Azərbaycan dillərində modallığın struktur-semantik tədqiqi (müqayisəli tipoloji tədqiqat). Bakı, "Elm" nəşriyyatı. 312 s.
8. Kazımov Q.Ş. (2007). Müasir Azərbaycan dili (Sintaksis). Bakı, Təhsil. 496 s.
9. Rəhman S. (2004). Seçilmiş əsərləri, 2 cilddə, II cild. Bakı, Avrasiya Press. 328 s.
10. Seyidov Y.M. (2000). Azərbaycan ədəbi dilində əlavə sözlər və əlavə cümlələr. Bakı, 168 s.
11. Vurğun S. (2005). Seçilmiş əsərləri, 4 cilddə, III cild. Bakı, Şərq-Qərb. 423 s.
12. Борботько В.Г. (1980). Вопросы лингвистического анализа дискурса: Семантико-синтаксическая организация предложения и текста. Грозный, с.18-32.
13. Буслаев Ф.И. (1959). Историческая грамматика русского языка. Москва, Учпедгиз. 46 с.
14. Ионицэ М.П. (1981). Глоссарий контекстуальных связей (На материале французского языка). Кишинев, Штиинца. 96 с.
15. Лосева Л.М. (1963). Межфразовая связь в текстах монологической речи. Автореф. дисс. д-ра. филол. наук. Одесса, 49 с.
16. Мальчевская Л М. (1964). Некоторые языковые средства выражения связи между предложениями. Автореф. дисс. канд. филол. наук. Москва, 19 с.
17. Мыльцева Л.А. (1966). Вводные предложения в современном русском литературном языке: На материале произв. А.Н.Толстого, М.А.Шолохова, К.Г.Паустовского, К.А.Федина. Дисс. канд. филол. наук. Л., 100 с.
18. Новиков А.И. (1983). Семантика текста и ее формализация. Москва, Наука. 215 с.
19. Котюрова М.П. (1974). Повторы как средство связи предложений в научном стиле сравнительно с художественным. Учен. зап. Пермского ун-та. Вып. 302, с.110–130.
20. Севбо И.П. (1969). Структура связного текста и автоматизация реферирования. Москва, Наука. 135 с.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 3 (277), 61-72
doi.org/10.48445/t6880-0776-4102-b

**Q R A M M A T İ K A**

# Funksional morfologiyaya giriş: əsas anlayışlar və perspektivlər

***İsmayıl Kazımov***
Filologiya elmləri doktoru, professor, Türk dilləri şöbəsi, AMEA Nəsimi adına Dilçilik İnstitutu. Azərbaycan. E-mail: prof.ismail.kazimov@gmail.com
https://orcid.org/0000-0002-4470-8786

**XÜLASƏ**
Dilçiliyin yeni istiqaməti − dil haqqında müasir elmin xüsusi aspekti, xüsusi predmeti, eləcə də dil vahidlərinin nitqdəki funksiyası və funksionallaşması qanun və qanunauyğunluqlarının öyrənilməsidir. Bu istiqamət dil sisteminin strukturunun növbəti inkişafını, yeni prinsipial əsaslarını öyrənir, elementlərin qarşılıqlı əlaqəsini və nitqi əhatə edən funksiyaları təyin edir. Dilin, dil vahidlərinin öyrənilməsinə funksional yanaşma və onun elementlərinin vasitələrinin dəyişməsi sistem nəzəriyyəsinin ümumi inkişafı ilə bağlıdır. Beləliklə, funksional linqvistikada dilin tədqiqi yönünü dəyişir, bu prosesdə dil elementlərinin funksional keyfiyyətlərini meydana çıxarır, həmin istiqamətdə dili təsvir edir, struktur-sistem və funksional aspektdə müxtəlif tərəfləri ilə aydınlaşır.

**AÇAR SÖZLƏR**
funksionallıq, funksional qrammatika, funksional morfologiya, morfosintaksis

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 09.07.2023
qəbul edilib: 11.08.2023

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO. 3, VOL. 277, 61-72
doi.org/10.48445/t6880-0776-4102-b

G R A M M A R

# An introduction to functional morphology: basic concepts and perspectives

***Ismayil Kazimov***
Doctor of Philological Sciences, Professor, Department of Turkology, Institute of Linguistics named after Nasimi of ANAS. Azerbaijan. E-mail: prof.ismayil.kazimov@gmail.com
https://orcid.org/0000-0002-4470-8786

**ABSTRACT**
The new direction of linguistics is a special aspect of the modern science of language, a special subject, as well as the study of laws and regularities of the function and functionalization of language units in speech. This direction studies the further development of the structure of the language system, its new principles, determines the interaction of elements and the functions surrounding speech. The functional approach to the study of the language, language units, and the change of means of its elements is related to the general development of the system theory. Thus, the study of language in functional linguistics changes its direction, in this process it brings out the functional qualities of language elements, describes the language in that direction, and becomes clear with its various sides in the structural-systemic and functional aspect.

**KEYWORDS**
functionality, functional grammar, functional morphology, morphosyntax

**ARTICLE HISTORY**
Received: 09.07.2023
Accepted: 11.08.2023

## Giriş / Introduction

Dil öz məzmun və mahiyyətinə görə funksional yaradıcılıqdır. O, insan cəmiyyətində meydana gəlir və təfəkkür aləti kimi qarşılıqlı əlaqə prosesində funksionallaşır.

*Funksiya* − latın mənşəli termin olub, *"vəzifə"*, *"fəaliyyət dairəsi"* mənalarını ifadə edir. Dilçilikdə dil vahidlərinin özünəməxsus fəaliyyət dairəsi vardır. Bu, funksional asılılıq və münasibət deməkdir. Həmçinin dilin funksiyası − praqmatik funksiyadır. Bu funksiya ilə semantika leksik və qrammatik vasitələrlə ifadə olunur. *Funksionallıq* çoxmənalı terminoloji vahid olub, müasir linqvistikada dilin və qrammatikaya funksional yanaşmanın ümumi tipologiyasını öyrənir.

Morfoloji vahidlərin funksiyası ünsiyyətin başlıca fazası olan söyləmlərin qurulmasında onların rolu ilə müəyyən olunur. Morfologiyada dil vahidlərinin mənası və funksiyası arasında olan qarşılıqlı münasibət semantika ilə morfologiyanın qarşılıqlı əlaqəsi kimi öyrənilir.

**Funksional morfologiya kursu, onun predmet və vəzifələri. Ümumi morfoloji sistemin təsviri**

*Morfologiya* – dilçiliyin, qrammatikanın bir bölməsi olub, sözün strukturunu öyrənir. Sözün strukturu dedikdə, onun morfem tərkibi nəzərdə tutulur. Həmçinin morfologiya qrammatik mənanın ifadə vasitələrini, qrammatik kateqoriyaları və sözün leksik-qrammatik dərəcələrini (nitq hissələrini) də tədqiq edir.

Morfologiyanın bir növü *funksional morfologiya* adlanır. O, dil vahidlərinin struktur və funksiyaları arasındakı əlaqə və münasibətləri öyrənir. Funksional morfologiyanın tədqiqat obyekti morfoloji vahidlərdir. Morfoloji vahidlərin funksiyası əlamətlərin formalaşması, bu vahidlərin nitq prosesində gerçəkləşməsi ilə əlaqədardır. Morfoloji vahidlərin funksiyası qrammatik məkanda sonradan meydana gələn əlamətdir.

İsveçrə alimi Ferdinand de Sössür dilə funksional yanaşmanı nəzərdə tutaraq belə bir fikir söyləmişdir: *"Dil − əlaqə, ünsiyyət, qarşılıqlı münasibətdə dənizdə olan gəmidir. Dilə funksional baxış buna bənzəyir"* [1, s.25].

Dilçi alim V.Q.Qak dilin öyrənilməsində funksional yanaşmanın tipologiyasına toxunur və yazır ki, "dilin funksional aspektində nitq (diskurs) öyrənilir, real kommunikasiyada insanın nitq tərzi, nitq rəftarı və s. tədqiq edilir" [2, s.5-15].

Tədqiqat prosesində funksional qrammatikanın nəzəriyyəsi hazırlanmışdır. Buraya aspektuallıq, temporallıq, modallıq, lokallıq, morfoloji kateqoriyalar, sintaksisdə söyləm, taksis və s. daxil edilmişdir [3, s.348; 4, s.263; 5, s.346].

Tədqiqatçılar törəmə qrammatikasının yeni variantını irəli sürərkən “funksiya” terminini səciyyəvi mənada işlədir. Bu isə ənənəvi qrammatik kateqoriya olan funksiyadan fərqlənir. Ənənəvi mənada “funksiya” əlaqə kimi başa düşülür, obyekt və subyekt mənasında işlədilir. Alt qat strukturda başlıca əlaqələr olub semantik baxımdan şərh edilir, üst qat isə bütün struktura məxsus əlamətlərdən məhrumdur.

A.V.Bondarkonun təbirincə, funksional qrammatikanın əsas prinsiplərini funksional-semantik sahə ilə onun tipologiyası təşkil edir. O, funksional qrammatikanın vəzifələrini müəyyənləşdirmiş, müxtəlif dil səviyyələrində qrammatik vahidlərin və onların elementlərinin qarşılıqlı əlaqəsinin dinamik xarakterini göstərmişdir [6, s.4-5].

Akademik İ.P.İvanov funksional qrammatikada sahə anlayışını belə izah edir: “Hər bir nitq hissəsi bir vahiddir, hər bir müəyyən əlamətləri, nüvəni əhatə edir. Əhatə olunan elementlər mərkəzi və periferik elementlərdən ibarətdir” [7, s.285].

E.V.Qulıqa təklif edir ki, funksional-semantik sahə terminini başqa bir adla − *qrammatik-leksik sahə* olaraq adlandırmaq olar [8, s.184].

Müasir linqvistikada funksional qrammatika anlayışı ilk dəfə 1920-1930-cu illərdə Praqa dilçilik məktəbində tədqiq edilmişdir. Tədqiqatlar zamanı bu anlayışın mahiyyəti obyektiv olaraq aydınlaşdırılmışdır. Sonralar A.V.Bondarko funksional qrammatikaya və bu yeni qrammatik yazı təcrübəsinə *funksional-semantik sahə* anlayışını gətirmişdir. Alim funksional-semantik sahələrə aşağıdakı linqvistik qrupları aid etmişdir:

1. Predikativ nüvəli funksional-semantik sahələr:
   a. Aspektual, aspektual-temporal və ya zaman əlaqələrinin sahələr kompleksi: aspektual sahələr, zaman məhdudiyyəti, taksis (öncəgəlmə, eyni vaxta düşmə, təqibetmə hərəkətlərinin birlikdəliyi), temporallıq və ya zamanlılıq, onun sözügedən kompleksə daxil olan digər funksional-semantik sahələrlə əlaqələri;
   b. Temporallıq və ya zamanlılıq, modallıq, həyati gerçəkliyi, gerçəklikləri və sadə həqiqətləri təşkil edənlərin və ya hər şeyin iyerarxik bütünü;
   c. Predikativliyi subyektivlik və obyektivliklə bağlayan sahələr kompleksi: şəxslər və ya şəxs kateqoriyası, feilin növ, təsirlilik-təsirsizlik kateqoriyası və ya onun mənaca növləri (aktivlik/məchulluq, qayıdışlıq/refleksif, icbarlıq/təsirlilik, qarşılıqlıq-müştərəklik/resiprok və ya təsirsizlik);
2. Subyekt-obyekt (predikativ-subyekt və predikativ-obyekt) nüvəli funksional-semantik sahələr: subyekt, obyekt, subyekt-predikat əlaqələrinə bağlı olaraq qiymətləndirilən söyləmin kommunikativ perspektivliyi; Bu qruplaşmaya bəzi əlamətlərinə görə müəyyənlik və qeyri-müəyyənlik bildirən funksional-semantik sa-

hələr də qoşulur. Bunlar digər qruplaşmalara aid olan "zaman məhdudiyyəti və ya sərhədləri, o cümlədən sərhədsizlik, keyfiyyətlilik" funksional-semantik sahələri ilə əlaqəlidir.

3. Keyfiyyət və kəmiyyət nüvəli funksional-semantik sahələr: keyfiyyətlilik, kəmiyyət, müqayisə/müqayisəlilik (lat. *comparativus*); Qruplaşmaya mənsubiyyət, aidolma, sahiblik (lat. *possessives*) funksional-semantik sahəsi də aiddir. O isə bir tərəfdən atributivlik və ya substansiyanın keyfiyyətinə görə, digər tərəfdən isə prediktvlik əlaqəsi ilə bağlıdır.

4. Hal, durum, vəziyyət və s. nüvəli funksional-semantik sahələr: yer, məkan və ya hər hansı bir yerdə olmaq (olma, olunma); səbəb-nəticə əlaqəsi, şərtlənmə və ya asılılıq sahələrinin kompleksi (səbəb, məqsəd, şərt, güzəşt, nəticə funksional-semantik sahələri).

"Yer, məkan və ya hər hansı bir yerdə olmaq" funksional-semantik sahələr fenomeni əlamətinə görə predikatın hal, durum, vəziyyət və s. səciyyəli xüsusiyyətlərilə əlaqəlidir. Ancaq başqa əlamətlərinə görə predikatlararası əlaqələr sahəsinə dərindən toxunan (eyni zamanda taksislə də bağlı) "yer, məkan və ya hər hansı bir yerdə olmaq" fenomeni və söyləmin (hər şeydən öncə, predikatın) məkanı xarakteristikası fərqli semantik sferalardır [6, s.31-32].

Normativ, təsviri qrammatikadan fərqli olaraq, 1970-ci illərdən etibarən türkoloji dilçilikdə də semantik və funksional qrammatika anlayışı formalaşmağa başladı. M.Musayev aparılan araşdırmaları, o cümlədən semantik və funksional dəyərləndirmələri bütövlükdə məzmun və ifadə planı, ayrılıqda isə yönüm və üsul etibarilə 3 qrupa ayırmışdır. Bunlar aşağıdakılardan ibarətdir:

*Birincisi,* müəyyən zaman daxilində feilin tərz, növ, şəxs və ya ayrı-ayrı qrammatik kateqoriyalarının funksional-semantik sahələr üzrə konkret türk dillərində işlənilməsinə və onların tarixi inkişafının öyrənilməsinə dair yeni bir türkoloji-linqvistik anlayışla müəyyən araşdırmalar aparılmışdır [9, s.197].

Ayrı-ayrı kateqoriyaların öyrənilməsi işi mərhələlər üzrə aparılmışdır. Məsələn, türkoloji dilçilikdə tərz kateqoriyasının öyrənilmə tarixi iki mərhələyə ayrılmışdır:

1) 1869-cu ildən 1956-cı ilə qədər;

2) 1956-cı ildən günümüzə qədər.

1956-cı ildə Alma-Atada feilin tərz və ya görünüş *(Alm. aspekt)* kateqoriyası və mürəkkəb cümlə probleminə dair keçirilən simpoziumda türk dillərində tərz kateqoriyasının o zamana qədərki rus dili nümunəsində yerinə yetirilmiş olan təsvirinin yanlış olduğu göstərilmişdir. Belə ki, tərz və ya görünüş konseptual komponentləri

tək bir leksik-morfoloji kateqoriya səviyyəsində müəyyənləşdirilmişdir [10, s.109-110].

*İkincisi,* türk dillərində semantik-funksional əlaqələr və bəzi simmetrik-asimmetrik mütənasibliklər təsbit olunmuşdur.

*Üçüncüsü,* qrammatik kateqoriyaların struktur-semantik və funksional ölçüləri yeni linqvistik istiqamətlərdə öyrənilmişdir.

Funksionallıq aşağıdakıları müəyyənləşdirir və ya təyin edir: uzual ümumi ziddi, əksi; nitqin aktuallaşmasını və dil sisteminin əksi; onomosioloji-semasioloji əksi; kəmiyyətin əks strukturunu; formal-qrammatik leksik-semantikin ziddi; semantik formal-strukturun əksi; sintaktik morfoloji və leksik xüsusiyyətin əksi.

Funksional qrammatika qrammatikanın inkişafında yeni mərhələdir. Müasir dilçilikdə qrammatiksentrizm müasir qrammatikanın yeni təsvir növlərini əmələ gətirmişdir: deskriptiv, törəmə, funksional, assosiativ, aktiv, passiv qrammatikalar. Bunlar bir-biri ilə əlaqədar olub, dil-mətn, dil-sistem, dil-istedad, qabiliyyət dixotomiyasını təşkil edirlər.

Funksional qrammatikanın əsas prinsipləri semantiksentrizm, funksional dil işarələrinə diqqət, funksional vahidlərin sistem təsvirindən ibarətdir. Ənənəvi qrammatika ilə funksional qrammatika obyekt, məqsəd, təhlil istiqaməti və genetik əlaqələrə görə bir-birindən fərqlənir.

Funksional qrammatikanın mənbələri funksional-qrammatik tədqiqatlardan, funksionalizm səciyyəli fikirlərdən (Praqa linqvistik dərnəyi, E.Kuruloviç və b.), semantik kateqoriyalardan, İ.İ.Meşşaninovun, V.V.Vinoqradovun morfologiya və sintaksislə bağlı ideyalarından, modallıq və növ kateqoriyalarından, dilin sahə strukturu və nəzəriyyəsindən, L.V.Şerbanın aktiv və passiv qrammatika barədə fikirlərindən və onomosioloji araşdırmalardan ibarətdir.

Funksional yanaşmada obyektə münasibət onun bütöv kontekstdə rolu ilə ölçülür. Məsələn, maşın hissələrindən (motordan) bəhs edərkən onun motoru, insan həyatında rolu və s. açılıb göstərilməlidir.

Funksional morfologiyanın əsas anlayış və problemləri Sankt-Peterburq funksional qrammatika məktəbində müzakirə olunmuşdur. Müzakirə olunan məsələlər bunlardır: Funksional-semantik sahə (FSS), predikativlik (aspektuallıq, modallıq, temporallıq), predikativ (lokativlik), subyekt-obyekt (subyektivlik, personallıq, obyektivlik və keyfiyyət-kəmiyyət nüvəsi).

Funksional qrammatikanın tərkib hissəsi kimi aktiv qrammatika nitq qrammatikası − danışanın qrammatikası (B.Norman), assosiativ qrammatika (Y.N.Karaulov) başa düşülür.

Beləliklə, dilin öyrənilməsinə funksional yanaşma, dili funksional aspektdə öyrənmək, dilin morfoloji tərəfini nitq ilə əlaqəli tədqiq edir. Dil hadisələri insanın davranışını, əxlaq və hərəkət tərzini, nitq təcrübəsini, real ünsiyyət aktı ilə birgə tədqiq edir. Bu problemi mətnlə bağlı araşdırmaq, habelə dil və onun konkret gerçəkləşməsi də funksional istiqamətdə öyrənilir. Bu istiqamətdə dilin morfoloji vahidləri sosiolinqvistik, mətn linqvistikası, linqvistik paradiqma səviyyələrində də nəzərdən keçirilir.

**Funksional-kommunikativ morfologiya (FKM) və onun linqvodidaktika elmi ilə əlaqəsi. Linqvodidaktik düşüncənin formalaşması**

Linqvodidaktik-linqvistik didaktika pedaqogikanın təlim üsullarından bəhs edən şöbəsidir. Linqvistik düşüncə təlim prosesində morfoloji kateqoriyaların müvafiq funksiyalarını meydana çıxarır. Müasir türk dillərinin linqvodidaktik modeli yaranır. Funksional-kommunikativ qrammatikada kateqorial söz siniflərinin özünəməxsus yeri var.

Linqvistikanın didaktik əsasları funksionallıq − asılılıq yaradır. Linqvistikada bir tərəfdən də didaktik cəhətlər aktivləşir. Linqvistikanın didaktik prinsiplərinə yeni tərzdə yanaşmaq tələb olunur. Didaktikanın "qızıl qaydası" (Y.A.Komenski) linqvistikaya tətbiq olunur. Onun strategiyası yüksəlir. Məsələn, burada morfemlərin funksional sırası və funksional sintaksisin əlaqəsi, bir-birinə təsiri görünür. Funksional-kommunikativ qrammatikada metadili mənimsəmə funksional linqvistika elminin vacib bölmələrindən biridir. Yiyəlik hal şəkilçisi: -ın$^4$ öz variantları ilə birlikdə illər ötsə də, işlənməkdədir. Hər bir konkret anlayış zamanı bu şəkilçinin işlənməsi zərurətə çevrilir. Məsələn, *ağacın budağı, yarpağın rəngi, günəşin istisi* və s. Bu şəkilçilər və onun işləndiyi qrammatik şərait vasitəsilə yiyəlik, sahiblik anlayışının yaradılması artıq dilçilik elmi tərəfindən mənimsənilmişdir. Həmin birləşmədə mənsubiyyət şəkilçisi mənsubluq anlayışı bildirməklə söz birləşməsinin mənasını tamamlayır və onu bütövləşdirir. *"Uzusun (ənənə, adət) ziddinə olaraq mənsubiyyət şəkilçisini ixtiyari şəkildə sözün tərkibindən çıxardıqda birləşmə mənasızlaşır. Belə ki, məsələn, ağacın budaq, yarpağın rəng, günəşin isti şəklində ifadə etmək mümkün deyildir"* [11, s.52].

Dil vahidləri arasında mövcud əlaqələri morfologiya və sintaksis (morfosintaksis elmi) yerinə yetirir. Bu əlaqələr qrammatik ardıcıllığı saxlamaqla anlayışların ifadəsini təmin edir, morfosintaktik sistemin bütövlüyünü qoruyub saxlayır. Deməli, *morfosintaksisin yaranması* öz-özünə zəruriləşmişdir.

Azərbaycan dilçiliyində dil vahidlərinin, o cümlədən morfoloji vahidlərin funksional-kommunikativ təhlilinin formalaşma təcrübəsi (vərdişi, bacarığı) hələki

azlıq təşkil edir. Bu səviyyəni yüksəltmək üçün nitq hissələri və morfoloji kateqoriyaların qarşılıqlı əlaqəsini, bir-birindən asılılığını dərindən öyrənilməsi gərəkdir. Təcrübə göstərir ki, morfoloji kateqoriyalar bir-birinə güclü təsir edir.

Türk dillərində funksional qrammatikanın (morfologiyanın) təsviri "*formadan – ifadə (vasitə) funksiyası*" prinsipinə əsaslanır: "Struktur formadan ifadə formasına, vasitələrinə".

Normativ, ənənəvi morfologiyadan fərqli olaraq, funksional morfologiyada kök və şəkilçi morfemlər nitq prizmasından öyrənilir. Tədqiqat planı aşagıdakı kimi müəyyənləşdirilib:

**İsim.** İsim praktik qrammatikada. Cümlə-söyləmlərin nitq və mətndə formalaşmasında isimlərin rolu. İsmə aid morfoloji kateqoriyaların funksional və praqmatik əlaqəsi. Xüsusi mənaya malik olan ismin funksionallaşma imkanları genişdir. Onun leksik-qrammatik (semantik) dərəcələri morfoloji kateqoriyalar səviyyəsində realizasiya olunur. Buraya xüsusi predmet adları, şəxs adı, zoonimlər, toponimik vahidlər, propozitiv, toplu isimlər və s. daxildir.

İsmin morfoloji kateqoriyaları. Semasioloji və onomasioloji aspektlər. Hal sisteminə onomasioloji yanaşma. Hal formalarında temporallıq, lokativlik, konzetivlik.

İsimlərin digər kateqoriyaları. Kəmiyyət kateqoriyasının funksionallığı. Funksionallıq -lar$^2$ morfoloji göstərici ilə ifadə olunur. Bu məzmunda tək və cəm anlayışları mövcuddur. Ümumiyyətlə, cəmlik ifadə etmək funksiyası -lar$^2$-dən savayı, -lıq$^4$, -lı$^4$, -ıq$^4$, -ız$^4$ şəkilçilərinin də öhdəsinə düşür. Məlumdur ki, həm şəxs paradiqmasına daxil olan morfoloji göstəricilərdə, həm də bəzi sözdüzəldici şəkilçilərdə kəmiyyət bildirmə funksiyası aktiv müşahidə edilir.

İsmin halları və onların semantikası. Hal formalarının işlənməsinin (istifadəsinin) əsas mövqeləri. Halların məna və funksiyaları.

**Sifət.** Sifətin leksik-semantik və qrammatik dərəcələri. Qısa və bütöv keyfiyyət formalarının (intensivlər) yaranma xüsusiyyətləri [12, s.236]. Sifətin əsas mənası və funksionallaşması. Sifətin leksik qrupları. Sifətin bütöv və yarımçıq formaları. Sifət semantik və üslubi-praqmatik kateqoriya kimi. Sifətin müqayisə, intensivlik dərəcələri.

**Say.** Say praktik qrammatikada. Müasir türk dillərində sayın funksionallaşma xüsusiyyətləri.

**Əvəzlik və əvəzlik sözlər.** Nitq hissələri arasında əsas funksiyaları əvəzlik yerinə yetirir – işarə vahidləri vasitəsiz nitq aktını oriyentasiya edir, fərdi predmet uyğunluğu, konkret situasiyada söyləmləri uyğunlaşdırır. Əvəzlik söz-formaların

funksiya dərəcəsi. Əvəzliyin ümumi funksional səviyyəsi. Onun funksional-semantik təsnifi. Əvəzlik və onun ümumi mənası nitq söyləmlərini həm konkretləşdirir, həm də aktuallaşdırır. Konkretləşdirici referen: mən, sən, kim? Müasir türk dillərində əvəzliyin funksionallaşma xüsusiyyətləri. Əsas funksiyalar: 1) deyktik; 2) anaforik; 3) kataforik; 4) kvantativ. Əvəzliyin deyktik funksiyası mətnyaradan, yaxud anaforik, kontekstual elementlərdir. Məsələn: *Qardaşım gəlmişdi. O, xəstə idi.* Cümlə strukturunda əvəzliyin sintaktik funksiyası. "Öz" əvəzliyindən istifadə şərtləri. Sözün – işarə əvəzliyinin referensiya – daxili tərəfi və digər xüsusiyyətləri. Obyektiv reallıgının əksi.

**Zərf.** Müasir türk dillərində zərfin funksionallaşma xüsusiyyətləri. Zərfin nitqdə və mətndə işlənməsinin semantik və funksional faktorları. Müxtəlif funksional-semantik dərəcələr: tərz, zaman, yer, səbəb və s.

Vəziyyət kateqoriyası və onun türk dillərində funksionallaşma xüsusiyyətləri.

**Feil.** Feil praktik qrammatikada. Feilin müasir türk dillərində funksionallaşma xüsusiyyətləri. Feilin əsas forma və morfoloji kateqoriyaları. Hərəkət feilləri və onların qrammatik spesifikası. Hərəkət feillərinin tərkibi. İki hərəkət feilinin fərqli semantikası. Feilin əlavə, ikinci funksiyaları.

Feilin növ kateqoriyası. Növlərin müasir türk dillərində funksionallaşma xüsusiyyətləri. Feilə məxsus ikinci funksiyalar. Feilin zaman formalarının transpozisiyası – mövqeyi. Feil dildə ən mürəkkəb və konstruktiv nitq hissəsidir. Feilin semantikası dildə relyativ səciyyə daşıyır. Feilin semantik əsasları subyektin iş və fəaliyyət aspektlərini, proses anlayışını əks etdirir. Feildə prosessuallıq öz əksini tapır. Feil, həmçinin struktur-semantik kateqoriyadır. Feil fəaliyyət və işlə əlaqədar insan şüurunu inikas etdirir. İnsanın psixoloji və fiziki fəaliyyəti güclü feil formaları ilə realizasiya olunur.

Qeyd edək ki, müasir türk dillərində feil aşağıdakı vəziyyətlərdə funksionallaşır:

1. Çoxaspektli mürəkkəb sistem kimi;
2. Dildə və nitqdə feili vahidlərin koqnitiv və dil mexanizminin realizasiyası kimi;
3. Feilin, hərəkət və prosesin verballaşması insan təcrübəsi kimi;
4. İnsanın işini, fəaliyyətini əhatə edən proses kimi;
5. Feili vahidlərin tematik qrupları (əsas kompleks təhlil);
6. Feilin morfoloji paradiqması;
7. Feilin qrammatik formalarının aktuallaşması (dialoji mətnlərdə);
8. Feil formalarının, variantlarının funksional imkanları;
9. Güclü feil formaları, mətndə *marginal* zonaların yaranması;
10. Feil funksional-semasioloji aspektdə [13, s.167].

Dildə feili yalnız qrammatik vasitələrlə təsvir etməkdən savayı, onları funksional vasitələrdən istifadə etməklə də xarakterizə etmək olur. Bu xüsusiyyətlərə feilin funksional bölgüsü, onun prinsiplərinin təyin olunması, leksik-qrammatik və leksik-semantik əlamətləri, nitqin müxtəlif funksional-məna tipləri və üslubi funksiyaları daxildir.

**Köməkçi nitq hissələri. Onların (qoşma, bağlayıcı, ədat, modal söz) müasir türk dillərində funksionallaşma xüsusiyyətləri**

Beləliklə, funksional morfologiya məsələlərinə aşağıdakılar aiddir:

a. Müasir türk dillərinin morfoloji sisteminin təsviri;

b. Türk dillərinin qrammatik quruluşunun struktur-semantik və funksional-praqmatik qanunauyğunluqlarının tədqiqi;

c. Dil faktlarının funksional-kommunikativ dəyəri − qiyməti, onların nitqdə seçim vərdişi, bacarığı.

Funksional morfologiyada aşağıdakı mövzuların tədqiqi nəzərdə tutulmuşdur:

1. Müasir türk dillərinin funksional-semantik kateqoriyaları (aspektuallıq);
2. Müasir türk dillərinin funksional-semantik kateqoriyaları (personallıq);
3. Müasir türk dillərinin funksional-semantik kateqoriyaları (temporallıq);
4. Müasir türk dillərinin funksional-semantik kateqoriyaları (modallıq);
5. Nitq hissələrinin təsnifində mübahisəli məsələlər;
6. Paradiqma tipləri;
7. Qrammatik kateqoriyaların tipləri;
8. Növ kateqoriyasının xarakteri;
9. Müasir türk dillərində funksional omonimlik;
10. Qrammatik kateqoriyaların tipoloji xüsusiyyətlərinin nitq paradiqmalarının tərkibinə təsiri;
11. Nitq hissələrində keçid prosesləri;
12. Say formalarının semantikası;
13. Müasir türk dillərində funksional-semantik sahə: taksis, temporallıq, aspektuallıq, lokativlik və s. Funksional-semantik sahə: 1) mərkəz; 2) periferiya;
14. Zərfin funksionallaşması. Zərfin sintaktik mövqeyi (pozisiyası);
15. Ədatın modal və praqmatik fikrin ifadəsində rolu.

Funksional morfologiyada aşağıdakı məsələləri bilmək tələb olunur:

1) Türk dillərinin morfoloji sisteminin əsas xüsusiyyətlərini (professional kompetensiya);
2) Funksional morfologiyanın əsas anlayış və kateqoriyalarını;
3) Funksional morfologiyanın qrammatik sistemdə yeri və rolunu.

K.Siqal funksional morfoloji vahidlərdən danışarkən göstərir ki, funksional qrammatika: 1) dinamik, psixolinqvistik sistem olub iki baza vahidini əhatə edir: qayda-qanun, norma, qrammatik qaydalar, prinsiplər; 2) əməliyyat [14, s.103].

Tədqiqat obyektimiz olan söyləmlərin spesifik funksiyaları vardır. Bu funksiyalar Azərbaycan dilinin funksional qrammatikası, sintaksisi haqqında ədəbiyyatların çatışmazlığı səbəbindən hələ də geniş və ətraflı şəkildə öyrənilməmişdir. Bu sahədə yalnız formal-qrammatik aspektlərdə ciddi tədqiqatlar aparılmışdır. Biz isə bu tədqiqatda əsas etibarı ilə söyləmlərin funksional fəaliyyət prosesini izləməyi qarşımıza məqsəd qoymuşuq. Söyləmlər dilin təbiətindən, quruluşundan asılı olaraq bir sıra funksional qruplara bölünür. Bunlar aşağıdakılardır:

1) nominativ və ya ümumi və xüsusi səciyyəli adlandırma funksiyası;
2) qrammatik-sintaktik funksiya;
3) kommunikativ-praqmatik funksiya;
4) psixolinqvistik funksiya;
5) mətnyaradıcı funksiya;
6) üslubi-semantik funksiya;
7) estetik funksiya;
8) məna və mənalandırma funksiyaları.

Söyləmin (söz birləşməsinin) tərəfləri yerini dəyişəndə funksional cəhət də dəyişir. Məsələn: Nəriman Həsənzadə: tariximizin taleyi, taleyimizin tarixi... (Bu, Nizami Cəfərovun xalq şairi N.Həsənzadə haqqında yazdığı məqaləyə qoyduğu başlıqdır).

## Nəticə / Conclusion

Beləliklə, məqalədə funksional qrammatika məsələləri əsas yer tutur. Dil və dil vahidlərinin, xüsusən də morfoloji vahidlərin funksiyaları nəzərdən keçirilir. Bəlli olur ki, funksiya "*forma-funksiya-anlayış*" üçlüyündən ibarətdir. Funksional qrammatikanın spesifikası dil vahidlərinin təsvirindən və onların mənaca (funksiyaca) şərhindən ibarətdir. Bu, ənənəvi nəzəriyyədən fərqlənir. Məqalədə, demək olar ki, dil vahidlərinin məna və funksiya münasibətləri təhlilə cəlb edilir, funksional səviyyədə semantik və məntiqi-qrammatik kateqoriyaların səciyyəvi cəhətləri xarakterizə olunur. Bu sahədə A.V.Bondarkonun, N.Y.Şvedovun, M.A.Şelyakinanın tədqiqatlarına toxunulur, nəzəriyyələrinə istinad olunur. A.V.Bondarkonun nəzəriyyəsi əsasında funksional qrammatikanın özünəməxsusluğunun meydana çıxmasında gerçəkləşən prinsipin "*funksiyadan vasitələrə*" sırasında olduğu təsdiqlənir [Бондарко А.В. Ленинград, 1983].

**İstifadə edilmiş ədəbiyyat / References**


1. Cahiers Ferdinand de Saussure. (1957). Geneve, p.25.
2. Гак В.Г. (1985). К типологии функциональных подходов к изучению языка. Проблемы функциональной грамматики. Москва, Наука.
3. Теория функциональной грамматики: Введение, аспектальность, временная локализованность, таксис. (1987). Ленинград, Наука.
4. Теория функциональной грамматики: Темпоральность, модальность. (1990). Ленинград, Наука.
5. Теория функциональной грамматики: Категории морфологии и синтаксиса в высказываниях. (2000). СПБ.: Наука.
6. Бондарко А.В. (1984). Функциональная грамматика. Ленинград, Наука.
7. Иванова И.П., Бурлакова В.В., Почепуов К.К. (1981). Теоретическая грамматика современного английского языка. Учебник. Москва, Высшая школа.
8. Гулыга Е.В., Шендельгс Э.И. (1969). Грамматико-лексические поле в современном немецком языке. Москва, Просвещение.
9. Musayev M.M. (2012). Türkoloji dilçilik. Bakı, Mütərcim.
10. Korkmaz Z. (2003). Türkiye Türkçesi Grameri (Şekil Bilgisi). Ankara, Türk Dil Kurumu Yayınları.
11. Hüseynzadə Ç. (2004). Azərbaycan dilində morfoloji norma. Bakı, Nurlan.
12. Kazımov İ. (2022). Türk dillərinin intensivlik qrammatikası. Bakı, Elm və təhsil.
13. Парамонова В.С. (2021). Особенности функционирования формы будущего и прошедшего времени в художественном тексте. Вестник народного хозяйства. Ун-т сер. 2. Языкознание, № 2.
14. Сигал К.А. (2012). Единицы функционального синтаксиса. Вестник Удмуртского университета, вып. 2.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 3 (277), 73-80
doi.org/10.48445/k6725-1606-2866-v

**Q R A M M A T İ K A**

# Morfologiya təlimində orfoqrafiya üzrə aparılan işlər

***Pəri Paşayeva***
Pedaqogika üzrə fəlsəfə doktoru, dosent, Azərbaycan dili və onun tədrisi texnologiyası kafedrası, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan.
E-mail:p.semsizsde@mail.ru
https://orcid.org/0000-0002-8332-3387

**XÜLASƏ**
Dil qaydalarının dərk oluna bilən qanunauyğunluqlar əsasında tədris olunması şagirdlərin idrak fəallığını, şüurluluğunu təmin etməklə yanaşı, qazanılan biliklərin təcrübi, tətbiqi istiqamətlərini, ünsiyyət imkanlarını dəqiqləşdirən sistemə çevirir. Dil sistemində fəaliyyət göstərən daxili qanunauyğunluqlar onu tənzimləyir və dilin mövcudluğunu təmin edir. Bu sistemin bir tərəfində ən kiçik dil vahidi olan *fonem* (mənalı səs), digər tərəfində isə dil vahidlərinin ən mükəmməl konstruksiyası olan *cümlə* dayanır. Dilin elmi mahiyyətinin qavranılmasında ardıcıllıq və varislik prinsipi gözlənilməklə onun düşünmə, öyrənmə və danışma vasitəsi olması diqqət mərkəzində saxlanılır. Məqalədə bu kimi məsələlər elmi əsasda şərh olunur.

**AÇAR SÖZLƏR**
dil qaydaları, morfoloji biliklər, orfoqrafiya, daxili qanunauyğunluqlar

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 05.08.2023
qəbul edilib: 11.09.2023

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO. 3, VOL. 277, 73-80
doi.org/10.48445/k6725-1606-2866-v



# Work on spelling in morphology training

***Pari Pashayeva***
Doctor of Philosophy in Pedagogy, Associate Professor, Department of Azerbaijani Language and its Teaching Technology, Azerbaijan State Pedagogical University. Azerbaijan. E-mail: p.semsizsde@mail.ru
https://orcid.org/0000-0002-8332-3387

**ABSTRACT**
The teaching of language rules on the basis of comprehensible regularities not only ensures the cognitive activity and awareness of students, but also turns the acquired knowledge into a system that clarifies the directions of experience, application, and communication opportunities. The internal regularities operating in the language system regulate it and ensure the existence of the language. On one side of this system is the phoneme, which is the smallest language unit (meaningful sound), and on the other side, the sentence, which is the most perfect construction of language units. In understanding the scientific nature of the language, the principle of consistency and inheritance is observed, and it is focused on the fact that it is a means of thinking, learning and speaking. In the article, such issues are explained on a scientific basis.

**KEYWORDS**
language rules, morphological knowledge, spelling, internal regularities

**ARTICLE HISTORY**
Received: 05.08.2023
Accepted: 11.09.2023

## Giriş / Introduction

Qüdrətli tərbiyə vasitəsi olan ana dilinin əsas məqsədi düzgün yazı və nitq vərdişləri formalaşdırmaqdır ki, dil qaydaları və normalarını lazımi səviyyədə mənimsəmədən bu məqsədə nail olmaq mümkün deyildir.

Artıq V-VII siniflərdə şagirdlərə verilən qrammatik biliklərin səviyyəsi ibtidai sinif mərhələsindən fərqlənir və mənimsədilən hər bir qayda, tərif nisbətən mürəkkəbləşdirilmiş səviyyədə, şagirdlərin yaş və düşüncə qabiliyyətinə əsasən uyğunlaşdırılmışdır. Dilin elmi mahiyyətinin qavranılmasında ardıcıllıq və varislik prinsipləri gözlənilməklə onun düşünmə, öyrənmə və danışma vasitəsi olması diqqət mərkəzində saxlanılır.

İbtidai təhsil pilləsində bu fənn vasitəsilə ifadəli və şüurlu oxu, düzgün yazı və şifahi nitq vərdişlərinə yiyələnən, nitqin leksik, fonetik, qrammatik və üslubi zənginliklərinə bələd olan, əməli cəhətdən zəruri dil qaydalarının mahiyyətinə varmağı bacaran şagirdlər orta məktəb pilləsində öz bilik, bacarıq və vərdişlərini genişləndirir, bununla da onlarda idrak fəaliyyəti, nitq bacarıqları daha da inkişaf edir, ana dilinə şüurlu məhəbbət və hörmət hissi formalaşır.

Bütöv bir sistem halında təbiət elmləri qədər dəqiq fəaliyyət mexanizminə malik olan dilin qrammatik qanun və qaydaları müəyyən dilçilik qanunauyğunluqları əsasında fəaliyyət göstərir.

Dil qaydalarının dərk oluna bilən qanunauyğunluqlar əsasında tədris olunması şagirdlərin idrak fəallığını, şüurluluğunu təmin etməklə yanaşı, qazanılan biliklərin təcrübi, tətbiqi istiqamətlərini, ünsiyyət imkanlarını dəqiqləşdirən sistemə çevirir. Müəllim dil qaydalarının mənimsənilməsinə ciddi yanaşmalı, elmi xarakterli məlumatlar verildikdə varislik və perspektivlik nəzərə alınmalıdır.

Dil sistemində fəaliyyət göstərən daxili qanunauyğunluqlar onu tənzimləyir və dilin mövcudluğunu təmin edir. Bu sistem daxilində hər bir bölmə və yarımbölmənin, hər bir dil vahidinin özünəməxsus vəzifəsi vardır. Səsin sözdə, sözün cümlədə birləşmə qanunlarını və bu zaman baş verən müxtəlif dil hadisələrinin səbəbini bilmədən dili elmi şəkildə öyrənmək, bütöv bir sistem kimi qavramaq mümkün olmaz.

Bölmələrdən, qaydalardan biri digəri üçün zəmin hazırlayır, gələcəkdə qavranılacaq mövzular üçün açar rolunu oynayır. Bu nöqteyi-nəzərdən fonetika, leksika, söz yaradıcılığına aid qaydalardan sonra morfologiyaya aid dil qaydalarının öyrənilməsi bir dil qanunauyğunluğudur ki, bu da sintaksisə aid dil qaydalarının öyrənilməsi üçün zəmin rolunda çıxış edir.

Morfologiyaya aid dil qaydalarının sistemli şəkildə öyrənilməsi həm mənimsənilmiş dil qaydalarının xatırlanmasına, həm bölmənin özünə aid nəzəri biliklərin elmi əsaslarla qavranılmasına, həm də gələcəkdə sintaksisə aid qaydaların səmərəli mənimsənilməsinə xidmət edəcəkdir.

Morfologiyaya aid dil qaydalarının və ilkin anlayışların mənimsədilməsinə hələ ibtidai siniflərdən başlanılır və məhz həmin mərhələdə dərinləşdirilmiş məlumatların verilməsi üçün zəmin yaradılır. Artıq təhsilin bu mərhələsində şagirdlər dil qaydaları bəhsini öyrənərkən dilin morfoloji quruluşu ilə bağlı minimum bilikləri sadə, aydın qayda və şərhlər formasında mənimsəyir, vacib olan nitq bacarıqlarına yiyələnərək onu təcrübədə tətbiq edə bilirlər.

Morfologiya təlimi o zaman daha səmərəli və effektli nəticələr verə bilər ki, onun tədrisi digər bölmələrlə əlaqələndirilsin. Müəllim morfologiya ilə bağlı mövzuları tədris edərkən onları mümkün qədər həm morfologiyadan əvvəl keçilmiş fonetika və leksikologiya ilə, həm də ondan sonra tədris ediləcək sintaksis bəhsi ilə əlaqələndirməyə çalışmalıdır. Daha dəqiq desək, morfologiya bəhsi fonetika və leksikologiya ilə əlaqələndirilməli, sintaksisin tədrisi üçün zəmin yaratmalıdır. Əlaqə dedikdə, sadəcə olaraq hər hansı mövzu ilə bu gün keçiləcək bir mövzunun süni qarşılaşdırılması nəzərdə tutulmamalıdır. Əlaqəsi, oxşarlığı olan mövzuların bu əlaqə və oxşarlıqlarından istifadə etməklə həm qazanılan bilik və bacarıqlar yada salınmalı, həm də yeniləri şüurlu şəkildə mənimsədilməlidir.

Xüsusilə orfoepiya və orfoqrafiya ilə bağlı məlumatlar verərkən və ya praktik iş apararkən fonetikasız keçinmək mümkün deyildir. Şəkilçilərdə səsartımı, səsdüşümü, səsdəyişməsi hadisələrini – fonetik hadisə və qanunları nəzərə almadan, onları yada salmadan mənimsəməyə cəhd göstərmək mənasızdır.

Sözün qrammatik mənalarını şagirdlərə mənimsədərkən leksik və qrammatik məna haqqında məlumatı, ayrı-ayrı nitq hissələrini keçərkən sözlərin leksik mənalarını yada salmamaq mümkün deyildir. İsim və sifətləri öyrədərkən omonim, sinonim, antonimlər kimi söz qrupları haqqında şagirdlərin bilik və bacarıqlarını yada salmamaq olmaz. Frazeoloji vahidlərə dair bilik və bacarıqları yada salmadan mürəkkəb feillərin hüdudlarını təyin etmək mümkün deyildir. Bu kimi müqayisələr əlaqə xatirinə deyil, fəndaxili əlaqə prinsipinin tələbləri ilə bağlıdır. Müəllim bu zərurəti hələ dərsə hazırlaşarkən müəyyənləşdirməli və belə müqayisələrə hazır olmalıdır.

Morfologiya təlimi zamanı sintaksis üçün zəmin yaratmağa çalışmaq həm gələcəkdə sintaksisin tədrisi işini asanlaşdırır, həm də morfoloji məfhumlarla sintaktik məfhumların dəqiqliklə ayrılması üçün elmi əsas verir.

Ona görə də morfologiyanın tədrisi zamanı bir sıra morfoloji məfhumların sintaktik məfhumlarla qarşılaşdırılması morfoloji məfhumların özünün dəqiq mənimsədilməsinə kömək etmiş olur. Bu cəhətdən nitq hissələrini tədris edərkən onların cümlədəki rolunu da öyrətmək olduqca zəruridir. Tədris prosesində yalnız əsas deyil, o cümlədən köməkçi nitq hissələrinin də cümlədə rolunun öyrədilməsinə xüsusi diqqət yetirilməlidir. Şagird ismin, sifətin və digər nitq hissələrinin cümlədə rolunu öyrənməklə cümlə üzvü və nitq hissəsi məfhumlarının oxşar və fərqli cəhətlərini dəqiq mənimsəyir, onları bir-birindən fərqləndirə bilir. Lakin təkcə morfologiya tədrisində nitq hissələrinin cümlədəki rolunu öyrənməklə buna nail olmaq mümkün deyildir. Sintaksisin tədrisi zamanı isə bütün cümlə üzvlərinin ifadə vasitələri öyrədilməklə morfologiya bəhsində başlanmış iş tamamlanır. Bu cəhətdən nitq hissələrinin cümlədə rolunu öyrətməyə xüsusi diqqət yetirilməlidir. Məsələn, sifət həmişə təyin olmur, çünki sifət cümlədə isimləşərək başqa cümlə üzvü də ola bilər. Bir isim başqa bir ismin əvvəlində işlənib onun təyini ola bilsə də, isimliyindən çıxmır. Belə məsələlərə diqqət yetirdikdə şagirdlər morfoloji və sintaktik anlayışları, morfoloji və sintaktik sualları fərqləndirməyi bacarırlar.

Morfologiya üzrə veriləcək bilik və bacarıqlar bir sıra ədəbi dil normalarının mənimsədilməsində mühüm rola malikdir. Azərbaycan dili müəllimi şagirdlərin nitq inkişafı vərdişlərinə yiyələnməsində morfologiya təliminin bu imkanlarından istifadə etməyi bacarmalıdır.

İlk növbədə, qrammatik anlayışların şüurlu şəkildə öyrədilməsi şagirdlərin öz nitqlərində ümumi qrammatik normalara yiyələnməsinə böyük kömək etmiş olur. Sözü düzgün hallandırmağı, feili zamana görə düzgün dəyişməyi bacarmayan şagird, şübhəsiz, öz nitqində adi qrammatik normaları belə gözləyə bilmədiyindən normal nitq vərdişlərinə yiyələnə bilməz. Buna görə də müəllim şagirdlərə qrammatik məfhum və anlayışlar barədə ən zəruri bilikləri verməklə yanaşı, onların ayrı-ayrı bölmələr üzrə proqramda konkret olaraq göstərilmiş bacarıqlara yiyələnməsi qayğısına da qalmalıdır.

Şagirdlərin tələffüz normalarına yiyələnməsində də morfologiya təlimi mühüm rol oynaya bilər. Bu cəhətdən orfoepik vərdişlərin qazanılması üzrə fonetika bəhsində başlanmış iş morfologiya təlimində tamamlanır. Bütün morfemlərin deyiliş qaydalarının şagirdlərə öyrədilməsi morfologiya təliminin qarşısında qoyulmuş əsas vəzifələrdən biri olmalıdır. Məsələn, müəllim məsdər formasını əmələ gətirən -maq$^2$ şəkilçisini şagirdlərə çatdırmaqla bərabər, onun düzgün deyiliş qaydalarını da öyrətməlidir. Şagirdlərə **q** samitinin [**ğ**], **k** samitinin isə [**y**] kimi tələffüz edilməli

olduğunu mənimsətmək də həmçinin zəruridir. Bütün morfemlərlə bağlı tələffüz qaydaları üzrə iş aparmaq müəllimlərin ən ümdə vəzifəsidir.

Şagirdlərin orfoqrafik normalara yiyələnməsində də morfologiya təlimi mühüm rol oynayır. Bütün morfemlərin deyilişi ilə müvazi surətdə yazılışı da praktik olaraq öyrədilməlidir. Məsələn, müəllim -maq$^2$ məsdər şəkilçisinin tələffüzü ilə bərabər, yazılışını da öyrətməlidir. Şagirdlərə öyrədilir ki, -maq$^2$ şəkilçisinə sait əlavə edildikdə **q** samiti **ğ, k** samiti isə **y** samitinə çevrilir və yazılır. Morfologiya bəhsində bütün sözdüzəldici və sözdəyişdirici şəkilçiləri öyrədərkən bunların tələffüz və yazılış qaydaları üzərində praktik iş aparmaq müəllimin əsas vəzifəsidir. Bu isə onların orfoepik və orfoqrafik normalara yiyələnməsində mühüm rol oynayır.

Bir sıra üslubi normaların mənimsədilməsində, şagirdlərin nitqinin üslubca zənginləşdirilməsində də morfologiya təlimi mühüm rol oynaya bilər. Müəllim yeri gəldikcə üslubi normaların mənimsədilməsi üzərində də konkret işlər aparmalıdır. Məsələn, müəllim ismin hallarını tədris edərkən, eyni bir fikrin bir neçə formada verilməsinin mümkünlüyü üzrə iş apararkən, feilin bir zaman forması ilə başqa bir zamana aid olan işi ifadə edərkən şagirdlər üslub normalarına yiyələnir və nitqə həssas üslubi münasibət bəsləyə bilirlər.

Orta məktəbdə ana dili tədrisinin başlıca məqsədi şagirdlərə yüksək nitq vərdişləri aşılamaq, informasiya mübadiləsi formalarını öyrətmək, ünsiyyətin müxtəlif məqamlarında fikirlərini yazılı və şifahi olaraq sərbəst, yaradıcı, tənqidi və məntiqi təfəkkürə əsaslanmaqla ifadə etmək bacarığına yiyələndirməyi təmin etməkdən ibarətdir. “Müəllim nə edir?”, “Şagird nə edir?” formasında tədris-təlim fəaliyyətini qurmadan, motivasiya, şüurlu “elmi münaqişə” ocaqları yaratmadan, şagirdə öz ideyasını, fərziyəsini irəli sürmək, qənaətlərini götür-qoy etmək imkanı vermədən müasir dərsin tələblərinə cavab vermək müşkül məsələdir.

Təbii ki, ayrı-ayrı nitq hissələrinin tədrisində orfoqrafiya tərtibinin başlıca prinsiplərindən biri olan morfoloji prinsipə daha çox diqqət ayrılmalıdır. Bu prinsipin mahiyyəti hər bir sözün parçalana bilən mənalı hissələrinin sabit şəkildə ifadəsini təmin etməklə müəyyənləşir. Morfoloji prinsip sözlərin vahid tələffüz, vahid yazılış qaydalarını nizama salır. Məsələn, biz tələffüzdə [-nan$^2$] şəkilçi formasına rast gəlirik: [mənnən], [atamnan] və s. Belə halda çıxışlıq hal şəkilçisi iki cür qəbul edilməlidir: -dan$^2$ və -nan$^2$. Halbuki belə bir sabit qayda qəbul edilib ki, ismin hal şəkilçisi -dan$^2$ -m, -n samitləri ilə bitən sözlərdən sonra [-nan$^2$] kimi tələffüz olunur. Morfoloji prinsip də sözün tələffüzünü əsas tutur. Yaxud sonu -a$^2$ saitləri ilə bitən çoxhecalı sözlərə əvvəlində bitişdirici *y* samiti olan şəkilçi qoşulduqda ahəng

qanununa uyğun olaraq həmin saitlər [-ı, -i, -u, -ü] səslərindən birinə çevrilərək tələffüz olunur: meşəyə – [meşiyə], anaya – [anıya], qayaya – [qayıya] və s.

Deməli, ismin hallarının tədrisi zamanı bu orfoqrafik və orfoepik qaydalara toxunmadan keçmək mümkün deyildir. Məktəb təcrübəsində morfoloji kateqoriyaların tədrisində orfoqrafiya qaydalarının tətbiqinin gözlənilməsini təmin etmək üçün bir çox üsul və vasitələr mövcuddur. Bu üsullardan qısaca bəhs edək.

Əlbəttə, bu təhlil növündən səmərəli istifadə etmək üçün, ilk növbədə fonetik-orfoepik təhlil nümunələrini düzgün qurmaq lazımdır. Məhz fonetik-orfoepik təhlil düzgün yazı və tələffüz qaydalarının bünövrəsi, təməl daşıdır. Şagirdlər orfoepiya-orfoqrafiya normalarını paralel şəkildə təhlil edə bilməsə, morfoloji təhlildə çətinliklərlə qarşılaşacaqlar. *Morfoloji təhlil* dedikdə, sözün həm tərkibinə, həm də nitq hissələrinə görə təhlili nəzərdə tutulur.

Sözün tərkibinə görə təhlili zamanı sözün tərkib hissələri, leksik (sözdüzəldici), qrammatik (sözdəyişdirici) şəkilçilər, sözün başlanğıc forması dəqiq mənimsədilməli, tərkibə görə təhlil mövcud şərti işarələrlə aparılmalıdır. Bu zaman kök, sözdüzəldici və sözdəyişdirici şəkilçi işarələrindən istifadə olunmalıdır.

## Nəticə / Conclusion

Nəticə olaraq deyə bilərik ki, morfoloji təhlil zamanı söz və şəkilçinin tələffüzü diqqət mərkəzində saxlanılmalıdır. Məsələn, əgər “zənbillərdən” sözü təhlil olunursa, söz [zəmbillərdən] kimi deyilib təhlil edilməlidir. Sözləri tələffüzə əsaslanmaqla təhlil etdikdə şivə və dialektlərdən gələn qüsurları da aradan qaldırmaq asan olur. Məsələn, *gələrəm, baxeram, görerəm, baxsox* və s. sözlərin həm qüsurlu, həm də düzgün tələffüz formaları lövhəyə yazılır, şagird aparılan təhlil zamanı hiss edir ki, fərq indiki zaman şəkilçisinin deyilişindədir.

Morfoloji təhlillər tam və natamam formada aparılır. Müxtəlif nitq hissələri, onların ayrı-ayrı kateqoriyaları ilə bağlı aparılan təhlillər natamam, bütün nitq hissələri və kateqoriyalar üzrə aparılan təhlillər tam təhlil nümunəsi hesab edilir. Məsələn, ismin halı ilə bağlı aparılan təhlil natamam təhlil nümunəsi kimi qəbul edilə bilər. Müəllim isimlə bağlı tam təhlil aparmaq istəyirsə, ilk növbədə, onların konkret və mücərrədliyi, quruluşca növləri, ümumi və xüsusiliyi, mənsubiyyəti, şəxsə görə dəyişməsi və halları ardıcıllıqla mənimsədilməlidir.

Belə təhlilləri interaktiv təlimin imkanları çərçivəsində aparmaq şagirdləri daha müstəqil düşünməyə, fəallığa cəlb edər. Məsələn, müəyyən şeir parçasını ayrı-ayrı qruplara və ya cütlərə verib mövzu ilə bağlı orfoqrafik baxımdan xarakterik sözləri

təyin edib yazılış qaydasını müəyyənləşdirmək tələb oluna bilər. Bu qayda təlimdə əməkdaşlığa, fikir mübadiləsinə, qarşılıqlı etimada şərait yaradır.

Morfologiya üzrə aparılan təhlillər, praktik məşğələlər şagirdlərin müstəqil fəaliyyətinə geniş imkan yaratmaqla, onların düzgün tələffüz və yazı vərdişlərinə yiyələnməsində mühüm əhəmiyyətə malikdir.

**İstifadə edilmiş ədəbiyyat / References**

1. Abdullayeva N.S. (1999). Müasir Azərbaycan dilinin morfologiyası. Bakı, ADPU-nun nəşri. 87 s.
2. Azərbaycan dili orfoqrafiyasının aktual problemləri. (1987). Bakı, ADU-nun nəşri. 224 s.
3. Balıyev H.B. (2003). Ana dilinin tədrisi metodikası. Bakı, ADPU-nun nəşri. 425 s.
4. Balıyev H.B. (2003). Orta məktəbdə Azərbaycan dilinin tədrisi metodikası. Bakı, 425 s.
5. Balıyev H., Balıyev A. (2014). Azərbaycan dilinin tədrisi metodikası. Bakı, 380 s.
6. Bayramov İ.O. (1983). Azərbaycan dili morfologiyası tədrisinin elmi-metodik əsasları. Bakı, Maarif. 218 s.
7. Cəfərova N.B. (2016). İbtidai siniflərdə Azərbaycan dilinin tədrisi metodikası, I hissə. Bakı, ADPU. 403 s.
8. Cəfərova N.B. (2022). İbtidai siniflərdə Azərbaycan dilinin tədrisi metodikası, II hissə. Bakı, ADPU. 430 s.
9. Seyidov Y.M. (2003). Azərbaycan dilinin qrammatikası (morfologiya). Bakı, BDU-nun nəşri. 374 s.
10. Azərbaycan dili. (2009). Müəllim üçün metodik vəsait. Bakı, Altun kitab. 224 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 3 (277), 81-96
doi.org/10.48445/z6878-4819-3959-s

AZƏRBAYCAN ƏDƏBİYYATI

# Cəfər Cabbarlı dramaturgiyasında müəllif dünyagörüşü və tarixilik

***Təyyar Salamoğlu***
Filologiya elmləri doktoru, professor, Əməkdar müəllim, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan. E-mail: tayyarsalamoglu@gmail.com
https://orcid.org/0000-0001-8364-1580

**XÜLASƏ**
Məqalədə Cabbarlı dramaturgiyasının ikinci dövrü müəllif dünyagörüşü və tarixilik kontekstində əsas tədqiqat obyekti kimi araşdırılır. Sovet rejiminin ədəbiyyat siyasəti qısa xülasə edilir, rejimin sənətkar üzərinə basqıları və onun dünyagörüşündə bu basqılardan irəli gələn çevrilişin mahiyyəti üzərində dayanılır, "Oqtay Eloğlu" Cabbarlı dünyagörüşünün siyasi rejimə müqaviməti kontekstində təhlil edilir. Məqalədə həmçinin həbsxana həyatının sənətkar dünyagörüşündə metamorfozalara yol açması "Od gəlini" və ondan sonra yazılan pyeslərin təhlili ilə əsaslandırılır, "Od gəlini"ndəki "azad cəmiyyət"in əxlaqi sapıntılarının metaforası açılır.

**AÇAR SÖZLƏR**
ədəbiyyat, metamorfoza, milli birlik, dini inanc, sosialist realizmi

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 22.07.2023
qəbul edilib: 31.08.2023

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO. 3, VOL. 277, 81-96
doi.org/10.48445/z6878-4819-3959-s



# Author's worldiew and historicity in the dramaturgy of Jafar Jabbarli

***Tayyar Salamoghlu***
Doctor of Philology Sciences, Professor, Honorable teacher, Azerbaijan State Pedagogical University. Azerbaijan. E-mail: tayyarsalamoglu@gmail.com
https://orcid.org/0000-0001-8364-1580

**ABSTRACT**
In the article, the second period of Jabbarli's dramaturgy is examined as the main research object in the context of the author's outlook and historicity. The literary policy of the Soviet regime is briefly summarized, the repressions of the regime on the artist and the essence of the revolution resulting from these repressions in his worldview are emphasized, "Ogtay Eloghlu" Jabbarli's worldview is analyzed in the context of resistance to the political regime. The article also substantiates the fact that prison life leads to metamorphoses in the artist's worldview by analyzing "Od galini" and the plays written after it, and the metaphor of the moral deviations of the "free society" in "Od galini" is revealed.

**KEYWORDS**
literature,
metamorphosis,
national unity,
religious belief,
socialist realism

**ARTICLE HISTORY**
Received: 22.07.2023
Accepted: 31.08.2023

## Giriş / Introduction

Artıq müasir ədəbiyyatşünaslıq təsdiq edir ki, 20-ci illərin birinci yarısına qədər estetik düşüncə milli ədəbi ənənənin davamı kimi meydana çıxırdı. Həmin dövrün ikinci yarısından başlayaraq sovet rejiminin ədəbiyyat siyasəti milli-estetik fikri öz tarixi ənənəsindən uzaqlaşdırır, heç bir ədəbi ənənəyə söykənməyən proletar ədəbiyyatı yaratmaq ideyasını zorla şüurlara yeridirdi. Sovet rejiminin siyasi xəttində dinə inkarçı və tənqidi münasibət önə keçir, ateizm təbliğatı qüvvətlənirdi. İctimai həyatda özünə yer alan siyasi xətt ədəbi düşüncəyə də hakim kəsilirdi. Artıq yaradıcı insanlara büsbütün aydın olurdu ki, "zülm və istismar dünyasının inqilabi yolla dəyişdirilməsi, azad və şüurlu insanların kommunizm cəmiyyətini qurması haqqında elm olan marksizm-leninizm dini və dini ideologiyanı rədd edir". Bütövlükdə ictimai-siyasi, ədəbi-mədəni mühitə, yaradıcı insanlara təlqin edilirdi ki, "dinə qarşı mübarizə aparmaq, bütün materializmin və deməli, marksizmin əlifbasıdır" [7, s.5]. 20-ci illərin ortalarından sonra "marksizm əlifbası" cəmiyyəti başdan-başa ateistləşdirməyə xidmət edirdi.

**Siyasi rejimin basqıları. Cabbarlı dünyagörüşündə çevriliş**

C.Cabbarlının dramaturji yaradıcılığında "Oqtay Eloğlu"ndan sonra "Od gəlini" pyesi gəlir. "Od gəlini"ndən başlayaraq Cabbarlı artıq tədricən də olsa, sovet siyasi rejiminin ideoloji prinsiplərinin təsiri altında idi. Təpədən-dırnağa milli və ideoloji məzmun bu əsərdə tam bir vəhdət yaradır. Düşünürük ki, "Od gəlini" müstəmləkəçiliyə qarşı mübarizə ideyasını gerçəkləşdirən milli məzmunlu bir əsərdir. Bu baxımdan pyes məzmunu ilə sənətkarın "Ulduz", "Ədirnə fəthi", "Oqtay Eloğlu" əsərlərindəki yaradıcılıq ənənəsini davam etdirir. Lakin müəllif dünyagörüşündə İslam dininə yanaşma, onun milli həyatda oynadığı rola verilən bədii təfsirlər baxımından "Od gəlini" Cabbarlının bu əsərə qədərki yaradıcılıq ənənəsindən doğulmur. Tənqid əsərdən belə bir nəticə çıxarır: "Od gəlini" İslam dininin Azərbaycan xalqının tarixində tamamilə mürtəce rol oynadığını göstərən qüvvətli bir əsərdir" [1, s.100]. Həmin elmi mövqe ədəbiyyatşünaslığın sonrakı mərhələlərində də davam etdirilir. Professor Y.Qarayev yazır: "Bizim klassik faciələrdə əsas ənənəvi fəlsəfi konflikt din və dini təəssübkeşlik əleyhinə mübarizə ilə bağlı idi. "Od gəlini"ndə bu tragik motiv yüksək ideya-bədii zirvələrə çatırdı... Dinə qarşı ənənəvi inkarçı və üsyançı qəhrəman burada əsil ateistə çevrilirdi. ... "Od gəlini"ndə Elxan bütün irqi, dini, milli ayrı-seçkilikləri bir tərəfə atır, mübarizələrin yalnız bir növünü qəbul edirdi – sinfi döyüşləri..." [5, s.223]. Bu həqiqətən belədir. Lakin bizim düşüncəmizdə belə bir suallar doğur: Cabbarlının dünyagörüşündə müşahidə edilən

bu “çevrilmə”nin səbəbi nədir? Bu “çevrilmə” müasirliyin ifadəsi kimi səslənə bilirmi?

Fikrimizcə, Cabbarlının dünyagörüşünün irəliyə doğru hərəkəti, qəhrəmanının “əsil inqilabçıya” çevrilməsi prosesi kimi ədəbiyyatşünaslığın təqdir etdiyi bu cəhətlər sənətkarın həqiqi dünyagörüşünün mahiyyətinin ifadəsi kimi götürülə bilməz [5, s.223]. “Od gəlini”nə qədər islami düşüncəni milli varlığın tarixi və müasir xarakter keyfiyyəti kimi təqdim edən Cabbarlının əsərdə din düşməninə çevrilməsi, xalis ateist mövqedən çıxışı arasındakı fərq əvvəlki əsərlərlə bu faciənin yazılmasını şərtləndirən ictimai-siyasi zaman arasındakı fərqdən doğur. Cabbarlının “Od gəlini”nə qədərki əsərlərindən yalnız “Oqtay Eloğlu” istisna olmaqla qalanlarının bir qismi çar üsuli-idarəsi dövründə, bir qismi isə ADR illərində yazılmışdır. Sovet rejimi illərində yazılmasına baxmayaraq, “Oqtay Eloğlu”da Cabbarlı öz dini dünyagörüşünə sədaqətini qoruyub saxlamış, eyni zamanda Azərbaycan xalqının sosial varlığının tərkib hissəsinə çevrilən İslam dinini müzakirə predmetinə çevirmək fikrinə düşməmişdir. Nə üçün? Bunun səbəbini hər iki əsərin (“Oqtay Eloğlu” və “Od gəlini”) meydanaçıxma tarixləri arasındakı siyasi şəraitin fərqində axtarmaq lazımdır. Elxanın dilindən səslənən “get məni asacaq din naşirlərinə söylə ki, mən deyirəm: yoxdur Allah, yoxdur Allah! Bu dinlərin hamısı güclülərin mirzağını daldalamaq, bu Allahu-Əkbərlər, bu gurultulu canlar gücsüzlərin iniltilərini, fəryadlarını örtmək, boğmaq, susdurmaq üçündür. Məndən başqa mənim xaricimdə özgə bir Allah yoxdur” [3, s.316]. Bu gün biz “Od gəlini”nin baş qəhrəmanının dilindən səslənən və əsərin ideya istiqamətlərindən birini təyin edən bu sözləri Cabbarlı dramaturgiyasının müasirliyini şərtləndirən cəhətlərdən biri kimi qəbul edə bilmərik. Ən azı ona görə ki, ateist düşüncə milli mənəviyyatımızı ifadə etmir. Digər tərəfdən, müəllif ideyasının ifadəsi kimi görünən bu sözlər və bütövlükdə Elxanın dinə inkarçı münasibəti, İslam dininə kəskin tənqidi yanaşmaları C.Cabbarlının iç dünyasından qopub gələn inam deyildi. Cabbarlı bu sözləri Elxanın dilindən səsləndirərkən əsərə siyasi rejimin ateist mövqeyini gətirmişdir. Doğrudur, əsərinin mövzusu da, bədii təsvir obyektinə çevrilən tarixi gerçəklik də bu və ya digər dərəcədə Elxanın dinə inkarçı mövqedən yanaşmasına əsas verirdi. Müstəqillik dövründə yazılmış “Azərbaycan tarixi” kitablarında da Elxanın prototipi kimi götürülən Babəkin rəhbərlik etdiyi Xürrəmilər hərəkatının “Şərqdə İslam dini, feodal zülmü və ən başlıcası isə ərəb əsarətinə qarşı çevrilməsi” tendensiyası vurğulanır. Yəni Elxanın dinə qarşı düşmən mövqedən çıxış etməsinin müəyyən tarixi əsası var. Lakin məsələ tarixi həqiqətin bədii həqiqətə çevrilməsində tarixiliyin qorunmasından getmir. Burada, məsələ, ilk növbədə, Cabbarlının milli varlığın müstəmləkəçi rejimə qarşı mübarizəsi ideyasını

gerçəkləşdirmək məqsədi ilə nə üçün məhz "Xürrəmilər hərəkatı" mövzusunu seçməsindən gedir. İkinci tərəfdən, o, nə üçün "ən başlıcası ərəb əsarətinə qarşı çevrilmiş" hərəkatı təsvir edərkən dinə düşmən münasibəti obyektivə geniş planda, daha qatı bir mövqe ilə gətirirdi? Fikrimizcə, "Od gəlini"nin bu ideya xətti tarixi həqiqətlərdən çox, siyasi-tarixi şəraitin diktələri ilə əsərə gətirilir, yazıçı qələminin bütün gücü ilə təqdim edilirdi. Elxanın qurmaq istədiyi azad cəmiyyətdə – "bütün qanunların heçliyindən" yaranan cəmiyyətdə qadın-kişi münasibətləri bu prinsiplərə söykənir: "Sənin daimi bir arvadın ola bilməz. Mən quru daşlara, cansız şeylərə, dilsiz heyvanlara belə fərdlərin yiyəlik haqqını qəbul etməzkən, insan üzərinə insan yiyəliyini sormaq gülüncdür... Həyatın mütəmadi yürüşlərində hər hərəkət bir təkamül, hər dəyişiklik bir duyğu və hər duyğu bir dilək doğururkən, daimi nigahlardan danışmaq – həyatın axınını saxlamaq deməkdir. Bu gün səninlə olacaq qadın, yarın istərsə, başqası ilə ola bilər" [3, s.303].

Elxan uca səslə elan edir ki, onun qurmaq istədiyi "bütün bəşəriyyət üçün örnək ola biləcək bir ölkə"də "tənasül heç bir qanun altında gizli olmayacaq, əsas: azad könüllərin uyuşması və usanması olacaqdır. İstəyənlər ər-arvad, istəməyənlər bacı-qardaş olacaqlar" [3, s.325].

Elxanın bu fikirləri tarixi gerçəkliyin, başqa sözlə, Xürrəmilər hərəkatı üçün tarixi mənbələrin tam təsdiq etdiyi bir həqiqət deyildir. Tarixi araşdırmalar göstərir ki, "yaxın qohumla evlənmək", "haramın nə olduğunu bilməmək", "şərabı, ümumiyyətlə insana nəşə və zövq verən hər şeyi faydalı hesab etmək" kimi qaydalar orta əsr mənbələrində özünə yer tapan, lakin daha çox xürrəmilərə düşmən münasibətdən meydana çıxan mövqelərdir [2, s.259]. "Azərbaycan tarixi" kitablarında bu xüsusiyyətlərin xürrəmilərə aid edilməsi tam təsdiq olunmur. Halbuki "Od gəlini"ndə qadın-kişi münasibətləri daha anarxist bir səviyyədə təqdim olunur və Elxanın düşüncəsində bu istiqamətdə yer alan fikirlər bütövlükdə tarixin sözü, səsi kimi qəbul edilə bilməz. Elxanın bu mövqeyi tarixin sözü kimi təqdim edilsə də, orada əsərin yazıldığı dövrdə siyasi rejimin ailəyə münasibətinin bəzi konturları aşkar görünməkdədir. Aşkar görünür ki, Cabbarlı ailə münasibətləri ilə bağlı Elxanın düşüncələrində tarixi müasirləşdirmək yolunu tutmağa məcbur olur. Sovet rejiminin qadını ailədən çıxarıb dəzgah arxasına keçirmək siyasəti, bu siyasətdə qadın azadlığına anarxist baxışlar, ailəyə münasibətin mental qanunlarının gözdən salınması onu təkcə işçi qüvvəsinə çevirmək məqsədi yox, həm də sovet əxlaq siyasətinə uyğunlaşdırmaq məqsədi daşımışdır. Son nəticədə isə bu, sovet rejiminin müstəmləkə siyasətinin qurbanına çevrilmiş xalqları milli tarixi ənənələrindən uzaqlaşdırıb "sovet xalqı" yaratmaq düşüncəsinə hesablanmışdı. "Od gəlini"

qəhrəmanının tarixin etibarlı mənbələrilə təsdiq olunmayan "həqiqətləri"ni uca səslə dilə gətirməsinin ideoloji əsasları bununla müəyyən olunur. Elxanın ailə, əxlaq məsələlərində ifrat anarxist mövqeyinin daha çox tarixin həqiqətlərindən qaynaqlanmadığını, düşüncəsində sovet rejiminin diktələri ilə yer aldığını sübut edən bir cəhət də odur ki, Cabbarlı IX əsr qəhrəmanının fikirlərini "Sevil" pyesində özünün müasiri olan qadın qəhrəmanın dilindən səsləndirmişdir. Sevilin yazdığı "Azərbaycan qadınının azadlıq yolu" kitabında məsələ belə qoyulur: "Azərbaycan qadınlarının ən böyük düşmənlərindən biri də namus keşikçisi olmalarıdır. Kişi istədiyini və bir neçəsini birdən əldə edə bilər, qadın isə ikincisinə göz ucuyla belə baxa bilməz. Bu, kişi üçün bir nadinclik, qadın üçün isə namussuzluq sayıla bilər. Halbuki hər ikisinin təşəbbüsünü doğuran eyni fizioloji hadisədir" [4, s.45]. Məhz "eyni fizioloji hadisə"nin tələbi kimi Sevil düşünür ki, "mən indi boynumu kişilərin qolları arasında, bu mərhəmət boyunduruğuna, bu dəmir orbuclara, bu çəlik məngənələrinə keçirə bilmərəm" [4, s.53]. Sevilin mühakimələri Elxanın "orada tənasül heç bir qanun altında gizli olmayacaq, əsas: azad könüllərin uyuşması və usanması olacaqdır. İstəyənlər ər-arvad, istəməyənlər bacı-qardaş olacaqdır" sözlərinin fəlsəfəsinə söykənir və onun məntiqi davamıdır.

**Bədii düşüncə ateist rejimin təlqinləri ilə üz-üzə**

"Od gəlini"ndə IX əsrin tarixi reallığı kimi əsərə gətirilən dinə inkarçı münasibət məhz Cabbarlının sovet dövründə yazdığı və mövzusu müasir həyatdan götürülən pyeslərinin leytmotivinə çevrilir, həmin əsərlər arasındakı ideya, motiv səsləşməsi onların ateist siyasi rejimdə yaranması haqqında düşüncələrə stimul verir. Sevil öz əvvəlki təbii xarakterində milli varlığın qadın təbiətini təcəssüm etdirdiyi məqamda əri "Allahın kölgəsi" hesab edir. Bu cür düşüncə tərzi qadının milli tarixi xarakterini daha təbii və səmimi şəkildə ifadə edir. Onun bu fikirlərinə əks mövqedən çıxış edən Gülüş isə deyir: "Boş sözdür, nə Allah var, nə də kölgəsi". Gülüşün bu sözləri qadının milli xarakterinin ifadəsi kimi səslənmir, sovet rejimində qadına verilən rolun ifası kimi kifayət qədər qeyri-təbii təsir bağışlayır.

Cabbarlının Sevili öz tarixi xarakterindən, inam və inancından uzaqlaşdırmaq, ailə mühitindən qopararaq işə göndərmək cəhdi Azərbaycan qadınlığının təbii inkişaf yolu kimi yox, sosrealizmin qəhrəmanını "inqilabi inkişafda" göstərmək tələbindən irəli gəlir. Bu, həmçinin obrazı öz xarakterindən çıxarmaq, onun xarakterinə yad keyfiyyətlər calamaq məcburiyyəti kimi meydana çıxır.

"Sevil" pyesinin və bu ruhda yazılmış digər əsərlərin mühitə ciddi təsiri ədəbiyyatşünaslıqda əsərin ideya-bədii qüvvətliliyinin nəticəsi kimi izah olunmuşdur. Ədəbiyyatşünaslığın pyesə verdiyi qiymətdə unudulan cəhət nədir? Əsərdə Sevilin

çadrasını atması, ailə həyatını tərk edib üzünü fabrikə tutması siyasi rejim, ictimai quruluş tərəfindən dəstəklənən bir hadisədir. Qadının öz azadlığına, təkamül yoluna qovuşmasında Sevilə verilən rol siyasi rejimin qadın siyasətinin nəticəsi kimi əsərə daxil olur. İctimai həyatda qəhrəmanın hərəkətinin birmənalı dəstəklənməsi və güclü təbliği bir çox hallarda Azərbaycan qadınının bu təsirin altına düşməsinə səbəb olmuşdur. Ona görə də sovet ədəbiyyatşünaslığında Sevilin "inkişaf yolu" Azərbaycan qadınının inkişaf yolu kimi ümumiləşdirilsə də, əslində bu, reallığın yox, ideologiyanın bədii əsərdə təcəssüm tapmasından başqa bir şey deyildir.

Sevilin ictimai həyata gedən yolunun davamı "Almaz" pyesindəki Almaz obrazında meydana çıxır. Bu əsərdəki Yaxşı obrazı milli qadın xarakterinin təcəssümü baxımından Sevilin, əgər belə demək mümkünsə, sovetləşmədən əvvəlki xarakterini ifadə edir və tamamlayır. Bu qadının, əlbəttə, yaşayış çətinlikləri, ailədə qarşılaşdığı ciddi problemləri var, lakin o, Azərbaycan qadınının tarixi xarakterini ifadə edir və Cabbarlı bu obrazı dövrünün milli xarakterində olduqca mükəmməl və canlı yaratmışdır. Əri "Allahın kölgəsi" hesab edən Sevil kimi Yaxşı da hesab edir ki, "ər bir, Allah bir". Lakin Almaz onun dini inancına, "Qurani-Kərim"ə iman gətirməsinə, Allaha qəlbən bağlılığına geridə qalmışlıq, avamlıq kimi baxır. Yaxşı ilə aralarındakı dialoq bu baxımdan olduqca səciyyəvidir:

"Yaxşı: Almaz, sən də mənim bacım, al bu Quranı, dayan üzü qibləyə, and iç bir olan Allaha ki, mənim sirrimi heç kəs bilməz, mən sənə deyim.

Almaz: Ay qız, Quran nədir, Allah nədir. Uşaq deyilsən ki".

Bədiiliyin meyarı bədii həqiqətin ifadəsində həyat həqiqətinə sədaqətin dərəcəsi ilə ölçülürsə, o zaman burada həyat həqiqəti kifayət qədər təhrif olunur. Deyilə bilər ki, C.Cabbarlı Sevil və Almaz obrazlarını yaradanda ictimai həyatda gedən proseslərin öz məntiqindən çıxış edirdi. Bu qəhrəmanlar 20-30-cu illərin mürəkkəb ictimai proseslərində sovet rejiminin qadına verdiyi azadlığın təmsilçiləri olmuşlar. Sevil də, Almaz da bu prosesi simvollaşdırır. Eyni zamanda onu da vurğulaya bilərlər ki, Cabbarlı həyat həqiqətlərinə sədaqət nümayiş etdirərək, məsələn, Almazın anası Xanımnazı qızından tam fərqli bir dünyagörüşü ilə səhnəyə çıxarır. Yaxşı və Xanımnaz obrazlarında reallığın milli qütbü, Almazın simasında yeni həyat quruculuğunu təmsil edən qadın obrazları simvollaşdırılır. Əlbəttə, burada kifayət qədər məntiq vardır. Heç şübhəsiz ki, "Od gəlini"ndə də, "Sevil"də də, "Almaz"da da iti realist qələmin ifadə etdikləri ilə yazıçının ideologiyanın təsiri altında əsərlərinə gətirdiyi hadisə və obrazlar üz-üzə dayanır, müəyyən mənada yazıçının həyat həqiqətinə sədaqətini sığortalayır. Ancaq bu halda da ədəbiyyatşünaslığın bu gün realist qələmin təsvir etdikləri ilə ideolojidən gələn təsvirləri bir-birindən ayırmağa

təşəbbüs etməməsi təəccüb doğurur. Dilçi alim Y.Qarayevin 1989-cu ildə yazdığı "Klassik sosialist realizmi – Cəfər Cabbarlı" adlı məqaləsi sənətkarın irsinə dəyişməkdə olan dövr üçün verilən dəyərdir. Müəllif doğru bir qənaətə gələrək hesab edirdi ki, "əlbəttə, Cabbarlı pyeslərindəki həyat anlayışında o zaman cərəyan edən və artıq tarixə çevrilən həyatın bütün qatları və qütbləri ehtiva olunmurdu. Hadisələr yalnız o zaman səhnəyə çıxması mümkün olan "qatda" cərəyan edirdi, realizmin Bayıl, QULAQ, Sibir qatı tək Cabbarlı üçün yox, bütövlükdə "sosialist realizmi" üçün hələ yasaq qatı idi" [6, s.385].

Əslində bu mülahizələr Cabbarlı və müasirlərinin irsində həyatın və ideolojinin vəhdəti şəklində meydana çıxdığını təsdiq edir və ədəbiyyatşünaslığı bu "qat"ları bir-birindən ayırmağa sövq etməyə hesablanmışdır. Professor Y.Qarayevin müşahidələrinə görə, Cabbarlının sovet dövrü əsərləri "həyatın bütün qatları və qütbləri"ni ehtiva edə bilmirdi. Alim etiraf edir ki, bu əsərlərdə "hadisələr yalnız o zaman səhnəyə çıxması mümkün olan "qatda" cərəyan edirdi". Onun realizmin Bayıl, QULAQ, Sibir qatlarına diqqət çəkməsi, əslində həyat həqiqətlərini bütün mürəkkəbliyi və ziddiyyətləri ilə ifadədə Cabbarlının sərbəst olmadığını sübut edirdi. Heç şübhəsiz ki, realizmin "yasaq qatı" Cabbarlını bu imkanlardan məhrum etməklə bərabər, həm də obyektiv şəkildə, həyatın düşüncəsindəki obraz şəklində ifadə etməyə də mane olurdu. Yaranmış bu maneələr Cabbarlını yaradıcılığının ilk mərhələlərində formalaşmış ənənələrdən bu və ya digər dərəcədə imtinaya gətirib çıxarır, onu həyat həqiqətini təhrifə sövq edirdi.

Sevilin, Almazın düşüncə və hərəkətlərini ictimai həyatın qanunauyğunluğu, tipik hadisəsi kimi qələmə verəndə C.Cabbarlının öz estetik prinsiplərinə zidd getdiyini görməmək mümkün deyildir.

Buna görə də "Od gəlini", "Sevil" və "Almaz"ın, eləcə də sovet dövründə yazdığı sonrakı əsərlərin ideolojidən gələn tərəflərinə – həyat həqiqətini təhrif edən tərəflərinə göz yumub, onları "gerçəkliyi əks edən yox, dəyişən, yenidən yaradan sənət möcüzəsi" hesab etmək elmi fikrin müqaviməti ilə qarşılaşır [6, s.383]. Sənətin həyatı əks etdirən qüvvəsi var. Ən yaxşı halda sənət həyata təsir edə bilər, lakin sənətin həyatı "dəyişən, yenidən yaradan" qüvvəsi yoxdur və bu düşüncə ilə çıxış etmək sənətə illuzial münasibəti əks etdirir. Tamaşaçıların "Sevil"ə çadralı gəlib "Sevil"dən çadrasız qayıtması"nı, səhnədəki hadisənin "həyatda təkrar və təqlid üçün modelə çevrilməsi"ni indiki halda ancaq sənətin möcüzəsi hesab etmək, ən yaxşı halda, məsələnin mahiyyət dərinliyinə varmamaq deməkdir [6, s.384].

**Cabbarlı dünyagörüşünün müqavimət gücü**

C.Cabbarlının "Oqtay Eloğlu"dan sonra yaradıcılığının tamamilə fərqli müstəvidə cərəyan etməsinin, yaradıcılığındakı "keyfiyyət" dəyişməsinin səbəbləri tarixilik prinsipinə uyğun olaraq araşdırılmalıdır. "Oqtay Eloğlu"nun səhnəyə qoyulduğu il (1923-cü il, 16 fevral) C.Cabbarlının ilk dəfə həbs olunduğu tarixlə üst-üstə düşür. Professor Asif Rüstəmli arxiv materiallarına istinad edərək yazır: "1923-cü ilin iyunun 15-də gecə Cəfər Cabbarlı və Seyid Hüseyn həbs edilmişdir" [9, s.35]. Ədəbiyyatşünas həmin ildə yazıçının ikinci dəfə həbs olunmasına da diqqət çəkir: "... Oktyabrın 5-də həbs olunanlar arasında Cəfər Cabbarlı da var idi". Tədqiqatçı C.Cabbarlının birinci dəfə həbsdən azad olunmasının səbəbi üzərində dayanır: "Yalnız çekistlər tərəfindən hazırlanmış bəyannamə mətninə avqustun 12-də müsavatçılarla bərabər Cəfər də imza atdıqdan sonra həbsdən azad edilir" [9, s.35].

1923-cü ildə C.Cabbarlının "çekistlər tərəfindən hazırlanmış bəyannamə mətni"nə qol çəkməsi ilə 1923-cü ildən sonrakı yaradıcılığında baş verən sapmalar arasında dərin bir əlaqə var. Bu əlaqənin "deşifrə" edilməsi bizə nə verə bilər?

Cabbarlının estetik idealında milli düşüncəyə ayrılan yer onun sovet dövrü dramaturgiyasında da davam etdirilir. Bu cəhət "Oqtay Eloğlu" və "Od gəlini"ndə qabarıq şəkildə nəzərə çarpır. Adətən milli azadlıq ideyasının ifadəsi, müstəmləkəçiliyə qarşı mübarizə idealının əksi kimi millilik düşüncəsi sənətkarın sovet dövrü yaradıcılığında, bir qayda olaraq "Od gəlini"ndə axtarılır. "Oqtay Eloğlu" adətən "Aydın" pyesi ilə müqayisə müstəvisinə çıxarılır. Bu əsərlərin baş qəhrəmanlarını tipoloji cəhətdən bir-birinin davamçısı, bir-birini tamamlayan obrazlar kimi təqdim etmək meyli aparıcı olsa da, onlar arasında bu müxtəlifliyin fərqinə varmaq tendensiyasının olduğunu qeyd etmək lazımdır. Məsələn, Y.Qarayev "hər iki qəhrəmanın həqiqət axtarıcılığı mücərrəd, idealistcəsinədir" deyərək, onları xarakter və ideal baxımından eynitipli qəhrəmanlar kimi təqdim edir [5, s.216]. Tənqidçi M.Arifin məsələyə baxışı isə kifayət qədər fərqli olub, hər iki qəhrəmanın xarakterinə daha dərindən nüfuz imkanını önə çıxarır: "Oqtayı Aydından fərqləndirən əsas cəhət ondan ibarətdir ki, Oqtayın həyat qayəsi nisbətən aydın və konkretdir. O, Aydın kimi mücərrəd arzular bəsləmir, keçilməz uçurumlar üzərindən atılmaq xəyalı ilə yaşamır. Oqtay pərəstiş etdiyi xalq səhnəsini yüksəltmək, milli teatr yaratmaq uğrunda dinclik bilmədən çalışır" [1, s.65].

Əslində M.Arifin mülahizələrində Oqtayın dünyagörüşü və xarakterini həqiqət müstəvisində aşkarlamaq üçün lazım olan bütün kodlar vardır. Onun, xüsusən Oqtayın "xalq səhnəsini yüksəltmək", "milli teatr yaratmaq uğrunda dinclik bilmədən çalışması" fikrini vurğulaması Oqtayın estetik yükünü tam şəkildə açmaq üçün imkan

yaradır. Lakin ideologiyanın bədii materialı sinfi müstəvidə qiymətləndirmək və millilik probleminin hər hansı bir ifadəsini bütün hallarda arxa plana atmaq tələbi M.Arifə Oqtayın mübarizəsinin və idealının həqiqi mahiyyətini axıra qədər açmağa imkan vermir. Buna görə də yaradıcılıq ehtirasını “onun əsas keyfiyyəti” hesab edərək, bu yaradıcılığın çiçəklənməsi üçün burjua mühitinin maneəsini və ifşasını önə çəkməklə kifayətlənir. Halbuki Oqtay səhnəyə milli vətəndaşlıq düşüncəsinin təmsilçisi, milli vətəndaşlıq şüurunu oyatmaq üçün bir mübariz kimi daxil olur. Onun sənət sevgisi anarxist bir məhəbbət deyildir. Bu istək vətən və millət sevgisindən doğur. Cabbarlının qəhrəmanı milli teatr yaratmaq və onu inkişaf etdirmək məqsədini özünün amalına çevirir, çünki o, bu mədəni hərəkatın milli şüurun oyanmasında oynaya biləcəyi rolu sonadək dərk edə bilir. Oqtayın milli səhnə uğrunda mübarizəsi milli varlığın özünütəsdiqi kimi səslənir, eyni zamanda XX əsrin əvvəllərindəki ədəbi-mədəni hərəkatın mahiyyətini ümumiləşdirərək Azərbaycan teatrının formalaşması uğrunda mübarizələrlə bağlı tarixi həqiqətləri əks etdirir.

Oqtayın özünü “mən azad bir sənətkaram”, “bir sənət düşgünüyəm” deməsi qeyri-şüuri, intuitiv bir duyğunun, yaxud ancaq fitri istedadın təlqini deyil, bu, Oqtayın vətən və millət sevgisinin hüdudsuzluğundan doğan başdan ayağa ayıq, inkişaf etmiş milli şüurun ifadəsi, millət övladının öz vətəndaşlıq vəzifəsini düzgün dərk etməsinin əksidir. Onun “başqalarında səhnə, mədəniyyət, hər şey var. Bizdə yox. Yaşamaq istəyirsək, yaratmalıyıq” sözləri realist estetik düşüncədəki:

Əcnəbi seyrə balonlarla çıxır,
Biz hələ avtomobil minməyiriz.

– misraları qədər milli və real məzmuna malikdir. Oqtay bu yolda bütün varlığını qoyur. Onun bütün varlığını fəda etdiyi səhnədə bir azərbaycanlı qızını görmək istəyi ancaq milli teatrın tərəqqisini görmək istəyinin ifadəsi deyil. “Oqtay Eloğlu”nda milli teatrın inkişafı ilə bağlı ehtiraslı arzular bütövlükdə cəmiyyətin, milli şüurun və dövlətçiliyin inkişafı ilə bağlı Azərbaycan ziyalısının ideallarını metaforlaşdırır. Oqtayın azərbaycanlı bir qızın səhnəyə gələcəyinə inamı, “onu mühit özü yetişdirəcək, xalq öz təkamülünün bağrından yaradacaqdır” sözləri bütövlükdə milli cəmiyyətin inkişaf perspektivlərinə hesablanaraq söyləndiyi şübhə doğurmur.

Elmi ədəbiyyatda çox vaxt məsələ belə qoyulur ki, “Oqtayın böyük məqsədi mühiti süni bir səhnə kimi dağıtmaqdır” [5, s.216]. Bu mülahizədə bir həqiqət var. Lakin ədəbiyyatşünaslıq “mühit” anlayışını birtərəfli izah edir. Oqtayın dağıtmaq istədiyi mühit kimi ancaq “burjua mühiti”ndən söhbət gedir. Halbuki onun səhnə taleyini ancaq burjua mühiti həll etmir. Maraqlı burasıdır ki, Oqtayın milli səhnə

uğrunda mübarizəsindəki bütün uğurları onun kapitalist mühitindəki fəaliyyəti dövrünə təsadüf edir. Bütün çətinliklərə baxmayaraq, o, məhz bu mühitdəki fəaliyyəti ilə milli səhnə formalaşdıra bilir. Burjua mühitindəki fəaliyyəti onu "adı dillərdə dastan kimi gəzən, bir zamanlar Azərbaycan səhnəsini titrədən Oqtay Eloğlu"na çevirir.

Müəyyən səbəblərdən bir müddət səhnədən uzaqlaşan Oqtay səhnəyə qayıdanda artıq onun yaratdığı milli səhnə sovet teatr səhnəsi ilə əvəz olunmuşdur. İndi teatra sənətə yox, pula və vəzifəyə sitayiş edən istedadsız adamlar rəhbərlik edirdilər. Onların Oqtayı səhnəyə qaytarmaq cəhdləri sənət naminə deyil, "bir zamanlar Azərbaycan səhnəsini titrədən Oqtay Eloğlu"nun sayəsində çoxlu bilet satmağa, pul qazanmağa hesablanır. Lakin Oqtayın səhnəyə qayıdışı şüurlu, düşünülmüş hərəkətdir, Azərbaycan səhnəsinə öz töhfəsini vermək, milli vətəndaş mövqeyini ortaya qoymaq məqsədinə xidmət edir. Teatrdan uzaqlaşdığı on ilə yaxın müddətdə ciddi zərbələr alsa da, onun sənət potensialı tükənməmiş, milli idealı və mövqeyi dəyişməmişdir. Azərbaycan səhnəsinə və azərbaycanlı xarakterinə yad düşüncəli əcnəbi aktrisa Tamaraya verdiyi cavabda Oqtayın əvvəlki potensialını, amal və düşüncəsini tam şəkildə mühafizə edib saxlaması meydana çıxır. O deyir: "Bir azərbaycanlı qızı yaratmaq üçün xalqın bütün ruhunu, hissiyyatını, tarixini, adət-ənənəsini görünməz incəliklərinə qədər bilməli, onun dərinliklərindən, onun mühitindən çıxmalı, bəlkə bir azərbaycanlı olmalıdır" [3, s.277].

Əslində bu sözlər təkcə bir azərbaycanlı qız obrazının yaradılması üçün verilən tələb deyil, teatrdan milli ruh tələbidir. Oqtay yeni cəmiyyətdə yaranan teatrın "indiki parlaq halını, salonlarını, onu rəngarəng çiçəklərlə bəzəyən Azərbaycan xanımlarını", onun "tərəqqisi"ni görür, lakin bu təmtəraq altındakı süniliyi, saxtalığı da hiss edirdi. Oqtayın sovet səhnəsində Firəngizlə "Qaçaqlar"ı oynayarkən dediyi sözlərin hamısı "ikibaşlı"dır. Qoyub getdiyi teatr mühitində təbiilikdən, səmimilikdən, həqiqətdən heç bir iz qalmadığını görən Oqtay milli təbiətinin təlqinləri ilə qarşısıalınmaz çılğınlıq məqamına qədər gəlir. Məhz bu məqamda reallıq haqqında həqiqəti dilə gətirir: "Yetər sünilik! Yetər yalan! Siz həqiqəti mənə göstərin! Mən onu görmək istəyirəm" [3, s.288]. Oqtay qoyub getdiyi həqiqəti görmək istəyir. O axtardığı həqiqətlərin heç birini, görə bilmədiyi mühiti "süni bir səhnə kimi dağıtmaq" istəyir. Mövcud mühiti inkar edərək, bu mühitin bütün qanunlarına, onun iç üzünə, saxtalığına qarşı duran yeni bir cəmiyyət tələbi ilə çıxış edir: "Elə bir həyat qurulmalıdır ki, orada hər bir söz qanun, hər şey bir həqiqət olsun. Hər şey göründüyü kimi deyil, olduğu kimi görünsün". Cabbarlının estetik düşüncəsində milli teatr uğrunda mübarizə bütövlükdə milli cəmiyyət uğrunda mübarizə kimi

metaforlaşır. Əslində Oqtayın bu fədakarlığı milli cəmiyyət uğrunda gedən mübarizələrin simvolik ifadəsi kimi mənalanır. Bu metaforiklik əsərin sonuna doğru bir qədər də qüvvətlənir. Yeni teatrı hədəf alıb oradakı bütün süniliklərin, saxtakarlıqların ünvanına deyilən sözlər əslində yeni cəmiyyət quruluşuna qarşı çevrilir. Oqtayın Firəngizi öldürməsi sadəcə intihar aktı deyil. Onun öldürülməsi, Oqtayın "ədalət divanı"na təslimi milli teatrın və onun simasında milli varlığın "ölən dünya"sını (İ.Şıxlı) simvollaşdırır. Oqtayın Firəngizi öldürməsi "yaşadaraq öldürən" cəmiyyətə qarşı etiraz aktının ifadəsidir. "Oqtay Eloğlu"nun son səhnələri ölümə məhkum edilmiş milli cəmiyyətin acı taleyini simvollaşdıraraq, "yaşadaraq öldürən" cəmiyyətə qarşı milli insanın birmənalı etiraz səsini ifadə edir. Əsərin nikbin pafosunu və qayəsini müstəmləkəçi rejimə qarşı çevrilmiş etiraz səsindəki qətilik müəyyənləşdirir.

Əsərdə Cabbarlının mövzuya verdiyi bədii həlldə romantik sənət prinsiplərinə, azad sənətkar mövqeyinə sadiqlik özünü sonadək qoruyub saxlayır. Lakin bu azadlığın Cabbarlı yaradıcılığının sonrakı mərhələsində qorunub saxlanması mümkünsüzləşir.

**Həbsxana həyatının sənətkar dünyagörüşündə yaratdığı metamorfozalar**

"Oqtay Eloğlu"nun səhnəyə qoyulmasından (1923-cü il, 16 fevral) bir neçə ay sonra Cabbarlının iki dəfə ardıcıl həbs olunması onun yaradıcılığına öz təsirini göstərməyə bilməzdi. Bu, ilk olaraq "Od gəlini" pyesində hiss olunur. Cabbarlı bu əsərdə artıq simvolik təsvir üsuluna keçir, öz milli ideallarını tarixi mövzunun bədii həlli üzərinə yükləmək qərarına gəlir, Babəkin ərəb işğalçılarına qarşı mübarizəsini bədii təsvir obyektinə çevirir. Əsərin simvolik planda yazılması və müasirliyinin də məhz bu əsnada meydana çıxmasını vaxtı ilə M.Ə.Rəsulzadə çox inandırıcı şəkildə belə ifadə etmişdir: "Tamaşaçılar üçün "ərəb" və "İslam" sözləri yerinə "rus" və "kommunizm" sözlərini qoymaq mənanı aktuallaşdırmaq üçün kifayətdir" [8, s.71].

Məhz Babək dövrünün hadisələrini təsvir etməkdə Cabbarlının sovet rejiminin müstəmləkəçilik siyasətinə işarə etdiyi, Babək hərəkatının simasında isə bu siyasətə qarşı milli mücadilənin zəruriliyini ifadə etməsi şübhə doğurmur. M.Ə.Rəsulzadənin "ərəb" yerinə "rus" sözünü qoymaq təşəbbüsü də məhz bunu işarə edir. Lakin görkəmli ideoloqun "İslam" yerinə "kommunizm" sözünü qoymasında ifadə olunan həqiqətin məzmunu kifayət qədər mürəkkəbdir və bu həqiqətlə tam razılaşmaq çətindir. Yəni M.Ə.Rəsulzadə bu qənaətdədir ki, Elxanın apardığı mübarizə mahiyyətcə sovet rejiminə və kommunizmə qarşı mübarizəni simvollaşdırır. Məsələnin ikinci tərəfi – İslamın kommunizmi, yaxud sovet rejiminin ideologiyasını

işarələməsi mübahisə doğurur.

**"Azad vicdanlı geniş bir məmləkət"in əxlaq sistemi və onun metaforası**

Çünki "Od gəlini"ndə Elxanın ərəb işğalçılığına qarşı apardığı hərəkatın son nəticəsi kimi yaranacaq "azad vicdanlı geniş bir məmləkət" qəhrəmanın ona verdiyi xarakteristikada kommunizmin əlamətlərini daşıyır. Elxan deyir: "Orada uydurma dinlər, allahlar olmayacaqdır. Azad vicdanlar, azad sevgilər hər kəsin böyük tanrısı olacaqdır. Orada qışın kəskin soyuqları hamını bərabər üşüdəcək, günəşin altun telləri hamını bərabər isidəcəkdir" [3, s.325].

Elmi ədəbiyyatda Elxanın qurmaq istədiyi "azad vicdanlı geniş bir məmləkət" utopik cəmiyyət kimi mənalandırılmışdır. Bu cəmiyyətdə işlək olacaq qanunlar bəzən sadəcə olaraq "ifratçılıq", ifrata varmaq kimi qiymətləndirilmiş, bəzən də "onun hərəkatının inqilabi mahiyyətini zəiflədən" cəhətlər kimi xarakterizə edilmişdir [1, s.105; 5, s.226].

M.Arif yazırdı: "Məlumdur ki, ərəb-islam tarixçiləri Babək hərəkatına dərin bir nifrət oyatmaq məqsədilə onun islahatçılığını dinsizlik damğası ilə damğalayır və hər vasitə ilə biabır edib, gözdən salmağa çalışırdılar. Xüsusən ailə və qadın azadlığı məsələsində Babəkin irəli sürdüyü tədbirləri islam dini naşirləri ailəsizlik, əxlaqsızlıq kimi izah edirdilər" [1, s.105]. M.Arif Elxanın yaratmaq istədiyi cəmiyyətdəki əxlaq qanunlarında məhz bu cəhətləri görür, bütün bunları Cabbarlının "mürtəce ərəb-islam tarixçilərinin əsərləri"nin təsiri altında qalması ilə izah edirdi [1, s.206]. Fikrimizcə, məsələ təkcə təsirdə deyil. Cabbarlı Babək haqqında ərəb tarixçilərinin verdiyi məlumatlarla sovet əxlaq prinsipləri arasında bir yaxınlıq görür və tarixi həqiqət olub-olmamasından asılı olmayaraq, Babəkin islahatçılıq planlarında yer alan əxlaq məsələlərini Elxanın qurmaq istədiyi cəmiyyətin qanunları kimi təqdim edirdi. Məsələ burasındadır ki, onun qurmaq istədiyi "azad vicdanlı məmləkət" "Od gəlini"nə utopik cəmiyyət kimi deyil, sovet cəmiyyətinin planlaşdırdığı "kommunizm"in ifadəsi kimi daxil olur. Başqa sözlə, "azad vicdanlı məmləkət" kommunizmi metaforlaşdırır.

Əslində, sovet ədəbiyyatşünaslığı məsələnin bu tərəfini birmənalı şəkildə ifadə etməkdən çəkinsə də, dolayısı ilə də olsa, buna işarə etmişdir. Elmi ədəbiyyatda "Od gəlini" faciəsini Cabbarlının sosialist realizm prinsiplərini mənimsəyərək yazması haqqında fikirlər bunu təsdiqləyir. Pyesin süjet xəttinin və qəhrəmanının xarakterinin milli idealın ifadəsindən sosializm, kommunizm ideallarının ifadəsinədək keçdiyi yol, hadisələrin milli planda təsvirdən sinfi planda təsvirə keçid alması, mövzuya verilən bədii həlldə sinfilik amilinin birmənalı şəkildə önə keçməsi bu həqiqəti təsdiqləyir. Ədəbiyyatşünaslığın qənaətlərindən biri budur ki, "Od gəlini"ndə Elxan bütün irqi,

dini, milli ayrı-seçkilikləri bir tərəfə atır, mübarizələrin yalnız bir növünü qəbul edirdi – sinfi döyüşləri" [5, s.223]. Əsərin mahiyyətinə dərindən nüfuz bu qənaətin həqiqət olduğunu göstərir. Lakin məsələ burasındadır ki, sovet ədəbiyyatşünaslığı bu keçidi Cabbarlı dramaturgiyasının irəliyə doğru hərəkəti kimi qiymətləndirir.

**Cabbarlı dramaturgiyasında "məzlumluq" və onun dəyişən məzmunu**

Cabbarlı dramaturgiyasında sinfiliyin ifadəsi haradan başlanır? Professor Y.Qarayevin mülahizəsini təsdiq edərək, "Od gəlini" faciəsindən – deyə bilərik. Bəs bu dramaturgiyada məzlumların mənafeyindən çıxış haradan başlanır? Cavabımız belədir: ilk dram əsəri "Vəfalı Səriyyə"dən. O zaman belə bir sual meydana çıxır. Məgər sinfiliyin ifadəsi ilə məzlumların mənafeyinin müdafiəsi eyni məzmunlu deyilmi? Yox, eyni məzmunlu deyil. Cabbarlı yaradıcılığında məzlumların mənafeyinin müdafiəsi onun məsələlərə sinfi baxışının ifadəsi kimi mənalana bilməz. Sinfi baxış birmənalı şəkildə milləti aşağı və yuxarı təbəqələrə bölür. Aşağı təbəqənin nümayəndələri birmənalı şəkildə məzlum, yuxarı təbəqənin nümayəndələri isə zalım elan edilir. Sinfi baxışda məzlumluğun və zalımlığın meyarı hansı təbəqəyə mənsubluqla ölçülür? Cabbarlı yaradıcılığında da məzlumluğun əks qütbünü zalımlıq təşkil edir, lakin ədib təbəqələri sinfi mənsubiyyətə görə ayırmır. Sənətkarın estetik baxışlarında məzlum – haqqı tapdanan, zalım – haqqı tapdayandır. Onun fikrincə, haqqı tapdanan yuxarı təbəqənin nümayəndəsi də ola bilər və o, Cabbarlı yaradıcılığında məzlum statusunda təqdim olunur. "Vəfalı Səriyyə"də Həmzə və onun Qurban və Məhərrəm adlı oğlanları yuxarı təbəqənin təmsilçiləridirlər. Lakin əsərdə Həmzə və Qurban Səriyyənin haqqını tapdadıqları üçün Məhərrəm onları "zalım" adlandırır. "Solğun çiçəklər"də Sara və Bəhram yuxarı təbəqəni təmsil edirlər. Lakin Saranın haqqı tapdandığı üçün o məzlumdur. Saraya edilən zülmlərin səbəbkarı və iştirakçısı olan Bəhram onun ölümündən sonra dərin psixoloji sarsıntı keçirərək deyir: "Ah, mən bədbəxt bilə-bilə öz yazıq əmim qızını məhv elədim. Bundan sonra mənim həyatım həyat deyil, əzabdır, əzab! Doğrudan da mən nəyəm? Öz əhdimi sındırdım, sözümdən qaçdım. Mən də insanmıyam? (Güzgüyə tərəf gedib baxır) Ey, sən kimsən? Bəhramsan? Yox! Yox! Sən bir xəbissən, bir alçaqsan!" [3, s.62] Cabbarlıda məzlumluq və zalımlıq insanın daxili dünyası ilə bağlıdır. İnsanın öz vicdanı, ürəyinin səsi qarşısında hesabat verməsi məsələsidir. Təsadüfi deyil ki, onun qəhrəmanları ya müəllif, ya digər obrazların mövqeyində, ya da özü-özünə daxili mühakimədə meyar olaraq ancaq "vicdan"ı seçirlər. Bəhram deyir: "Fəqət vicdan! (Kitabı örtür). Bəli, yazıqlar olsun o adamın halına ki, onun vicdanı mən bədbəxtin vicdanı kimi yaralıdır, ləkəlidir" [3, s.62].

“Nəsrəddin şah” pyesində Mirzə Rza Kirmani və Rəhim xan, Nadir və Cavad xan eyni təbəqəyə – yuxarı təbəqəyə mənsub insanların obrazıdır. Lakin pyesdə Mirzə Rza Kirmani və onun oğlu Nadir məzlumluğun təmsilçisidirlər. Mirzə Rza Rəhim xana deyir: “Sənin heç vicdanın yoxmu ki, hənüz dünyadan kam almamış balalarımı qanlar ilə əlvan etdin?” [3, s.84] Məzlumluğun və zalımlığın meyarı belə müəyyənləşir: Balaları nahaq yerə öldürülənlər məzlum, “dünyadan kam almamış balaları” öz şəxsi və haqsız iddialarına görə al qana qərq edənlər zalım statusu daşıyır. Cabbarlı dramaturgiyasında vicdan haqq-ədalət tərəzisi, insanlığın meyarıdır. Cabbarlıya görə insan hər bir hərəkətinə görə vicdanı qarşısında məsuldur. Vicdan qarşısında məsulluq insana insani münasibət tələb edir.

Cabbarlının insanları “məzlum”lara və “zalım”lara bölgüsündə insana humanist münasibət tələbi həlledici şərt, amil kimi meydana çıxır.

Lakin Cabbarlı yaradıcılığında insana humanist münasibətin xarakterinin məzlumluğun və zalımlığın meyarı olması prinsipi “Od gəlini”ndən başlayaraq metamarfozaya uğrayır. Bu meyarın yerini Y.Qarayevin dəqiq müəyyənləşdirdiyi kimi, sinfi münasibət alır. Elxan deyir: “Soruşma, Aqşin. Bu yazıq, gözü qapalı xalq, özü öz səadətinin tanrısı olduğuna inanmır” [3, s.313]. Sosrealizmdə “xalq” anlayışı bütün sosial təbəqələri öz içinə almır, “xalq” deyəndə ancaq aşağı təbəqə nəzərdə tutulur. Çünki sosrealizmdə xalq sinfi məzmun daşıyır.

Ədəbiyyatşünas Ə.Nazimin bir fikrini iqtibas etsək deyə bilərik ki, sosrealizm “xalqa musavi hüquqlu bir gözlə” baxmır. “Od gəlini”ndə sosrealizmin prinsiplərinə uyğun olaraq “xalqa musavi hüquqlu bir gözlə” baxılmır. C.Cabbarlının “xalq” anlayışına sinfi yanaşması “məzlumluq” anlayışını ancaq “məzlum əməkçilər”ə aid edir. Elxan deyir: “Dünya iki cəbhəyə ayrılmışdır. Bir tərəfdə silahlı güclülər, digər tərəfdə isə əliboş məzlumlar”. Elxanın buraya qədərki sözləri məzlumluq-zalımlıq anlayışlarının bəşəri məzmunun insana humanist münasibət kontekstindəki ifadəsidir. Məzlumluq-zalımlıq anlayışlarının bu cür təfsiri Cabbarlının “Od gəlini”nə qədərki əsərlərinin fəlsəfəsində dayanır. Lakin Elxan sözünü burada bitirmir və davam edərək deyir: “Biz ikinci cəbhədə olacağıq. Bütün məzlum əməkçilər bizimlə, son və gələcək bizim olacaqdır” [3, s.313].

İlk dəfə C.Cabbarlı qəhrəmanının mövqeyində prinsipial dəyişiklik baş verir, o, ilk dəfə olaraq xalqa, millətə, yaxud məzlumlara deyil, məzlum əməkçilərə müraciət edir. “Məzlum”un “məzlum əməkçilər”lə əvəzlənməsi məsələyə sinfi baxışın Cabbarlı dramaturgiyasına nüfuzudur. Sənətkar bu dramda şüurlu olaraq və tam bir məcburiyyət, ideoloji təzyiq qarşısında səhifədən səhifəyə keçdikcə məzlumluğun sinfi məzmununu konkretləşdirir. Elxan deyir: “Dünyada iki cəbhə vardır: əzənlər,

əzilənlər”. “Od gəlini”ndə “əzilənlər”in “məzlum əməkçilər” kimi şərhindən əlavə, onların məhz “yoxsullar” olmasına qəti işarələr edilir. Beləliklə, əsərdə “məzlumlar” anlayışı “məzlum əməkçilər”, “yoxsullar” anlayışlarına adekvat işlənir və Elxanın mübarizəsinə sinfi məzmun verilir. Məhz bu cəhət milli ideal uğrunda mübarizənin sinfi mənafe uğrunda mübarizə ilə əvəz olunmasını göstərir və Cabbarlı dünyagörüşündə baş verən metamarfozaları əks etdirir.

**Nəticə / Conclusion**

Bu metamorfozalar Cabbarlının “Od gəlini”ndən sonra yazdığı bütün əsərlərində özünü göstərir. Lakin biz C.Cabbarlı dünyagörüşündəki bu metamarfozaları onun həqiqi sənət idealının ifadəsi kimi yox, rejimin təzyiqləri qarşısında geri çəkilməyə məcbur qalması kimi başa düşürük. Buna görə də vəzifəmiz Cabbarlı yaradıcılığına baxışda tarixiliyi önə çəkmək, tarixi-siyasi şəraitin diktələri ilə sənətkarın daxili dünyasından, həqiqi inanc və idealından gələnləri bir-birindən riyazi dəqiqliklə ayırmaqdır. Cabbarlı yaradıcılığının yaşarlılığını, başqa sözlə müasirliyini şərtləndirən cəhətləri ancaq bu halda dəqiq müəyyənləşdirmək olar.

**İstifadə edilmiş ədəbiyyat / References**


1. Arif M. (1968). Əsərləri. Üç cilddə, II cild. Bakı, Azərb. SSR EA nəşriyyatı. 516 s.
2. Azərbaycan tarixi. (1994). Yeddi cilddə, I cild. Bakı, 496 s.
3. Cabbarlı C. (2005). Əsərləri. Dörd cilddə, II cild. Bakı, Şərq-Qərb. 360 s.
4. Cabbarlı C. (2005). Əsərləri. Dörd cilddə, III cild. Bakı, Şərq-Qərb. 368 s.
5. Qarayev Y. (2015). Seçilmiş əsərləri. Beş cilddə, I cild. Bakı, Elm. 467 s.
6. Qarayev Y. (2016). Seçilmiş əsərləri. Beş cilddə, IV cild. Bakı, Elm. 552 s.
7. Mustafayev Q. (1993). XX əsrin əvvəllərində Azərbaycanda islam ideologiyası və onun tənqidi. Bakı, Maarif.
8. Rəsulzadə M.Ə. (1991). Əsrimizin Səyavuşu. Çağdaş Azərbaycan ədəbiyyatı. Çağdaş Azərbaycan tarixi. Bakı, Gənclik. 112 s.
9. Rüstəmli A. (2005). Bədii həqiqətlər ustası (Ön söz). Cabbarlı C. Əsərləri. Dörd cilddə, I cild. Bakı, Sərq-Qərb.
10. Cabbarlı C. (2005). Əsərləri. Dörd cilddə, I cild. Bakı, Şərq-Qərb. 328 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 3 (277), 97-105
doi.org/10.48445/j6071-1172-5079-r



# Yusif Vəzir Çəmənzəminlinin gözəllik tərbiyəsi və ya sevginin dili

***Minaxanım Nuriyeva Təkləli***
Filologiya elmləri doktoru, professor, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan. E-mail: proftomris@gmail.com
https://orcid/org//0000-0002-4985-8134

**XÜLASƏ**
Yusif Vəzir Çəmənzəminlinin öz ideya-bədii dəyərləri ilə irihəcmli əsərlərinə bərabər tutulan "Qız məktəbində", "Divanə", "Bir qəpik", "Cümə axşamı", "Əziz", "Borclu", "Nahaq qan", "Toy" və s. bu kimi hekayələrində dövrün ictimai bəlaları – gerilik, cahillik problemləri əks olunur. Mövzusu real həyatdan alınmış, böyüklərlə yanaşı uşaq obrazlarının da yer aldığı bu əsərlərdə artıq əsrin əvvəllərində ədəbi meyillər milli dirçəlişə, yeni insan tərbiyəsinə istiqamətlənmişdi. Ədəbi-bədii təcrübələri ilə bu milli ruhu oyadan, onu tərbiyə etməklə gücləndirən Sultanməcid Qənizadə, Abdulla Şaiq, Firidun bəy Köçərli kimi maarifçilərlə yanaşı bu sahədə Yusif Vəzir Çəmənzəminlinin də xidmətləri danılmazdır.

**AÇAR SÖZLƏR**
ailə, uşaq, folklor, maarifçi, ədəbiyyat, ana, qadın

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 02.08.2023
qəbul edilib: 05.09.2023

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO. 3, VOL. 277, 97-105
doi.org/10.48445/j6071-1172-5079-r

**AZERBAIJAN LITERATURE**

# Beauty education or the language of love by Yusif Vazir Chamanzaminli

***Minakhanim Nuriyeva Tekleli***
Doctor of Philological Sciences, Professor, Azerbaijan State Pedagogical University. Azerbaijan. E-mail: proftomris@gmail.com
https://orcid/org//0000-0002-4985-8134

**ABSTRACT**
Yusif Vazir Chamanzaminli's large-scale works with their ideological and artistic values should be compared to “Giz mektebinde” (Girl's school), “Divane” (Crazy), “Bir gepik” (A coin), “Juma akhshami” (Thursday), “Borjlu” (Debtor), “Nahag gan” (Wrong blood), “Toy” (Wedding) and so on the social problems of the time − backwardness, ignorance are reflected in his stories. At the beginning of the last century, the literary trends were directed towards national revival and new human education in these works, in which children took part as well as adults, whose themes were taken from real life and environment; that is, along with Sultanmajid Ganizadeh, Abdulla Shaig, Firidun bey Kocharli, who awakened and strengthened this national spirit with their literary and artistic experiences, Yusif Vazir Chamanzaminli's services in this field are also great.

**KEYWORDS**
family, child, folklore, enlightener, literature, mother, woman

**ARTICLE HISTORY**
Received: 02.08.2023
Accepted: 05.09.2023

## Giriş / Introduction

Bu gün çoxəsrlik zəngin tarixə malik olan Azərbaycan ədəbiyyatının tam mənzərəsini yaratmaq üçün ayrı-ayrılıqda onun hər bir sahəsinin inkişaf istiqamətlərini və uzun tarixi bir dövr ərzində kəsb etdiyi başlıca xüsusiyyətlərinin, o cümlədən uşaq ədəbiyyatı sahəsində əldə edilən nailiyyətlərin öyrənilib dəyərləndirilməsinin böyük əhəmiyyəti vardır. Bildiyimiz kimi, Azərbaycan milli maarifi, mədəniyyət və ədəbiyyatı kifayət qədər möhkəm ənənələrə malikdir. Bu mənada Nizami Gəncəvi, Xacə Nəsirəddin Tusi, Şeyx Yəhya Bakuvi, Məhəmməd Füzuli, Qətran Təbrizi, Abbasqulu ağa Bakıxanov, Seyid Əzim Şirvani, Məhəmməd Tağı Sidqi və digər ədəbiyyat və mədəniyyət xadimlərinin yaradıcılıqlarında həm insan tərbiyəsinə, həm də ailə-övlad münasibətlərinə geniş yer verdikləri aydın olur. Bunun nəticəsidir ki, 20-ci yüzillik Azərbaycanda yeni ruhlu mədəni mühitin yayılması və öyrənilməsi, yeni ictimai fikrin formalaşması, bir qədər sonra isə Azərbaycan intibahını həyata keçirəcək bütöv bir nəslin meydana gəlməsində müstəsna rol oynamışdır [8, s.19]. Belə ki, əsrin əvvəllərindən başlayaraq maarif və mədəniyyət sahəsində ciddi canlanma əmələ gəldi: bir sıra maarif ocaqları, xeyriyyə cəmiyyətləri, nəşriyyatlar, kitabxanalar yaradıldı [2, s.4]. Bu dövrdəki Azərbaycan maarifçilərinin etik görüşlərinin əsasını ictimai tərəqqi, ədalət, vətənpərvərlik, yüksək humanizm, xalqlar dostluğu və başqa mütərəqqi əxlaqi ideyalar təşkil edirdi [4, s.5].

Əsrin başlanğıcında Firidun bəy Köçərli, Sultan Məcid Qənizadə, Nəriman Nərimanov, Rəşid bəy Əfəndiyev, Yusif Vəzir Çəmənzəminli, Abdulla Şaiq bu geniş maarifpərvər hərəkatı özlərinin "ideya irsi" hesab etməklə imzalarını qoydular. Qeyd edək ki, adlarını çəkdiyimiz bu tərəqqipərvər ictimai xadimlərin fəaliyyət dairəsi çoxcəhətli idi. Bu baxımdan Azərbaycan ədəbi-ictimai fikri tarixində mühüm yeri olan maarifçi yazıçıların milli mənlik şüurunun formalaşdırılmasında göstərdikləri xidmətlərin, habelə onların vətənpərvərlik hisslərinin tərbiyəsində tutduqları mövqenin araşdırılması günümüzdə ciddi əhəmiyyət kəsb edir. Bu əsərlərdə milli-tarixi gerçəklik, müasir cəmiyyətin qayğıları, ictimai bərabərlik və azadlıq amalları əsas qayə olaraq görünməkdədir. Bu səpkidə ortaya çıxan ədəbi-bədii nümunələrdə həm də bədii zövqü kamilləşdirmək, gənc nəslin milli yaddaşını, hafizəsini qüvvətləndirmək, öz milli ənənələrinə, torpağına, vətəninə bağlılığını möhkəmləndirmək vəzifələri əsas yer alırdı. İnsanların əxlaqca tərəqqisinə, təkmilləşməsinə və tərbiyənin roluna dərin inam bəsləyən Azərbaycan maarifçiləri öz əsərlərində əxlaqla zəkanın, elmin, biliyin və azadlığın əlaqəsinə geniş yer verirdilər [4, s.22]. Onlar əxlaqi tərəqqinin rolunu belə görürdülər.

**Yusif Vəzir Çəmənzəminlinin ədəbi-bədii fəaliyyətində ailə-uşaq münasibətləri**

Mənsub olduğu xalqın maariflənməsi, mədəni tərəqqisi yolunda səmərəli fəaliyyət göstərən Yusif Vəzir Azərbaycan ədəbiyyatı tarixində qüdrətli nəsr ustası kimi tanınmaqla yanaşı, uşaq ədəbiyyatı sahəsində də yorulmadan xidmət göstərmişdir. Bir çox əsərlərində, məqalələrində ailənin, uşaq və ananın (ümumiyyətlə qadının) məişət və cəmiyyətdəki rolundan dönə-dönə bəhs edən müəllifi müasiri olduğu Azərbaycan qadınının vəziyyəti mütəəssir edib dərindən düşündürürdü. “Yuxu”, “Dərdli Züleyxa”, “Divanə”, “Üç gecə”, “Dürnisə və Kərbəlayi Eyvaz”, “Şahqulunun xeyir işi”, “Üç”, “Toy”, “Hərrac”, “Yüksəliş” kimi hekayələrindən aydın olur ki, qadın qəhrəmanlarının taleyi, ailə məsələləri ədibi hər zaman düşündürmüşdür. Qeyd etməliyik ki, ədəbi ictimaiyyətin diqqət mərkəzində duran ailə, qadın, uşaq məsələsi Yusif Vəzirin də yaradıcılığının başlıca mövzusu olmuşdur. 1913-1914-cü illərdə ərsəyə gəlmiş “Ana və analıq”, “Qız məktəbi açmalı”, “Arvadlarımızın halı” kimi birbaşa ana, qadın və onun cəmiyyətdə roluna həsr edilmiş yazıları yazıçının vətəndaşlıq mövqeyini açıq-aydın göstərir. Demokratik düşüncənin məhsulu olan həmin yazılar bu gün də öz əhəmiyyətini qoruyub saxlamaqdadır. Onun publisist irsinin mühüm bir hissəsini təşkil edən bu əlyazmalar, habelə ailə mövzusunda yazdığı bədii parçalar (hekayələr) ədibin gənclik illərinin məhsuludur. Yusif Vəzir dövrün vacib məsələlərindən nəinki yan ötməmiş, əksinə, birbaşa onun üstünə getmişdir. Bilirik ki, XX əsrin əvvəllərində qabaqcıl mütərəqqi ziyalılar qadının − ananın ailə və cəmiyyətdə layiq olduğu yeri tutmasına çalışırdılar. Gənc yazıçı da öz səsini demokratik mətbuatda ucalan səslərə qatırdı.

Azərbaycan milli nəsrinin görkəmli nümayəndəsi Yusif Vəzir Çəmənzəminlinin uşaq ədəbiyyatı ilə bağlı fəaliyyətində iki istiqamət nəzərimizi cəlb etməkdədir: uşaqlar üçün yazdığı nağıllar; mövzusu uşaq və yeniyetmələrin həyatından alınan bədii əsərlər. İctimai fikir tariximizdə maarifçi ideyaların carçısı olaraq tanınan ədibin əsərlərində məişət və ailə səhnələri xüsusi bir tərzdə qələmə alınaraq XX yüzilliyin əvvəllərinə aid Azərbaycan kəndlisinin, kiçik sənətkarların həyat tərzi, daxilən safdil, təmiz, amma sadəlövh, son dərəcə avam olan insanların evləri, ailələri gözlər önünə gətirilir. Özünün həyati örnəkləri bu mövzularda əsərlər qələmə almağa zəmin yaradırdı; ədib uşaq ikən qayğıkeş, səmimi bir mühitdə böyümüşdü. Hətta ailə aclıq illərində İrandan – Cənubi Azərbaycandan qaçıb gəlmiş üç qardaşa sığınacaq vermişdir. O vaxtdan etibarən iki ailə arasında səmimi və möhkəm dostluq əlaqələri başlamış, bu səmimiyyətin xoş bəhrələri hər dəfə ailənin başı üzərində soyuq küləklər əsdikdə, onun acı günlərində özünü göstərmişdir.

Yazıçı böyük ümidlə "İqbal" qəzetində yazırdı: "Biz həmişə avam olub dalda qalmamalıyıq ki, bizim də tərəqqi vaxtımız gələcək" – deyə millətin aydın gələcəyinə öz ümidini ifadə edirdi. Yazıçı öz növbəsində sadəlik, avamlıq və nadanlıqdan doğan faciəvi qayğılarla oxucularını tanış etməklə həyata və dünyaya baxış formalaşdırırdı. Bu baxımdan öz ideya-bədii dəyərləri ilə irihəcmli əsərlərinə bərabər tutulan "Qız məktəbində", "Divanə", "Bir qəpik", "İki çocuq", "Cümə axşamı", "Əziz", "Borclu", "Nahaq qan", "Toy", "Nitq", "Son bahar", "Mərsiyəxan", "Beş dəqiqə", "Doqquz ay keçmiş" və s. bu kimi uşaq obrazlarının da bilavasitə iştirak etdiyi hekayələrində dövrün ictimai bəlaları – gerilik, cahillik problemləri əks olunur. Yazıçının "Ruhnəvaz xanım" hekayəsindən götürdüyümüz "yalnız gözləri deyil, bütün varlığı və taleyi ağlayırdı. Ruhunun dərinliyində acı yaşların anlaşılmaz və qaranlıq bir boşluğa töküldüyünü hiss edirdi" nümunəsi göstərir ki, ailə faciələri izsiz-soraqsız ötüşmür, mənəviyyata ciddi yaralar, sarsıntılar vurur.

Bu cür mövzuların ədəbiyyata yol alması problemli vəziyyəti gərginləşdirməklə ictimai fikri sürətlə fəallaşdırırdı. Mövzusu real həyatdan alınmış bu əsərlərdə böyüklərlə yanaşı uşaqlar da iştirak edir. Hətta bu uşaqlar − yeniyetmələr qəhrəman obrazlar kimi təqdim olunmaqla əsərin mərkəzi hissəsində yer alırlar. Bəzən əsər bu yarıuşaq, yarıyeniyetmənin dilindən nəql edilir: "Dədəmin övladı olmadığına görə nəzir eləyir ki, bir qızım olsun, seyidə verim. Odur ki, məni on bir yaşım tamam olanda Mir Qasım adlı bir qırmızısaqqala ərə veriblər". Xarakterik məişət lövhələri təsvir olunan belə əsərlərdə uşaqlar fəaldır, çünki burada mövzu tamamilə onlarla bağlı inkişaf etdirilmişdir. Məsələn, "Cümə axşamı", "Borclu", "Qız məktəbində" əsərlərində evdə ailə başçılarının münaqişəsində uşaqlar da fəal iştirakçıdırlar; onlar ağlaşır, qorxu keçirirlər... Məişətimizin tünd boyalı, koloritli lövhələrinin təsvirindən əldə olunan nəticələr və əsərin ideya məzmununun açılması işinin keyfiyyəti burada ən əlverişli vasitənin söz və ondan istifadə üsulunun olduğunu göstərir.

Ədib "Bir qəpik" əsərində kiçik bir detalla, bir işarə ilə obrazın əsas cizgilərini oxucuya çatdıra bilir. Demək, obrazların xarakterini səciyyələndirmək üçün yazıçıya çox söz də lazım olmurmuş. Əsərdən oxuyuruq: "lampa çölə çıxmışdı..." demək ki, bu cümlə ilə ətrafdakı qaranlığı, zülmət gecəni işıqlandırmaq məqsədilə çırağın bayıra aparılması ilə hekayə bitir. Amma bir qəpiyi salıb itirən balaca Məcidin əzab-əziyyəti bitmir, əksinə, davam edir, oxucunun qəlbi qan ağlayır. Onu uşaq vərdişlərindən, sevdiyi qayğısız məşğələlərindən ayırıb ona heç vəchlə uyğun gəlməyən bir iş dalınca göndərirlər. Lakin necə deyərlər, "uşaq uşaqdır", odur ki, qatıq almağa göndərilən bu uşaq verilən tapşırığı dərhal unudur. "Uşaq çox yeriməyib, yenə durdu; başının üstündə bir gecəquşu hərlənib, fırlanırdı. Gözdən

itirdi, bir də çıxırdı və bəzi vaxt uşağın qulağının dibindən uçurdu; elə bil onunla oynamaq meylində idi. Gecəquşunun hərəkəti uşağı məşğul edirdi. Uşaq gülümsünürdü və böyük bir fərəhlə ona tamaşa edirdi, şad olurdu". Onu bu sevdiyi məşğələdən rəhmsizcəsinə ayıran yadlar yox, məhz yaxınları, ata-anası idi. Kədərli, nisgilli uşaq qəlbinə birdən-birə bu gecəquşunun daxil olması ona heç vaxt dadmadığı uşaq sevinci bəxş edir. Lakin bu sevinc uzun sürmür; "birdən uşağı guya ilan vurdu, başladı durduğu yeri axtarıb aramağa. Ovcunun içinə diqqətlə baxdı, arxalığının ciblərini əlləşdirdi, qəpik tapılmadı" və s. kimi yazıçının qəm-kədər hopan cümlələri oxucunu da əslində gələcəyimiz olan uşaqların hazırkı vəziyyətinə acımağa vadar edir. Onsuz da göz yaşları hələ qurumadan bu nəmli çöhrəni şadlıq və sevinc bürüyərkən də bu nəşənin uzun çəkməyəcəyini öncədən hiss edən oxucu çoxdan səksəkədə idi; budur, tifil pulu salıb itirmişdir.

Kinayə, acı gülüş, azərbaycanlı təbiətinə məxsus zarafat, bunlarla bərabər giley, yazıçının güldürərək ağlatması – bütün bunlar ədibin yazı manerası olmaqla həm bu, həm də digər hekayələrində özünü büruzə verir.

Əlbəttə, uşaq ədəbiyyatı dedikdə, göz önünə təkcə tülkü, durna, kirpi... gəlir − deyə düşünmək də doğru deyil. Yəni ədəbiyyat sadəcə bu əhvalatlardan, bəsitcəsinə qəbul edilən mövzulardan ibarət deyil. Bəllidir ki, uşaq ədəbiyyatı nümunələri həmçinin böyüklər üçün də maraq kəsb etməkdədir.

Ümumiyyətlə, Çəmənzəminli üslubuna xas olan bütün keyfiyyətlər onun əsərlərində, xüsusən də yazı dilində tam gücü ilə özünü göstərməkdədir. Bu əsərlərin dili uşaq-yeniyetmə təxəyyülünə uyğun şirin, cazibədar dil və ifadə tərzinin rəngarəngliyi qəmli notlar üzərində xəfifləmiş; təhkiyə sənətkarın lirik-romantik üslubuna uyğun bir dillə davam etmiş; yazıçının bədii düşüncələrinə kövrəklik, həzinlik qatmışdır.

Ədibin tərbiyəsində anası Seyid Əziz xanım önəmli rol oynamışdır; anasından eşitdiyi hekayələr, yaxın keçmişin acı xatirələri, qonşuluqda, ətraf mühitdə baş verən cansıxıcı olaylar, həqiqətən, gələcək yazıçının yeniyetmə qəlbini sıxır, onu həyatı tez və hərtərəfli öyrənməyə sövq edirdi. Bu nümunələr sadəcə bir xəyal olmayıb, bir çox hallarda yazıçının öz həyatından götürülən kiçik parçalardır; obrazlar kimi hadisələr də ümumən yazıçının tanıdığı və şahidi olduğu olaylardır. Görünür, yazıçılıq və şairlik istedadı ilə yanaşı, sənətkarın bu qədər əsərə mənbə və qaynaq ola biləcək dərəcədə çəkdiyi çətinliklər, xoşbəxtlik uğrunda apardığı mücadilələr də mühüm şərtdir [6, s.52]. Odur ki, bu mövzuların həyatdan götürüldüyü, öz növbəsində əsərlərinin mövzu və məzmun baxımından əlvanlığı səbəbləri də bizə bir daha aydın olur. Nəticədə deyə bilərik ki, ailənin təbii təsviri, uşaqların tərbiyəsi və həyatındakı

eybəcərliklər, eləcə də Azərbaycan qadınının acınacaqlı vəziyyəti Çəmənzəminlini daim düşündürmüşdür. Məhz əsərlərində tez-tez gözə dəyən "qız idim sultan idim...", "qız yükü, duz yükü", "məsləhətdir, (qızı) ver başından rədd olsun", "uzunsaçlının ahı yerdə qalmaz", "qızı saxlayıb un çuvalına tay etməyəcəksən ki...", "Allah heç kəsi yetim eləməsin", "qız uşağı tez böyüyər", "qıza çörək verməkdən təngə gəldi" deyimləri mövcud problemin ağırlığından xəbər verir.

Uşaq taleyinə həsr edilən əsərlərdə bəzən müqayisələr belə bu problemin həlli ilə bağlı olmaqla bir növ mövzunun ədibə hərtərəfli və dərin təsirini təsdiqləyir: "İftadə xoruldayır və bu xorultu gecənin sükutunda arvadın qulağına çataraq əcaib sədalar doğururdu... sanki tənha bir küçədə kimsəsiz, yetim bir çocuğu boğurdular, iniltisi ətrafa yayılaraq qeyb olur, əvəzində başqa bir fəğan doğurdu". Burada hər hansı bir cansıxıcı səsin boğazlanmış yetim uşağın iniltilərinə bənzədilməsinin də məntiqli səbəbləri vardır. Hər şeydən əvvəl bu hekayədə ("Yüksəliş") əyyaş atanın (anaları vəziyyətə dözməyib ailəni tərk etmiş) bütün qazancını içkiyə verməsi ilə həqiqətən bu tifillərin boğazı kəsilmişdir; onlar acından, baxımsızlıqdan labüd ölümə məhkumdurlar. Burada məşhur türk yazıçısı Ahmet Kabaklının bu və buna bənzər məsələlərlə əlaqədar dedikləri yada düşür: "Çocuqların mühafizəsi onların aşağılıq duyğusuna, kinə, əxlaqsızlığa, miskinliyə, boynubüküklüyə düşmədən yetişmələrini təmin edir. Çünki onlar ancaq öz ruhlarını qurtarıb öz nəfslərini yendikdən, bir-birlərini və həm də yaşamağı sevməyə başladıqdan, təbəssümü və salam alış-verişini öyrəndikdən sonra vətənə, elmə, millətə və insanlığa onlardan bir fayda, bir xidmət gözlənilə bilər" [7, s.64]. Bu mənada Çəmənzəminlinin haqqın qələbəsinə inam, barış, əmin-amanlıq arzuları əks edilən bu əsərləri bir daha göstərir ki, yazıçı yeni nəslin formalaşdırılmasında milli tərbiyənin rolunu düzgün müəyyənləşdirə və onu doğru-dürüst istiqamətləndirə bilmişdir.

Çəmənzəminlinin xalq yaradıcılığına olan dərin və sonsuz sevgisi onun ailə-uşaq münasibətlərindən bəhs edən əsərlərində öz təcəssümünü tapır. Xalq yaradıcılığının, xüsusən el ədəbiyyatının mahir bilicisi olan yazıçının folklorşünas olaraq fəaliyyətinin bir qolunu da el dilindən toplanan materiallar tutur; məhz bu çalışmaların müəyyən qismini nağıllar əsasında meydana gətirdiyi nağıl-hekayələr təşkil edir. Bu nümunələr xalq dili üslubunda qələmə alınmaqla uşaqlar üçün dəyərli vəsait hesab edilir.

Yusif Vəzir öz yazı tərzi ilə diqqəti cəlb edən bir sənətkardır. Ədibin fikrincə, xalq ədəbiyyatı nümunələrində bəşəri təmayüllər daha güclüdür. Bəşəri arzular, xalqın tarixi, adət-ənənələri, inam və etiqadları, sınaq və yorumları, ayin və mərasimləri barədə davamlı bilgilər saxlayan folklor ədibi bir çox cəhətləri ilə cəlb

edirdi. Azərbaycanın zəngin xalq ədəbiyyatına malik olduğunu dönə-dönə qeyd edən yazıçı 1910-cu ildə Kiyevdə məşhur xalq nağılımızdan götürdüyü süjet əsasında "Məlik Məmməd" nağılını yazır. Nağıl 1911-ci ildə kitabça şəklində çap olunur. Haqqın nahaq üzərində qələbə çaldığı "Caçcı" nağılı isə yazıçının toplayıb dərc etdiyi ilk nümunədir. Xalqımızın keçmişindən və mifik irsindən daim bəhrələnən, bu qaynaqlara diqqət və hörmətlə yanaşan müəllif cümhuriyyət quruculuğu ərəfəsində bu yöndəki fəaliyyətinin gərəkliliyini nəzərdə tutaraq yazırdı: "Düşmənə qalib gəlmək üçün milli ruh lazımdır" ["Açıq söz" qəzeti. Bakı, 1917].

**Nəticə / Conclusion**

Azərbaycan milli nəsrinin görkəmli nümayəndəsi Yusif Vəzir Çəmənzəminlinin uşaq ədəbiyyatı ilə bağlı fəaliyyətində iki istiqamət nəzərimizi cəlb etməkdədir: uşaqlar üçün yazdığı nağıllar və yaradıcılığı boyu mövzusu uşaq və yeniyetmələrin həyatından alınaraq qələmə aldığı bədii əsərlər. İctimai fikir tariximizdə maarifçi ideyaların carçısı olaraq tanınan ədibin əsərlərində qeyd etdiyimiz kimi, ailə-məişət səhnələri xüsusi tərzdə qələmə alınmaqla göz önünə XX yüzilliyin əvvəllərinə aid Azərbaycan kəndlisinin, kiçik sənətkarların həyat tərzi, daxilən safdil, təmiz, amma sadəlövh, son dərəcə avam olan insanların evləri, ailələri gətirilir. Yazıçı öz növbəsində onların sadəliyi, avamlığı və nadanlığından doğan faciəvi qayğılarla oxucusunu tanış etməklə həyata və dünyaya baxış formalaşdırır. Aydın olur ki, artıq XX əsrin əvvəllərində ədəbi meyillər milli dirçəlişə, yeni insan tərbiyəsinə istiqamətlənmişdir. Odur ki, ədəbi-bədii təcrübələri ilə bu milli ruhu oyadıb tərbiyə etməklə gücləndirən Sultan Məcid Qənizadə, Abdulla Şaiq, Firidun bəy Köçərli, Məhəmməd Hadi ilə bir sırada Yusif Vəzir Çəmənzəminlinin də xidmətləri danılmazdır.

**İstifadə edilmiş ədəbiyyat / References**

1. "Açıq söz" qəzeti. (1917). Bakı, 19 dekabr.
2. Azərbaycan uşaq ədəbiyyatı antologiyası. (2005). Üç cilddə, III c. Bakı, "Öndər" nəşriyyat. 240 s.
3. Çəmənzəminli Y.V. (2005). Əsərləri. Üç cilddə. Bakı, Avrasiya Press.
4. Göyüşov Z. (1964). Azərbaycan maarifçilərinin əsərlərində əxlaq məsələləri. Bakı, Azərnəşr. 192 s.
5. Köçərli F. (2013). Balalara hədiyyə. Bakı, "Şərq-Qərb" nəşriyyatı. 157 s.
6. İbragim D., Sokpakbayev B. (2008). "Menim adım hoca" hikayesinde milli degerler – Türk xalqları ədəbiyyatı. II Beynəlxalq uşaq ədəbiyyatı konqresi. Bakı, Qafqaz Universiteti, 13–15 noyabr. 1–2 kitab; I kitab, s.52–55.
7. Ülgen E. (2008). Ahmet Kabaklının çocuk ve çocuk edebiyyatı üzerindeki düşünceleri ve "Ejderha taşı" adlı eseri üzerine bazı tespitler. Türk xalqları ədəbiyyatı. II Beynəlxalq uşaq ədəbiyyatı konqresi. Bakı, Qafqaz Universiteti, 13–15 noyabr. 1-2 kitab; I kitab, s.63–69.
8. Vətən dili (nəşrə hazırlayan Vüqar Qaradağlı). (2007). Bakı, CBS. 740 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 3 (277), 106-114
doi.org/10.48445/v0122-4485-7375-y

A Z Ə R B A Y C A N   Ə D Ə B İ Y Y A T I

# Azərbaycan dastanlarında multikultural dəyərlər, etnik və dini tolerantlıq

***Pərixanım Soltanqızı (Hüseynova)***
Filologiya üzrə fəlsəfə doktoru, dosent, Azərbaycan Dövlət Pedaqoji Universiteti.
Azərbaycan. E-mail: huseynovaperixanim1962@gmail.com
https://orcid.org/0000-0001-9391-6162

**XÜLASƏ**
Məqalədə multikultural dəyərlər, etnik və dini tolerantlıq araşdırılır. Tədqiqat "Kitabi-Dədə Qorqud", "Koroğlu" və "Əsli və Kərəm" dastanları üzərində aparılır. Öncə dastan növləri – qəhrəmanlıq və məhəbbət dastanları arasındakı oxşar və fərqli xüsusiyyətlər şərh edilir, islam, iudaizm, xristianlıq dinindən olan qadın obrazları arasındakı oxşar xüsusiyyətlərdən söz açılır, qəhrəmanlıq, məhəbbət motivləri önə gətirilir. "Əsli və Kərəm" dastanında erməni qızı ilə müsəlman oğlanın bir-birinə olan sevgisindən, nəticədə bu sevginin faciə ilə tamamlanmasından söhbət açılır. "Koroğlu" dastanında Koroğlu və onun dəliləri tarixi şəxsiyyətlər kimi araşdırılır. Burada islam qayda-qanunlarına əməl olunmaması, dini, milli mənsubiyyət fərqinin olmaması, tolerantlıq önə çəkillir. Azərbaycan xalqının qədim dövrlərdən bəri çoxmədəniyyətliliyi elmi-bədii cəhətdən əsaslı şəkildə şərh olunur.

**AÇAR SÖZLƏR**
Azərbaycan ədəbiyyatı, poetika, dastan janrı, multikultural dəyərlər, tolerantlıq

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 22.07.2023
qəbul edilib: 28.08.2023

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO. 3, VOL. 277, 106-114
doi.org/10.48445/v0122-4485-7375-y

**AZERBAIJAN LITERATURE**

# Multicultural values, ethnic and religious tolerance in Azerbaijani epics

***Parikhanim Soltangizi (Huseynova)***
Doctor of Philosophy in Philology, Associate Professor, Azerbaijan State Pedagogical University. Azerbaijan. E-mail: huseynovaperixanim1962@gmail.com
https://orcid.org/0000-0001-9391-6162

**ABSTRACT**
The article examines multicultural values, ethnic and religious tolerance. The research is conducted on the epics "Kitabi-Dada Gorgud", "Koroghlu" and "Asli va Karam". First, the similar and different features between the types of epics – heroic and love epics are explained, the similar features between female characters from Islam, Judaism, and Christianity are mentioned, and the motives of heroism and love are brought forward. In the epic "Asli and Karam" there is talk about the love of an armenian girl and a muslim boy for each other, and the end of this love with a tragedy. In the "Koroghlu" saga, Koroghlu and his madmen are investigated as historical figures. Here, non-observance of Islamic rules, lack of religious and national differences, and tolerance are emphasized. The multiculturalism of the Azerbaijani people since ancient times has been interpreted scientifically and artistically.

**KEYWORDS**
Azerbaijani literature, poetics, epic genre, multicultural values, tolerance

**ARTICLE HISTORY**
Received: 22.07.2023
Accepted: 28.08.2023

## Giriş / Introduction

Dastanlar Azərbaycan şifahi xalq ədəbiyyatının epik janrına daxildir. Onların sırasında həcminə görə “Kitabi-Dədə Qorqud”, “Koroğlu” və “Əsli və Kərəm” dastanları mühüm və əhəmiyyətli yer tutur.

Dastanlar ideya, forma və məzmun baxımından uzun tarixi inkişaf mərhələlərindən keçmiş, müxtəlif ad və terminlərlə *dastan* şəklində sabitləşmişdir. Belə ki, rəvayət, qissə, əhvalat, poema, epos və s. terminlər dastan sözünü əvəz etmişdir. Dastan çoxmənalı sözdür. Buna görə də epik növün nağıl, əfsanə, rəvayət janrlarının yanında da işlədilir. Dastanlar bölgü təsnifatına görə iki növə bölünür: qəhrəmanlıq və məhəbbət dastanları. Onların oxşar və fərqli xüsusiyyətlərinə nəzər salaq.

*Oxşar xüsusiyyətləri:*

Dastanların hər iki növü nəsr və nəzmlə yazılır. Burada qəhrəmanlar bir neçə funksiyanın daşıyıcısıdır: ozan, aşıq, rəqqas və s. Hər iki növ dastanda əfsanə, qeyri-adi qüvvəyə malikolma və s. folklor ünsürləri mövcuddur.

*Fərqli xüsusiyyətləri:*

Qəhrəmanlıq dastanlarının əsas ideyasını xalq, Vətən, el, azadlıq, xalqın ictimai mənafeyi, arzu və istəkləri uğrunda mübarizə, məhəbbət dastanlarının əsas ideyasını isə təmiz, ülvi məhəbbət, qəhrəmanların – aşiq və məşuqun şəxsi mənafeyi, arzu və istəkləri uğrunda mübarizəsi təşkil edir.

“Kitabi-Dədə Qorqud” dastanı bir müqəddimə, on iki boydan ibarətdir. Boylar müxtəlif vaxtlarda fərqli aşıqlar tərəfindən yaradılıb. Burada qəhrəmanların yerli və yadelli düşmənlərə qarşı mübarizəsindən bəhs olunur.

Epos köçəri-patriarxal qəbilə quruluşunun dağıldığı, feodal münasibətlərinin gücləndiyi dövrlərin məhsuludur. Dastanda əks olunan cəmiyyətin başçısı Bayandur xan olsa da, boylarda yalnız onun adı çəkilir. Oğuz bəyləri onun yanına mühüm bir məsələ ilə bağlı gedirdilər. Görüş zamanı bəylər onun əlini öpür, qarşısında diz çökürdülər. İlk dəfə igidlik göstərən bəy bir şərtlə, ad almaq məqsədilə onun yanına buraxılır və yalnız bundan sonra o, Oğuz igidləri sırasına daxil ola bilirdi.

Dastanın əsas qəhrəmanı Qazan xan və onun ətrafındakı igidlərdir. Əsərdə Salur Qazan – “qırış günü öndən təpən”, “Ulaş oğlu, tulu quşun yavrusu, qonur atın ayası, xan Uruzun ağası, Bayandur Xanın göyküsü” kimi təqdim olunur. Əsərdə evinin yağmalanması, oğlunun və özünün əsir alınması və s. Qazan xanı bir qəhrəman kimi səciyyələndirən əsas hadisələrdir. Qazan xan mərd, xalqını düşünən, ona sadiq, fədakar, məğlubedilməz, vətənpərvər, qorxmaz bir igid, qəhrəmandır. Oğlu Uruz da ona bənzəyir: atası kimi yenilməz bir igiddir. Dastanda Uruz düşmənə iki dəfə əsir düşür,

lakin məğlub olmur, ailəsinin, atasının şərəfini qoruyur. Hətta "qıyma-qıyma doğransa" belə anasından düşmənə özünü bəlli etməməsini xahiş edir.

Ailə şərəfi, namus və ləyaqətlilik Azərbaycan xalqının milli ideologiyasında, xarakterində, mənliyində mühüm amildir. Sadalanan bu xüsusiyyətlər Uruz obrazında cəmlənmişdir.

"Dədə Qorqud" boylarında kişilər kimi qadınlar da mərd və mübarizdirlər. Arvadın ərə, ananın oğula, bacının qardaşa qarşı sonsuz məhəbbətlə bağlılığı, nişanlı qızın nişanlısına sədaqəti − bütün bunlar Azərbaycan qadınına məxsus milli xarakterdən irəli gələn xüsusiyyətlərdir. Bu qadınlar cəsur və qorxmazdırlar. Onlar at minir, ox atır, düşməni susdururlar. "Dirsə xan oğlu Buğac" boyunda Dirsə xanın arvadı oğlunun ovdan geri dönmədiyini görüb atını minir, qırx incə belli qızla onu axtarmaq üçün dağlara çıxır və nəticədə yaralanmış oğlunu tapır. Uruz əsir düşdükdə Burla xatun silahlanır, oğlunu əsirlikdən qurtarmaq üçün igidlərlə birlikdə döyüşür. Bu yolda min bir əziyyətlə qarşılaşsa da, məqsədindən dönmür. Qanturalın nişanlısı Selcan xatun düşmənləri qovur, "yağının bir ucu mənim, bir ucu sənin" deyib yaralanmış ərinə kömək edir. Dastanda Selcan xatun şücaəti ilə, "ov ovlayıb, quş quşlaması", "sağına-soluna iki qoşa yay çəkməsi", "atdığı oxun yerə düşməməsi" ilə diqqət çəkir. Banuçiçək Beyrəklə ox atır, at sürür, güləşir. İgid bir qəhrəman olmasına əmin olduqdan sonra onunla ailə qurmağa razılıq verir.

Dastanda qadına, anaya hörmət mühüm əhəmiyyət daşıdığı kimi, əməkçi insan obrazları da əsas yer tutur. Sadə xalq zümrəsindən olan Qaraca Çoban öz igidliyi ilə düşmənə qalib gəlir, hətta düşmənin basqını zamanı iki qardaşını qurban verir. Sürüləri xilas edir, altı yüz nəfərlik düşmən ordusu ilə təkbaşına vuruşur. Daşı tükənsə də sürüdən qoyun, quzunu sapanda qoyub atmaqla düşmənə zərbə vurur. Onun igidliyi dastanda qeyri-adi formada təsvir olunur: Hər dəfə sapandını atanda iki, üç düşmən öldürür. Sapandı da qeyri-adidir. Sapandın içi "üç yaşar dana dərisindəndir, qolları üç keçi qılından toxunmuşdur, hər atanda on iki batman daş atır, atdığı daş yerə düşmür, düşəndə toz kimi sovrulur, ocaq kimi ovulur, daş düşən yerdə 23 il ot bitmir" [4, s.189].

Dastanda Qanlı Qoca oğlu Qanturalı öz obasından deyil, düşmən elindən qız istəyir. Onun ardınca Trabzona gəlir. Xristian başçısının qızına elçi düşən oğlanın cəsarətini, igidliyini yoxlamaq məqsədilə qoyduğu şərtləri qəbul edir. Oğuz qəhrəmanları, oğuz eli üçün xristian və ya müsəlman olmağın heç bir əhəmiyyəti yoxdur. Əsas məsələ odur ki, ailəyə, elə gələcək gəlin etibarlı, vəfalı olsun, ərinin arxasında dursun, onunla bərabər düşmənə qarşı igidlik, qəhrəmanlıq göstərsin, Oğuz qadınları kimi eyni keyfiyyətlərə malik olsun. Selcan xatun da öz şücaətini göstərməklə bunu təsdiqləyir.

Aslana, qara buğaya, qara dəvəyə qəhrəmanlıqla qalib gələn Qanturalı Selcan xatunla birlikdə vətənə qayıdır. Lakin sonradan peşman olub, şərtini pozan ata, qızını geri qaytarmaq üçün onların ardınca qoşun göndərir. Selcan xatun Qanturalı ilə birgə atasının qoşununu məğlub edir.

Bu xüsusiyyət başqa bir formada xristian Bayburd hasarı bəyin qızında da var. O, atasının əsiri müsəlman oğlana, Beyrəyə aşiq olur və özünü təhlükəyə ataraq onu zindandan azad edir. Sevgisinə sədaqətilə qəhrəmanlıq səviyyəsinə yüksəlir. Düzdür, xristian qızı Beyrəklə sonra gəlib onu aparmaq, halalı etmək şərtini kəsir. Lakin oğlan vədinə xilaf çıxır, onun ardınca gəlmir. Bu, qızın xristian olması ilə əlaqəli deyil, nişanlısı Banuçiçəyə olan sədaqətilə bağlıdır. Onu da qeyd edək ki, Beyrəklə xristian qızı arasında eşq yaşanmamışdır. Bu sevgi birtərəfli, qarşılıqsız olmuşdur. Hər dəfə düşmən qızı Beyrəklə yaxınlıq etmək istədikdə, o, aralarına qılınc qoymuş, vədinə əməl etmişdir. Oğuz qəhrəmanlarına da ancaq bu yaraşırdı. Fikrimizcə, xristian qızı öz həyatını təhlükəyə atıb Beyrəyin həyatını düşündüyünə görə Banuçiçək Beyrəyi əfv edib xristian qızını iltifatla qəbul edə bilərdi. Çünki Oğuz xanımları bu hallara rəqiblik göstərməzdi. Beyrək xristian qızı ilə eşq yaşasaydı, yəqin ki, vədini unutmazdı. Çünki Oğuz igidlərinin şəxsiyyəti bunu deməyə əsas verir.

Onu da əminliklə deyək ki, alim-tədqiqatçı Sevinc Quliyevanın qeyd etdiyi kimi, "son illərdə aparılan tədqiqatlarda "İç Oğuza Dış Oğuz asi olub Beyrək öldüyü boy" da Beyrəyin xaincəsinə qətlə yetirilməsini verdiyi anda xilaf çıxması ilə izah edirlər" [3, s.83]. Bu fikirlə razılaşmayaraq qısaca onu deyə bilərik ki, Beyrək Qazan xana xəyanət etmədiyi üçün öldürülür.

Mən Qazanın nemətini çox yemişəm,
Bilməzsəm, gözümü tutsun!
Qaraçıqda Qazlıq atına çox minmişəm,
Bilməzsəm, tabutum olsun!
Böyük, geniş otağına çox girmişəm,
Bilməzsəm, zindanım olsun!
Mən qazana dönük çıxmaram, qəti bilin!
[4, s.305]

Biz, Sevinc Quliyevanın "azərbaycanlı təfəkküründə kimliyindən – milliyətindən, hansı xalqa mənsub olmasından asılı olmayaraq verdiyi sözə sadiqliyin insan üçün başlıca müsbət əxlaqi dəyər" hesab olunması fikri ilə tam razılaşırıq [3, s.83].

Eposda həm müsəlmanlara, həm də xristianlara xas oxşar süjetlərə rast gəlinir. Məsələn, xristian ata qızını verəcəyi oğlanın cəsarətini yoxlamaq niyyətilə tələblər qoyur, Banuçiçək ərə gedəcəyi oğlanın igidliyini sınamaq üçün onunla döyüşür; ox atır, qılınc, nizə oynadır. Bu motivlər müsəlman aləmində ənənəyə çevrildiyi kimi, xristian dünyasında da öz əksini tapır və bəşəri səciyyə daşıyır.

Xristian qızının eposdakı təsvirləri, atasının əsiri, düşmən elindən olan oğlana aşiq olması, ona sədaqəti, inamı, trabzonlu xristian qızı Selcan xatunun Qanturalıya ərə getməsi, onunla birgə atasının qoşununa qarşı vuruşması − bütün bunlar xristianlar üçün də dini mənsubiyyət fərqliliyinin önəmli olmadığını təcəssüm etdirir. Əsrlərdən gələn çoxmədəniyyətlilik, qan qohumluluğu, dini azadlıq gündəlik həyatımızda da özünü göstərir.

Şərqşünas alim Nəriman Qasımoğlunun qeyd etdiyi kimi, “Dastandakı qəhrəmanların müsəlman dindarlığı mühafizəkarlıqdan xeyli uzaq bir məzmundadır” [9, s.56].

“Əsli və Kərəm” mövzu, ideya və məzmun cəhətdən hər iki dastandan fərqlidir. Qəhrəmanlıq dastanlarında məhəbbət motivlərini nəzərə alsaq, bu baxımdan da onlardan fərqlənir. Belə ki, yuxarıda qeyd etdiyimiz kimi, “Kitabi-Dədə Qorqud” və “Koroğlu” dastanlarında sevgi azaddır, ona mane olacaq qüvvə yoxdur. “Əsli və Kərəm”də erməni qızına aşiq olan Kərəm və onu sevən Əsli arasında Qara Keşiş keçilməz səddir. O, fitnə-fəsad törədən din təəssübkeşlərinin, mühafizəkar ruhanilərin ümumiləşdirilmiş obrazıdır. Qara Keşiş, adından bəlli olduğu kimi şər qüvvələri təmsil edən lənətlənmiş obrazdır. Onun əməlləri ucbatından aşiqlər cismən qovuşmayıb sonları faciə ilə bitsə də, sevgiləri ilə dini fanatizmə, feodal ehkamlarına qalib gəlirlər. Xristian-müsəlman dini fərqliliyi əsrlər boyu bir-birini sevən gənclər arasında bu və ya digər məsələlərlə bağlı ciddi problem yaratsa da, millətlər arasında olan sevgi bağının kökünü kəsə bilməmişdir. Bu reallıqlar bütün dövrlərdə bədii əsərlərin müxtəlif janrlarına köçürülmüşdür. Məsələn, “1905-ci ildə” (C.Cabbarlı), “Bahadır və Sona” (N.Nərimanov), “Otellonun oğlu” (F.Qoca), “Şeyx Sənan” (H.Cavid) və başqa əsərlər bu nümunələrdəndir.

“Əsli və Kərəm” mövzusu ilə bağlı müxtəlif janrlarda əsərlər yaranmışdır. “Əsli və Kərəm” operası, “Kərəmi” və “Yanıq Kərəmi” aşıq mahnıları bu mənada ən məşhur nümunələrdəndir.

“Əsli və Kərəm” dastanında bir-birini sevən erməni və Azərbaycan gənclərinin qanlı faciəsi verilmişdir. Xalq qaragüruhçu din nümayəndələrini nifrətlə damğalayaraq göstərir ki, həqiqi sevgiyə heç bir din, millət ayrılığı mane ola bilməz [6, s.59].

“Koroğlu” dastanında obrazların yaşamında multikultural dəyərlər, çoxmədəniyyətlilik özünü göstərir. Çənlibelə gələn qızların hər biri bir eli, bir obanı təmsil edir: Nigar xanımla Mehri xanım istanbullu, Telli xanım ərzurumlu, Ruqiyyə xanım bəyazidli, Hüri xanım qarslı, Dünya xanım ərzincanlı, Məhbub xanımla Şirin xanım rumlu və b. Onların hamısı xotkar, paşa, sultan, xan, bəy qızlarıdır. Hər biri öz arzu və istəyi ilə Çənlibelə gəlmiş və bir məkanda mehriban ailə kimi yaşayırlar. Onların içərisində xristianlığı təmsil edən qızlar da istisna deyil. Məhbub xanımla, Şirin xanım rumlu xristian qızlarıdır. Buradakı qadınlar qəhrəmanlıqda, döyüşkənlikdə, sədaqətdə heç də “Kitabi-Dədə Qorqud” boylarındakı qadınlardan geri qalmırlar.

Əsərin əsas qəhrəmanı olan Koroğlu Təkə-Türkmən elindən qəssab Alı kişinin oğlu Eyvazı oğulluğa götürür. Bu işə razılıq verən qəssab Alı Koroğluya “namına qıyıb Eyvazı sənin əlindən almıram. Apar get, amma gözün üstündə olsun” − deməklə həm də ona inamını ifadə edir.

Məlumdur ki, Koroğlu tarixi şəxsiyyətdir. O, XVI əsrin sonu, XVII əsrin əvvəllərində Türkiyədə baş vermiş Cəlalilər adı ilə tanınan məşhur xalq üsyanlarında iştirak etmişdir. Bir xalq qəhrəmanı kimi Koroğlu haqqında dastanın qollarında söylənilən rəvayət və hekayələr də həmin dövrə təsadüf edir. Bu, əsasən, qədim Göytürklər dövründə Türkiyə ilə İran arasında gedən savaşların əsasında yaranması ilə səciyyələnir. Buna əsaslanaraq deyə bilərik ki, “Koroğlu” dastanında Koroğlunun ətrafına toplanan igidlər də Cəlalilərdir. Onlar müxtəlif xalqların ictimai mənafeyi, arzu və istəkləri uğrunda vuruşmuş, ədaləti, haqq işini təcəssüm etdirmişlər. Dastanın üç − Türkmən, Azərbaycan, Kiçik Asiya variantları mövcud olsa da, əsasını Azərbaycan variantı təşkil edir.

Epos ayrı-ayrı etnik qrupa malik Azərbaycan xalqının “Kitabi-Dədə Qorqud”dan sonra qədim tarixi qəhrəmanlıq salnaməsidir.

Koroğlunun əsl adı Rövşəndir. Atası Alı kişinin gözləri Həsən xan tərəfindən haqsız olaraq çıxarılır. Bu hadisədən sonra Rövşən xalq tərəfindən Koroğlu ləqəbi ilə tanınır. Atasının qisasını alan Koroğlu xalqın vəkilinə çevrilir. Xalqa arxalanan qəhrəman dəlilərilə birgə apardığı mübarizədə qalib gəlir. Onun ətrafına yığılan dəlilər – Dəli Həsən, Xan Eyvaz, Dəmirçioğlu, İsabala, Dəli Mehtər, Dəli Əhməd və digərləri xalqın igid oğullarıdır. “Dəli” sözü bədii ədəbiyyatda bir neçə mənada işlədilir. Bu ifadə yaşadığı cəmiyyətin eybəcərlikləri ilə mübarizədə özünü dəliliyə vurmağa məcbur olan, həqiqətdə isə dəlilik dərəcəsinə çatan, psixoloji cəhətdən sarsılan, dəli dolu, qorxmaz insanlara deyilir. Qəhrəmanlıq dastanlarında isə “dəli” sözü igidlik, qəhrəmanlıq, dəli-dolu, dəliqanlı anlamında işlənilir. Bu, haqsızlığa dözə bilməyən, həqiqət uğrunda savaşanlara aid bir ifadə, simvoldur ki, “Kitabı-Dədə Qorqud” dastanından “Koroğlu”

eposuna da transfer olunub. Ümumiyyətlə, "Kitabi-Dədə Qorqud" eposundakı obrazlar sonradan yaranmış Azərbaycan yazılı, klassik və şifahi xalq ədəbiyyatında yansıma şəklində özünü ifadə edir. Həmçinin qəhrəman qadın obrazlarının (Burla xatun, Banuçiçək, Selcan xatun, Nigar, Telli, Tomris, Şirin, Nüşabə, Həcər və b.) igidliyi bu obrazlarda özünü ifadə edir. "Dədə Qorqud"da işlənən at obrazları Toğlu başlu Duru ayğır Düratı, Keçi başlı keçər ayğır Qıratı təmsil edir. Beyrəyin boz atı, Şirinin Səbdizi ("Xosrov və Şirin"), Qaçaq Nəbinin ("Qaçaq Nəbi"), Qaçaq Kərəmin ("Qaçaq Kərəm"), Cahandar ağanın ("Dəli Kür") boz atları sahibinə sədaqəti, igidliyi, dil anlaması və çətin məqamlarda qəhrəmanı düşdüyü vəziyyətdən çıxartması kimi xüsusiyyətlərilə ifadə olunub" [1, s.6]. Dastanda Koroğlu igidlərinin məskəni, vətəni – Çənlibeldir. Onlar düşmənin ayağını Çənlibelə dəyməyə qoymurlar.

"Kitabi-Dədə Qorqud" və "Koroğlu" eposunun həm qəhrəmanlıq, həm də məhəbbət dastanlarının yaranmasında mühüm əhəmiyyəti olmuşdur. Onu da qeyd edək ki, hər iki dastanda məhəbbət motivləri dərin lirizmlə ifadə edilir.

Dastanda dini, milli mənsubiyyət fərqi yoxdur. Burada dəlilər ayrı-ayrı tayfa, qəbilə və xalqın nümayəndələrini təmsil edirlər. Bu, bəzilərinin adlarından da bəllidir. Məsələn: Ərəboğlu, Kürdoğlu, Gürcüoğlu və b. Onların sırasında ləzgi, fars, türk igidləri də var.

Qırx min gürcü, ləzgi, Rüstəm övladı,
Çəkər qılınc, kəsər dəmir, poladı.
Salar cana qorxu, Koroğlu adı
Koroğlu üstünə sirlərlə gəlir.

"Koroğlu" dastanında islam dininin qayda-qanunlarına əməl olunmur. Hətta dəlilərdən birinin adı Tanrıtanımazdır. Burada ruhani obrazına rast gəlmək mümkün deyil. Koroğlu və onun dəlilərini bir məsələ düşündürür və birləşdirir: düşmən birdir. Bütün xalqların istismarçı təbəqələri − zülmkar şahlar, bəylər, din mühafizəkarları və başqaları − onların hamısı antifeodal azadlıq mübarizəsində həmrəydirlər.

## Nəticə / Conclusion

Azərbaycan ədəbiyyatı bütün zamanlarda multikultural dəyərləri, tolerantlığı tərənnüm və təbliğ etmişdir. Hazırda da bu problemlər ədəbiyyatımız qarşısında duran önəmli məsələlərdən biri hesab edilir.

**İstifadə edilmiş ədəbiyyat / References**


1. Soltanqızı Hüseynova P. (2017). Müasir və klassik ədəbiyyatın aktual məsələləri (Dərs vəsaiti). Bakı, Elm və təhsil.
2. Soltanqızı Hüseynova P. (2023). Azərbaycan ədəbiyyatı. Multikultural dəyərlər və tolerantlıq (Monoqrafiya). Bakı, "Müəllim" nəşriyyatı.
3. Quliyeva S. (2021). Azərbaycan ədəbiyyatında multikulturalizmin bədii inikası (Monoqrafiya). Bakı, Elm.
4. Kitabi-Dədə Qorqud. (2004). Əsil və sadələşdirilmiş mətnlər. Bakı, Öndər.
5. "Koroğlu". (2004). Bakı, Çaşıoğlu.
6. Əfəndiyev P. (2011). Azərbaycan folklorşünaslığının problemləri. Bakı, Elm və təhsil.
7. "Əsli və Kərəm". (2020). Bakı.
8. Azərbaycan dastanları. (2005). Beş cilddə, II cild. Bakı, "Lider" nəşriyyatı.
9. Qasımoğlu N. (2016). Multikultural irsimizdə dini əks-səda. "Multikulturalizm" ədəbi-bədii elmi publisistik jurnal, № 4.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 3 (277), 115-128
doi.org/10.48445/s3678-3844-0756-y

AZƏRBAYCAN ƏDƏBİYYATI

# Nizami Gəncəvinin “Xəmsə”sində insan hüquqlarının təbliği

***Aynur Səfərli***
Filologiya üzrə fəlsəfə doktoru, müəllim, Dil hazırlığı kafedrası, DİN Polis Akademiyası. Azərbaycan. E-mail: seferli_1988@bk.ru
https://orcid.org/0000-0002-0110-4659

**XÜLASƏ**
Məqalədə dahi Azərbaycan şairi Nizami Gəncəvi irsində insan haqlarının təbliği, hökmdar ədaləti, hüquq düşüncəsi kimi aspektlərə aydınlıq gətirilməyə çalışılmışdır. “Xəmsə”yə daxil olan poemalarda qeyd olunan məsələlər incələnmiş, ədalətli hökmdar məsələsi şairi düşündürən vacib məsələlərdən biri olduğu diqqətə çatdırılmışdır. Ümumiyyətlə, Nizami üçün sadə xalq kütləsinin hüquqlarının tapdanmaması ən vacib məsələlərdən biri olmuşdur.

**AÇAR SÖZLƏR**
Nizami irsi, “Xəmsə”, ədalətli hökmdar, insan haqları, hüquqi düşüncə

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 11.08.2023
qəbul edilib: 15.09.2023

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO. 3, VOL. 277, 115-128
doi.org/10.48445/s3678-3844-0756-y

AZERBAIJAN LITERATURE

# Promotion of human rights in Nizami Ganjavi's "Khamsa"

***Aynur Safarli***
Doctor of Philosophy in Philology, teacher, Department of Language Training, The Police Academy of the MIA. Azerbaijan. E-mail: seferli_1988@bk.ru
https://orcid.org/0000-0002-0110-4659

**ABSTRACT**
The article tried to clarify such aspects as the promotion of human rights, ruler's justice, legal thought in the legacy of the great Azerbaijani poet Nizami Ganjavi. The issues mentioned in the poems included in "Khamsa" have been elaborated, and it has been brought to attention that the question of a just ruler is one of the important issues that the poet thinks about. In general, for Nizami, the non-violation of the rights of the common people was one of the most important issues.

**KEYWORDS**
Nizami's legacy, "Khamsa", fair ruler, human rights, legal thought

**ARTICLE HISTORY**
Received: 11.08.2023
Accepted: 15.09.2023

## Giriş / Introduction

Ədalətlilik prinsipi ümumi prinsip olub, hüququn bütün sahələrində təşəkkül tapmışdır. Hər bir hüquq sahəsi ədalətlilik prinsipini özünəməxsus şəkildə tədqiq edərək işləyib hazırlamışdır. Məsələn, əmək hüququ ədalətlilik prinsipi əsasında "ədalətli əmək şəraitinin təmin edilməsi prinsipi"ni yaratmışdır. XII əsr ictimai-siyasi və hüquqi fikrin ən görkəmli nümayəndəsi, söz və ideyalar dünyasının əvəzolunmaz siması Nizami Gəncəvi öz dövrünün və gələcək dövrlərin humanist, demokratik, habelə sosial ədalət ideyalarının parlaq təbliğatçısı olmuşdur. İnsan haqlarının təbliği və onların müdafiəsi, şəxsiyyət azadlığı, şəxsiyyətin iradə müstəqilliyi, bəşəriyyətin mədəni tərəqqisində dönüş nöqtələrindən olan İntibah dövrünün mənəvi mahiyyətinin aşkar olunmasına çevrilmiş səlis humanizm təlimi Nizaminin sosial-siyasi görüşlərinin sosial ədalət hissəsində öz parlaq təcəssümünü tapmışdır.

O, dünya ədəbiyyatı tarixinə məsnəvi formasında yazdığı beş poemadan ibarət "Xəmsə" ("Beşlik") müəllifi kimi daxil olmuşdur. 1177-ci ildə bitirdiyi "Məxzənül-əsrar" ("Sirlər xəzinəsi") adlı ilk poeması ona böyük şöhrət qazandırmışdır. III Toğrulun sifarişi ilə qələmə aldığı "Xosrov və Şirin" poemasını 1180-cı ildə bitirmiş və Məhəmməd Cahan Pəhləvana göndərmişdir. Cahan Pəhləvanın ölümündən sonra taxta çıxan Qızıl Arslan Gəncə yaxınlığında öz çadırında şairlə görüşmüş, nəsihətlərini dinləmiş və ona "Həmdünyan" adlı bir kənd bağışlamışdır. 1188-ci ildə Şirvan hökmdarı I Axsitan Nizamiyə "Leyli və Məcnun" mövzusunda bir əsər yazmağı sifariş etmişdir. O, bundan boyun qaçırmaq istəsə də, oğlunun təkidi ilə təklifi qəbul etmiş, az müddətdə "Leyli və Məcnun" poemasını (Şərqdə ilk dəfə) yaratmışdır. 1196-cı ildə Əlaəddin Körpə Arslanın adına "Yeddi gözəl" əsərini, nəhayət, ömrünün sonlarına yaxın bütün ədəbi-estetik, ictimai-fəlsəfi və hüquqi görüşlərini yekunlaşdırdığı "İskəndərnamə" (təqribən 1203-cü il) poemasını qələmə almışdır.

20 Aprel 2012-ci ildə İtaliyanın paytaxtı Roma şəhərindəki məşhur "Villa Borghese" parkında Nizami Gəncəvinin abidəsinin açılışı olmuşdur. Açılışda Neapol Şərqşünaslıq Universitetinin professoru Mineli Bernardini çıxış edərək bildirmişdir ki, "dahi Nizaminin yaradıcılığı Azərbaycan xalqına xidmət etməklə yanaşı, digər xalqlar üçün də böyük əhəmiyyət daşıyır"[2].

Nəhəng sənətkarın xalqımızın mənəviyyatının ayrılmaz hissəsinə çevrilmiş parlaq irsi əsrlərdən bəri Şərqin misilsiz mədəni sərvətlər xəzinəsində özünəməxsus layiqli

[2] http://injuria.az/news/nizami-gencevinin-huquq-dusuncesi

yerini qoruyub saxlamaqdadır. Nizami irsi elə bir xəzinədir ki, orada türkçülük, folklor, mənəvi dəyərlər, iqtisadiyyat kimi məsələlər lazımi qədər işıqlandırılmışdır.

N.Gəncəvi öz "Xəmsə"si ("Sirlər xəzinəsi", "Xosrov və Şirin", "Leyli və Məcnun", "Yeddi gözəl", "İskəndərnamə") ilə dünya ədəbiyyatına tamamilə yeni bir poetik səs, nəfəs gətirmişdir.

Yaradıcılığı bütün dünyada qlobal hadisə olan Azərbaycan şairinin irsində təkcə Şərq deyil, eyni zamanda Qərb ədəbi-mədəni dəyərləri də öz kamil sintezini tapmışdır. Əslində, Nizami yaradıcılığını tam mənası ilə klassik dövrün yeni mərhələsi kimi qiymətləndirmək olar. Çünki məhz Nizaminin yüksək humanist fikirlərində aydın təfəkkürlə hadisələrə, insana, cəmiyyət həyatının məna və mahiyyətinə rasional, məntiqi yanaşma tərzinin şahidi oluruq.

**Nizami Gəncəvi yaradıcılığında qadın haqları məsələsi**

Nizami sənətinin ölməzliyini təmin edən elementlərdən biri də, yaradıcılığında dövrünün və gələcək dövrlərin humanist və demokratik istiqamətli fikirlərinin, habelə sosial ədalət ideyalarının parlaq şəkildə təbliğidir. İnsan haqlarının təbliği və onların müdafiəsi, şəxsiyyət azadlığı, şəxsiyyətin iradə müstəqilliyi mütəfəkkirin sosial-siyasi görüşlərinin sosial ədalət hissəsində öz parlaq təcəssümünü tapır. Əsərlərində qadın haqlarının təbliğinə xüsusi yer ayıran dahi filosofun yaradıcılıq meyarlarının əsasını qadın obrazları təşkil edir.

Bir çox tədqiqatçılar, xüsusən Qərb araşdırmaçıları Şərq ədəbiyyatında qadının "ikinci dərəcəli" personaj kimi təqdim olunduğunu iddia edirlər. Bu, kökündən yanlış olan iddiadır. Həmin qeyri-obyektiv düşüncələrin ən başlıca təkzibedici arqumenti kimi böyük Azərbaycan şairi Nizami Gəncəvinin "Xəmsə"sini nəzərdən keçirmək kifayətdir. Kişi və qadın münasibətləri sənətkarın əsərlərində humanist ideyalar işığında təqdim edilir. Onun qəhrəmanları gender ayrı-seçkiliyinə qarşı çıxan, daim özünü təkmilləşdirməyə cəhd edən, nəcib ideyalar uğrunda mübarizə aparan insanlardır.

Nizami hüquqi ayrı-seçkiliyə yol vermədən ədalətin bərqərar olmasının tərəfdarı idi. Məhz bu səbəbdən ədalətə müxtəlif prizmadan baxaraq onu insanlara aşılamaq niyyətində idi. Buna görə ədib ədaləti gah hakimiyyətdə, gah məhəbbətdə, gah da digər hallarla oxucularına göstərməyi bacarmışdır. Beləliklə, Nizami Gəncəvinin ədalətlilik prinsipi hökmranlıq və məhəbbət istiqaməti üzrə inkişaf etmişdir. Şair əsərlərində daim qadın azadlığının təbliğatını aparmış və onu vəsf etmişdir. Onun qadın qəhrəmanları fəal həyat mövqeyi seçən, kişilərlə bərabər səviyyədə dayanan, hətta bəzi məqamlarda öz ər və qardaşlarından daha tədbirli və uzaqgörən insanlardır. Nizami, qadın azadlığı haqqında fikirlərini türk köçəri tayfalarından olan qıpçaqlar

barədə gözəl bir hekayəti ilə nəql edir. Həmin hekayətdə deyilir: *“Qafqaza getmək üçün Çindən hərəkət edən İskəndər ordusu qıpçaq çölündə düşərgə salır. İskəndər buradakı qadınların açıq gəzərək kişilərdən qaçmadığını görür. Əsgərlərinin ehtiyacından ehtiyat edən imperator qonağı olduğu məmləkət əhalisinin irz və namusuna təcavüzə yol verməmək üçün qıpçaq bəylərini toplayır. İskəndər Qıpçaq bəylərinə böyük iltifat göstərməsi barəsində fikirlərini bildirdikdən sonra qadınlarının örtülü gəzməsini tövsiyə edir: “Qadın daşdan, dəmirdən də olsa yenə qadındır. Qadının üzü örtülü olmalıdır” deyir. “Özünü başqalarına göstərən bir qadın nə özünün, nə də ərinin şərəf və heysiyyətini qoruya bilməz!”, – deyə xəbərdarlıq edir. Çöllülər padşahın bu sözlərini diqqətlə dinlədikdən sonra, nə cavab versələr yaxşıdır?”* [3, s.6] Qıpçaq bəyləri İskəndərə deyirlər: *“Padşaha itaət edirik. Zati-ailəsinə sədaqətli olmağa and içmişik, əhdimizdə dayanmışıq. Fəqət üz örtmək bu əhdə daxil deyildir, çünki bu, qıpçaq adətinə uyğun gəlmir. Sənin adətin üz qapamağı tələb edirsə, bizim adət də göz qapamağı tələb edir. Başqasının üzünü görməmək lazımdırsa, üzü deyil, gözü qapamaq gərəkdir. Padşah bizə qəzəblənməsin: üz örtülsə, arxayamı baxılacaq?! Bizim gəlinlərin otağında yad bir kəs yoxdursa, bu kifayətdir. Padşahım, sən gəl, bu xalqın üzünü niqab ilə gizlətmə! Daha yaxşısı budur ki, örtüyü öz gözlərinə as!”* [3, s.6]

Qadın hüquqlarının müdafiəçi obrazı olan Məhin Banu eyni zamanda türk qadınlarının timsalıdır. N.Gəncəvinin əsərlərində “türk” amili xüsusilə önə çəkilmiş və Azərbaycanın türklərin qədim vətəni olması fikri açıq şəkildə qeyd edilmişdir. Nizami “Xosrov və Şirin” poemasında “Dərbənd dənizinin bir sahmanında”, “Arrandan başlamış Ərmənə qədər” hökmdarlıq edən Məhin Banunun dilindən türklüyümüzün qədimliyini bu cür ifadə edir: *“Əgər o aydırsa, biz afitabıq, O, Keyxosrov, bizsə Əfrasiyabıq (Alp Ər Tonqa - F.Ə.)”* [1, s.85]. Deməli, Arran-Bərdə hökmdarı Məhin Banu özünü Əfrasiyabın, yəni türklərin nəslindən hesab etmiş, N.Gəncəvi də Məhin Banunun dili ilə bu xalqın türkköklü olması və türklərin Əfrasiyab (Alp Ər Tonqa) kimi hökmdarının olması ilə fəxr edir [8, s.247]. Şair öz əsərlərində qadın hüquqlarının toxunulmazlığı fikrini qabarıq şəkildə ifadə etmişdir. N.Gəncəvi xüsusilə “İskəndərnamə” poemasında türk xalqlarının qədimliyini, onların adət-ənənələrini böyük ustalıqla əks etdirmişdir. Bu əsərində Makedoniyalı İskəndərin Qıpçaq ellərinə səfərindən bəhs edən sənətkarın məqsədi türklərin yalnız Azərbaycanda deyil, Orta Asiya və bütün Qafqaz ellərində qədim xalqlardan biri olduğunu sübuta yetirmək olmuşdu.

Qeyd etdiyimiz kimi, dahi şair öz əsərlərində bu gün də aktual olan qadın hüquqlarını təbliğ etmiş və demək olar ki, ona qədər qadına bu qədər yüksək qiymət

verən şəxs olmamışdır. Şairin yaradıcılığının ilk qəzəlindən tutmuş “Xəmsə”nin bütün poemalarında qadın hüquqları öz əksini tapmışdır. Maraqlıdır ki, bir çox şair və yazıçıların həyat tərzi ilə yazdıqları üst-üstə düşmür, tamamilə ziddiyyət təşkil edir. Bu sahədə də Nizami Gəncəvi ən qabaqcıl yerlərdən birini tutur. Qadına verdiyi dəyər şairin şəxsi həyatında da öz əksini tapmışdır. Belə ki, Dərbənd şahı Afaq adlı kənizi ona hədiyyə edir. Nizami Gəncəvi Afaqın çox saf və təmiz olduğunu görür, ona nəinki qulluqçu kimi yanaşır, hətta onu özünə ömür-gün yoldaşı seçir. Şair Afaqla çox xoş günlər keçirdiyini daim öz əsərlərində xatırlayır. Oğlu Məhəmmədə də ananı, vətəni, qadını sevməyi tövsiyə edir. Afaqın ölümü Nizami Gəncəvini çox sarsıdır. Şair əsərlərində bunu dönə-dönə etiraf edir.

Dünya şöhrətli Nizami Gəncəvinin ilk iri həcmli əsəri 1174–1175-ci illərdə yazıldığı təxmin edilən “Sirlər xəzinəsi” poemasıdır. Yaxın və Orta Şərq ədəbiyyatında didaktik poema janrının ən qiymətli nümunəsi hesab olunan bu əsər sanki şairin yaradıcılıq manifestidir. 20 söhbət və 20 kiçik hekayədən ibarət poemada şair xalq və hökmdar problemini həll etməyə çalışmışdır. Bu məqsədi bəzən ədalətli hökmdar ideyası şəklində ifadə etmişdir. O, aktual bir məsələ kimi hökmdarın xalqla rəftarı məsələsini həll etməyə çalışır. Dövrünün zalım hökmdarlarını gah axirətlə qorxudur, gah zülmün bu dünyada ona zərər yetirəcəyini xatırladır, gah da xalqın qəzəbi ilə hədələyir. Dövrün əliqılınclı ağaları haqqında bu şəkildə danışmaq cəmiyyətdə baş verən irəliləyiş və xalq şüurunun oyanması idi. Bu o dövr ədəbiyyatı üçün yeni hadisə idi [5, s.81].

Ədalətli olmaq, mərdlik, düzlük, humanizm, vətənə, xalqa hörmət və əməyə məhəbbət kimi gözəl hissləri əks etdirən poemada qadının haqq və hüququnu tələb etməsi “Sultan Səncər və dul qadın” mənzuməsində çox inandırıcı bir şəkildə verilmişdir:

Zülm edib bir dul qarıya çox uddurmuşdular qan,
O da Sultan Səncərin tutaraq yaxasından,
Dedi: «Səndə zülm az görməmişəm qulaq as,
Səndə gördüyüm zülm əsla hesaba sığmaz.
Bir kefli darğa gəlib evimdə məni döydü-döydü,
Salıb təpik altına məni doyunca söydü-söydü.
Mən günahsız qarının saçlarına atıb əl,
Üzü üstə sürüdü evdən çölə əlbəəl”

[2, s.13].

Ədalətlilik prinsipi Nizami Gəncəvinin iki əsərində – "Sirlər xəzinəsi" və "Xosrov və Şirin"də geniş şəkildə təcəssüm olunmuş, dəfələrlə təkrarlanmaqla diqqətə çatdırılmışdır. Hətta "Sirlər xəzinəsi" əsərində "Hökmdarın xalqa qayğısı və ədaləti" və "Ədalətli və insaflı olmaq haqqında şaha nəsihət" adlı fəsillər nəzərdə tutulmuşdur[3]. Ədalət bəzən cinayəti cəzasız qoyur, onu böyük ictimai təhlükəli əməl hesab etməyərək bağışlayırdı. Ədib bunu "Sirlər xəzinəsi" əsərində belə göstərirdi:

Ulu tanrı, yanında xəcalətəm mən sənin,
Günahını bağışla üzüqara bəndənin.
Hökmünə, fərmanına baxmamışam çox zaman,
Aman yoxdur kimsədən, özün aman ver, aman!
Ya cəza tonqalında yanmağa göndər məni,
Ya da mərhəmətinlə bəndəyə döndər məni
Hamıdan xəcalətli, kimsəsizcə bir kəsi
Bağışladı insaflı kimsəsizlər kimsəsi
[2, s.93].

Şair hətta yer üzünü ədalətlə xilas etməyin mümkünlüyünü vurğulayır. Məhz insanın ölümündən sonra əməli, ən əsası ədaləti dünyada, insanların yaddaşında qalmış olur. Ədalətdən başqa dünyada heç bir şeyin əbədi qalmadığını, ədalət tərəzisini əyməyin, təsir etməyin qeyri-mümkünlüyünü diqqətə çatdırmaq istəyir. Ədalətin zor gücünə pozulmasının mümkünsüzlüyünü çatdırır.

Göründüyü kimi, Nizami Gəncəvi dul və yaşlı qadının dili ilə hüquqlarını qorumaq üçün məmurların özbaşınalığından danışır. İnsanları vətənə və qadına düzgün münasibətin bərqərar olacağına çağırır.

Nizami Gəncəvinin ikinci poeması "Xosrov və Şirin"də qadınların azadlıq hüququ, onların öz haqqını tələb etməsi, "ana" kimi yüksək bir ada layiq olması və cəmiyyətin aparıcı qüvvəsi olması, bəşəriyyətin onsuz yetim qalması ideyası bariz şəkildə göstərilmişdir. Nizami Gəncəvi bəşəriyyətin bütün təbəqələrini, o cümlədən qadını daim azad hüquqlu görmək istəmişdir. Əsərin sonunda eyş-işrətlə məşğul olub Şirinə qədər Məryəm və Şəkərlə evlənən Xosrov ölüm ayağında belə Şirini oyadıb bir içim su istəmir, sevdiyinə qıymır. Demək ki, qadın öz sevgi və dürüstlüyü ilə Xosrov kimi bir insanı tərbiyələndirə bilmişdir. Bu, hər şeydən əvvəl şairin öz arzusu kimi səciyyələndirilməlidir.

[3] http://injuria.az/news/nizami-gencevinin-huquq-dusuncesi

**Nizami Gəncəvinin "Xosrov və Şirin" poemasında ədalətli hökmdar məsələsi**

"Xosrov və Şirin" poeması isə Nizaminin romantik əsərlərinin, yəni əsasında roman süjeti duran bitkin obrazlar qalereyasına malik poemalarının birincisidir. Əsərin mövzusu İran Sasani hökmdarları sülaləsinin tarixindən götürülsə də, şairin bir çox problemlərin təqdimində öz doğma mühitinin hadisə, şəxsiyyət və problemlərindən çıxış etməsi şübhə doğurmur. "Xosrov və Şirin" poemasının quruluşu olduqca maraqlı və orijinaldır.

Əsərdə Nizami Hürmüz şahın əhalinin xeyrinə qoyulmuş qanunları pozan doğma oğlunu amansız cəzalandırdığını göstərməklə qanun qarşısında hamının bərabər olması, cinayətin hamı üçün cəzalandırılmalı əməl olması, dövrü üçün aktual, həm də qabaqcıl bir ideya irəli sürür. Qeyd edək ki, XII əsrdə qanunlar vəzifəli şəxslər tərəfindən tez-tez pozulurdu, buna baxmayaraq onlar məsuliyyətə cəlb olunmurdular. Nizami bu əsərdə qanunu pozanların vəzifəsindən, rütbəsindən asılı olmayaraq törətdiyi cinayətə görə cəzalandırılmasını diqqətə çatdırır. Odur ki, hökmdar Hürmüzün öz oğlunu cəzalandırmasını ədalətli hesab edərək bunu alqışlayır. Təsvir etdiyi hadisəni dövrünün mövcud qaydaları ilə əlaqələndirərək baş verən ədalətsizliklərdən şikayət edir:

Hanı o ədalət, o insaf hanı?
Verə öz oğluna belə cəzanı.
İndi yüz yoxsulun tökülsə qanı,
Durub tərəf çıxan bir adam hanı?
[1, s.85]

Nizami Gəncəvi həmçinin öz qəhrəmanını ədalətli hökmdar kimi təsvir edərək əsl hökmdarın necə olması barədə fikirlərini söyləyir. Belə ki, ədib Şirini xalqla yaxşı rəftar edən, xalqı vergidən azad edən, kəndlilərin, kasıbların şikayətini dinləyən və həll yolunu tapan qəhrəman kimi qələmə verir. O, əsərdə hakimiyyətlə yanaşı, ədaləti məhəbbətlə də təcəssüm etməyə qadir olmuşdur. Professor Həmid Araslı qeyd edir ki, Nizami ədalət haqqındakı mütərəqqi görüşlərini əsərinin əsas mövzusu olan məhəbbətlə məharətlə əlaqələndirmişdir. Xosrovu mənən ucaldan, onun alicənab təbiətli bir insan olmasına kömək edən məhəbbət, həm də onu ədalətli bir şah səviyyəsinə qədər yüksəldir. Əsərin sonlarına yaxın oxucu onu elm məclislərində, biliciləri əhatəsində, elmə, fəlsəfəyə dair mübahisələrdə iştirak edən görür. Nizami Şirinin diliylə Xosrova ədalət dərsi verən zaman sanki dövrünün ixtiyar sahiblərinə üz tutur, onları ədalətə, düzlüyə, elmə səsləyir:

Bəd duadan saqın, mehriban danış,
Pusquda durmasın yolunda qarğış.
Birdən qoca qarı, cavan ah çəkər,
Hədəfə ox vurar erkən bir səhər...
Şahların əlində çox ayna, baxsan,
Qaralıb getmişdir məzlum ahından...
Dünyada zülm etmək qoçaqlıq deyil,
Rəiyyət bəsləmək çox yaxşıdır, bil
[1, s.9].

Nizami Gəncəvi ədaləti digər hallarla da öz oxucusuna çatdırmağı bacarmışdır. Ədalətin hansı gücə malik olmasını, onun qarşısında uğursuzluğun, pisliyin tab gətirməməsini söyləyən ədib oxucusunu bu hisslər qarşısında gücün əbəs olduğuna inandırmağa çalışmışdır. Ədibə görə insan ədalətlə əvəzsiz bir uğur qazanmaq əzmindədir ki, bu uğur ondan başqa heç bir şeylə əldə edilə bilməz. Bu uğur insanı tez bir zamanda cəmiyyət arasında məşhur etmək iqtidarındadır. Ədalətin insana hörmət gətirdiyini, mərhəmətli etdiyini, ədalətlə insanın saflaşmasını, hətta onun müdrikləşməsini təlqin edirdi. Ədibə görə insanları ədalətlə sevindirmək, günahsızları ədalətlə azad etmək mümkündür. Ədalət insanlar arasında sevinc, şadlıq münasibətlərinin təməlini qoyur. Şair əsərində ədalətli hökmdara qarşı xalqın necə məhəbbət bəslədiyini göstərir. Məhz hökmdarın ədaləti xalqı sevgiyə, məhəbbətə düçar edir. Xalq öz hökmdarına olan sevgisi səbəbindən ona canlarını verməyi belə əsirgəmirlər. O, ədalətli olmağı, ilk növbədə, vəfalı olmaqla əlaqələndirir. Ədibə görə vəfalı olmaq ədalətli olmağa bir addımdır. Məhz vəfa ilə ədalətli olmaq mümkündür. O, bununla sanki bərəkət verən torpağı insanlara bağışlayacaq qədər yaxşılıq etmiş olur.

Nizami Gəncəvinin üçüncü poemasındakı Leyli surəti Şərq qadınının fədakarlığını, analıq qayğısını, məişətdəki rolunu əks etdirir. Şair bu poemada eyni zamanda qadın zorakılığına son qoyulması ideyasını tərənnüm edir. Bu baxımdan deyə bilərik ki, Nizami Gəncəvi cəmiyyətdə qadının rolunu min il bundan əvvəl görmüş və qələmə almışdır.

Şair dördüncü əsəri “Yeddi Gözəl”lə dünya arenasına çıxaraq qadın problemini planetimiz çərçivəsində həll etməyə çalışmışdır. Əsərdəki çin, rus, fars, türk, hind, ərəb və s. qadın nümayəndələri öz milli adət və ənənələri ilə, analıq qayğısı ilə yaşayırlar.

“Xəmsə”də yer alan beşinci əsər “İskəndərnamə”dəki Nüşabə surəti xüsusilə diqqəti cəlb edir. Nüşabə İskəndərə *“Erkək tinətliyəm olsam da qadın, hər işi bəllidir*

*mənə dünyanın. Mən də bir aslanam, düşünsən bir az, Aslanın erkəyi, dişisi olmaz"* – deməklə müasir dövrümüzdə geniş yayılan gender bərabərliyi ideyasının hələ XII əsrdə öz əsərlərində əks olunduğunu sübut etmişdir.

**Nizami Gəncəvi irsində "hüquq" anlayışı tədqiqatçı alimlərin düşüncə müstəvisində**

Akademik H.Araslı yazır: *"Nizami xalqların səadətini, istiqlaliyyətini, onların hər cür zülm və istismardan azad olmasını istəyib bütün ömrünü bu uğurda sərf etmişdir. Nizami əməkçi insanın hüququ uğrunda mübarizə aparmışdır. Nizami öz xalqını bütün dünyada şöhrətləndirmiş və bütün xalqların bərabər hüquqlu mədəni həyatını arzulamışdır".* Nizami öz əsrinin misilsiz humanist mütəfəkkiri olmuşdur. Bunu onun əsərlərində irəli sürdüyü sosial-siyasi ideyaların məzmunu da təsdiq edir. Mütəfəkkir lirik əsərləri ilə yanaşı, "Xəmsə"yə daxil olan əzəmətli poemalarında da dövrün və sosial-siyasi problemlərin həllinə toxunmuşdur.

Nizaminin sosial-siyasi ideyaları Azərbaycanın siyasi və hüquqi fikir tarixinin inkişafında mühüm rol oynamış, Yaxın və Orta Şərqin fəlsəfi, ictimai-siyasi fikrində humanist, demokratik ideyaların formalaşmasına və inkişafına müstəsna təsir göstərmişdir. Ədibin sosial ədalətə dair ideyalarının formalaşmasında Azərbaycan şifahi xalq ədəbiyyatının böyük təsiri olmuşdur. Belə ki, mütəfəkkirin sosial-siyasi görüşlərinin, demokratik ideyalarının daşıyıcılarının böyük əksəriyyəti xalqın təfəkkürü əsasında yaratdığı obrazlardır. Həmin obrazlar içərisində xalqın istək və arzularının daşıyıcısı olan müsbət, eləcə də nifrət obyekti olan mənfi qəhrəmanlar da vardır.

Ədəbiyyatşünas H.Araslı yazır: *"Biz Nizamidə şah, vəzir surətləri ilə yanaşı, çoban, əkinçi, daşkəsən, kərpickəsən surətlərinə, alim surətlərinə, xüsusən o dövr ədəbiyyatında müstəsna bir yer tutan müsbət qadın surətlərinə tez-tez təsadüf edirik"* [4, s.15]. Cəmiyyətdə mövcud olan ədalətsizlikləri və digər nöqsanları bu müsbət qəhrəmanların aradan qaldıracaqlarına ümid bəsləyən şair şifahi yaradıcılığında sadə xalq kütlələri üçün onların bir-birindən tamamilə fərqli olan müsbət və mənfi keyfiyyətli obrazlarını yaratmışdır.

Azərbaycan şifahi xalq ədəbiyyatında hökmdar (ədalətli və ya ədalətsiz, insaflı və ya qəddar, mərhəmətli və ya müstəbid) obrazlarına xüsusi yer verilmişdir. Şübhəsiz ki, Nizami öz əsərlərindəki qəhrəmanların mənfi və müsbət keyfiyyətlərini təsvir edərkən xalq deyimlərindən, xalq müdrikliyindən və onun şifahi qaynaqlarından lazımınca bəhrələnmişdir. Akademik H.Araslının yazdığı kimi: *"Ümumiyyətlə, xalq ədəbiyyatında iki cür şah surətinə təsadüf edilir: müsbət və mənfi. Həyatı ağır keçən, yaşadığı dövrün üsul-idarəsindən narazı qalan xalq kütləri dövlət quruluşu*

*haqqındakı tələblərini bu surətlər vasitəsilə ifadə etmişlər".* Nizaminin yaşayıb-yaratdığı dövrdə orta əsrlər Azərbaycanı ancaq qeyri-məhdud feodal monarxiyası idarəçilik formasını tanıyırdı. Dövlətin başında şah dururdu. O, həm dövlət qanunvericisi, həm də məhkəmə hakimiyyətinin daşıyıcısı idi. Nizaminin həyat və yaradıcılığının təhlili ilə əlaqədar bu məqama toxunan H.Araslı yazır: *"Orta əsrlərdə yaşayan xalq kütlələri dövlət quruluşunda şahlıqdan başqa üsul-idarə tanımırdılar. Onlar "ölkə şahsız idarə oluna bilməz" təsəvvüründən xaricə çıxa bilmədikləri kimi, dövrün zülmkar hökmdarları ilə də razılaşmaq istəmirdilər. Odur ki, xalq mövcud şahlara qarşı öz istək və arzularına, öz tələblərinə uyğun ədalətli şah surətləri qoyurdu. Belə şahlar ya əməkçi xalq içərisindən çıxıb zülmkar şahla mübarizə aparır, ya da haqsızlığa məruz qalmış şahzadələrdən olub ölkəni ədalətlə idarə edirlər"* [4, s.15].

Nizaminin sosial-siyasi görüşlərində xalqın istəyi ilə hakimiyyət başına gələn və ölkəni ədalətlə idarə edən hökmdar, yəni ağıllı, müdrik və ədalətli hökmdar problemi mütəfəkkirin utopik ideyalarının əsas məzmununu təşkil edir. Mütəfəkkirin "xalq hakimiyyəti" arzusu onun müasiri olduğu dövrdə utopiya olaraq qalırdı.

Aqşin Quliyev yazır: *"Yüksək insani və əxlaqi keyfiyyətlərə malik olan və mənəviyyat aləminə qulluq edən bir mühitdə (ailədə) dünyaya göz açmış, öz fitri istedadı və intellektual səviyyəsi ilə dövrün, zəmanənin köklü problemlərinin mahiyyətini dərindən dərk etmiş Nizami özünün bütün yaradıcılığını insanlığa xidmətə həsr etmişdi. Mütəfəkkirin humanizmi zəmanəsinin qüdrətli mənəvi silahına çevrilərək, bütövlükdə sosial-iqtisadi və siyasi quruluşun qüsur və nöqsanlarına qarşı çevrilmişdi. Bu, artıq ictimai-siyasi fikrimizdə orijinal bir istiqamət idi. Nizami özünün sosial-siyasi ideyalarında hökmdarları haqqa, ədalətə, özlərinin qeyri-insani instinktlərini boğaraq həyatın bütün nemətlərinin yaradıcısı olan insana və insanlığa xidmət etməyə çağırmışdır"* [4, s.15].

Zülm və zalıma qarşı mübarizə ideyası Nizami humanizminin ana xətti kimi onun bütün ictimai-fəlsəfi qəsidələrində əks olunub. Mütəfəkkir problemin həlli üçün bəzən dolayı vasitələrdən istifadə edir, dini etiqad və inamlara müraciət yolu ilə dövrün kəsirlərini – möhnət və haqsızlıqları qamçılayırdı. O, dini görüş və şüarlarını öz demokratik ideyalarına xidmətə yönəldir, güc və hökm sahiblərini heç olmasa həmin yolla xeyirxah işlər görməyə, ölkə və xalqın asayişini qorumağa səsləyirdi.

Ölkənin müqəddəratını düşünən, bağlı olduğu zəhmətkeş xalqı zülmkar hakimlərin, sərxoş darğaların talanından qorumağa çalışan mütəfəkkir həmişə ədalətli şah arzusunda olmuşdur. Elmin, mədəniyyətin inkişafında dövlətin əhəmiyyətini başa düşən Nizami dövlət quruluşunun əsasını şahlıqda görürdü. Lakin onun arzuladığı

şah xalqın, vətənin qeydinə qalan, ədalətli olan idi. O, yalnız yaradıcılığının son zirvəsində "İskəndərnamə" əsərinin sonunda yeni dövlət quruluşu olaraq hökmdarsız xalq hakimiyyətini xəyal edirdi. Əslində, bu, xalqın öz istəyinə uyğun, xəyalında şəxsiyyətini canlandırdığı ədalətli hökmdarın icra etdiyi hakimiyyət idi. Bu dövlətin demokratikliyi onda idi ki, o, insanın hüquqlarını qoruyur, onun əməyini müdafiə edir və qiymətləndirirdi. Şairin təsəvvür etdiyi xalq hakimiyyəti şəxsiyyətlə dövlət və hökmdar arasında ahəngdarlığın və qarşılıqlı vəhdətin bərqərar olmasına rəvac verən siyasi quruluş idi. Tədqiqatçıların fikrincə, Nizami dühasının böyüklüyü ondadır ki, o, xalqla hökmdar arasındakı münasibətləri və bu münasibətlərin kölgəli cəhətlərini qorxmadan, cəsarətlə açıb göstərə bilirdi. İbrətləndirmək, qorxutmaq, öyrətmək, xəbərdarlıq etmək yolu ilə onları ədalətə, insanlığa istiqamətləndirirdi. Əsərlərində şahların ədalətini təsvir etmək Nizami üçün az əhəmiyyətlidir, dövrünün hökmdarlarını isə ...utandırmaq, ...ağıllandırmaq yolu ilə ədalətə yönəltmək, onların ədalətli olmasına nail olmaq mütəfəkkirin böyük irsinin əsas qayələrindən birini təşkil edir. Bu, eyni zamanda Nizaminin siyasi idealı, onun nail olmaq istədiyi, yaxud bərqərar olacağına ümid etdiyi məqsədlərindən biridir. Mütəfəkkirin müasiri olduğu hökmdarlara xəbərdarlıqları, müəyyən mənada kəskin qınaqları, hər şeydən əvvəl, tövsiyə xarakteri daşıyır. Onun ideyasına görə, hökmdar ilk növbədə aqil, ləyaqətli və nəcib insan olmalı, alicənablığı ilə seçilməli, nümunəvi və əxlaqlı bir fərd kimi insan və insanlıq adını uca tutmalıdır. Hökmdar xalqın etimadını siyasi cəhətdən səbatlı və tədbirli, ədalətli olması ilə qazanmalı, xalq isə hakimiyyətin iradəsinə arxalanmalıdır.

Aqşin Quliyev qeyd edir: *"Humanist mütəfəkkirin belə mövqeyi onun insan şəxsiyyətinə atəşin vurğunluğundan və sonsuz hörmətindən irəli gəlirdi. Nizami üçün insan ən uca varlıqdır. Həyatın bütün nemətləri və gözəllikləri yalnız insan naminə mövcuddur. Ömür insana şərəfli və layiqli yaşamaq üçün verilmişdir. İnsan yaşamalı və yaratmalıdır"* [4, s.15]. Mütəfəkkirin məntiqinə görə, nəinki əmək və öz zəhməti ilə yaşamaq, hətta ləyaqətli və məğrur yaşamağın özü insan üçün bir şərəfdir.

**Nizami yaradıcılığının təsir dairəsi**

Nizami Gəncəvinin əsərlərində yaratdığı "ədalətlilik prinsipi"ni ondan sonra yaşayan filosofların, yazıçıların və s. yaradıcı insanların əsərlərində sezmək mümkündür. Məsələn, dahi ingilis filosofu Herbert Spenserin (1820–1903) "Dövlətin əsas vəzifəsi ədaləti qorumaqdır" fikri Nizaminin "ədalətli hökmdar" ideyasının məhsuludur. Bundan başqa, Benedikt Spinozanın (1632–1677) "Hər kəsin hüququ onun üçün təyin edilmiş qüdrət qədərdir" ifadəsi də şairin "ədalətli insan" konsepsiyası əsasında meydana gəlmişdir. Nizamidən sonra ən geniş şəkildə hakimiyyətin qəbul etdiyi qanunların ədalətsizliyini ifşa edən fransız mütəfəkkiri

Fransua Mari Arue (Volter) (1694–1778) olmuşdur. O, hakimiyyət nümayəndələrinin mövcud qanunun müddəalarını pozmasını və buna görə cəza almamasını kəskin surətdə tənqid edirdi. Qeyd edək ki, Nizami "Sirlər xəzinəsi" əsərində bu barədə geniş fikir irəli sürmüşdür.

Şairin "hökmdarın xalqa qayğısı və ədaləti" ideyası İmanuel Kant (1724–1804) tərəfindən davam etdirilmişdir. Onun, "Sən xalqa etdiyin yamanlıqla öz-özünə yamanlıq edirsən" ifadəsi bunu əyani sübut edir. Ansem Feyerbaxın (1775–1833) isə cinayət hüququnun başlıca prinsipi olan "Heç bir cinayət cəzasız qalmamalıdır" fikrini irəli sürməsində də Nizami yaradıcılığının rolu böyükdür. Şairin yaradıcılığından daha çox dahi ingilis yazıçısı Vilyam Şekspir ilham almışdır. Yazıçı müəyyən ideyalarla yanaşı, "ədalətlilik prinsipi"ndən də istifadə edərək bunu öz əsərlərində göstərmişdir. O, özünün "Kral Lir" əsərində ədalət mövzusuna geniş şəkildə müraciət etmişdir.

Nizami irsi o qədər genişdir ki, demək olar ki, bu irsdən bəhrələnməyən olmamışdır. XIV əsrdə yaşamış Arif Ərdəbili onun əsərlərindən ilhamlanaraq "Fərhadnamə", Əssar Təbrizi "Mehr və Müştəri" poemalarını ("Xosrov və Şirin" əsərinin təsiri ilə), hind şairi Əmir Xosrov Dəhləvi (1253–1325), fars-tacik şairi Əbdürrəhman Cami (1414–1492), özbək şairi Əlişir Nəvai (1441–1501) bir çox əsərlər yazmışdılar. XX əsrdə isə Səməd Vurğun "Fərhad və Şirin" mənzum faciəsini, Abdulla Şaiq "Nüşabə" pyesini, Üzeyir Hacıbəyov "Sevgili canan" musiqisini, Qara Qarayev "Yeddi gözəl" baletini Nizami irsindən ilham alaraq yaratmışlar[4].

Q.Qarayev də Nizami irsinə müraciət edən bəstəkarlarımızdandır. O, "Yeddi gözəl" baletində klassik irsə müraciət etmiş, qədim bir əfsanə vasitəsilə öz xalqının zəngin mənəvi xüsusiyyətlərini, azad şəkildə sevib-sevilmək arzularını tərənnüm etmişdir. 1947-ci ildə SSRİ Dövlət mükafatına layiq görülmüş "Leyli və Məcnun" simfonik poeması Q.Qarayevə böyük şöhrət qazandırdı [7, s.110–112].

N.Gəncəvinin yaşadığı cəmiyyətin ictimai ziddiyyətlərini dərindən qavraması, cəmiyyətdəki sosial ədalətsizliyə qarşı mübarizəsi və nəticədə cəmiyyətin yenidən qurulması üçün yollar axtarması, ideal cəmiyyət haqqındakı fikirləri ictimai-iqtisadi fikir tariximizin ən qiymətli inciləridir. N.Gəncəvi bir mütəfəkkir-alim kimi elmin qarşısında qoyduğu vəzifəni "Sən çalış yaxşı öyrən dünyanı, bəşəri, bitkini, daşı, heyvanı" fikri ilə şərəflə yerinə yetirmişdir [6, s.212–224].

[4] http://injuria.az/news/nizami-gencevinin-huquq-dusuncesi

**Nəticə / Conclusion**

Ümumiyyətlə, bir türk ölkəsində dünyaya gəlmiş, türk kimi böyümüş və bu ada xidmət etmiş N.Gəncəvinin yaradıcılığı elə bir dəryadır ki, buradan hər kəsə bir damla yetmişdir. Dahi şairin anadan olmasının 880 illiyi münasibəti ilə cənab Prezidentimiz İlham Əliyev Azərbaycan Respublikasında 2021-ci ilin "Nizami Gəncəvi ili" elan edilməsi haqqında Sərəncam imzalamışdır. Bununla bir daha şahidi olduq ki, qüdrətli söz və fikir ustadı Nizaminin insanları daim əxlaqi kamilliyə çağıran və yüksək mənəvi keyfiyyətlər aşılayan zəngin yaradıcılığı bəşər mədəniyyətinin nailiyyəti kimi müstəsna əhəmiyyətə malikdir.

**İstifadə edilmiş ədəbiyyat / References**


1. Gəncəvi N. (2004). Xosrov və Şirin. Ön sözün müəllifi: Həmid Araslı. Bakı, "Lider nəşriyyat". 392 s.
2. Gəncəvi N. (2004). Sirlər xəzinəsi. Ön sözün müəllifi və elmi redaktor: Xəlil Yusifli. Bakı, "Lider nəşriyyat". 264 s.
3. Quluzadə Ş. (2021). Nizami Gəncəvi yaradıcılığında qadın haqlarının təbliği. "Respublika" qəzeti, 13 fevral, s.6.
4. Ömərov V. (2016). Nizami Gəncəvi yaradıcılığında insan haqlarının təbliği. "Səs" qəzeti, 11 fevral, s.15.
5. Səfərli A. (2018). Sözün işığında. Bakı, "Desk". 602 s.
6. Səfərli A. (2021). Nizami Gəncəvi "Xəmsə"sində iqtisadi fikirlər. III iqtisadiyyat və idarəetmə sahəsində magistr və doktorantların Beynəlxalq Elmi Konfransı. Nizami Gəncəvi və davamlı inkişaf. 4–7 iyun. Azərbaycan, Gəncə, Bakı, s.212–224.
7. Səfərli A. (2021). Nizami Gəncəvi irsi notların təcəssümündə (Work by Nizami Ganjavi as literary and historical source. Azerbaijan University. International Conference). 7 may, s.110–112.
8. Səfərli A. (2021). Nizami Gəncəvi yaradıcılığında türkçülük motivləri. Ümummilli lider Heydər Əliyevin anadan olmasının 98-ci ildönümünə həsr olunmuş "Heydər Əliyevin azərbaycançılıq ideologiyası filoloji fikir kontekstində" mövzusunda Respublika onlayn elmi konfransının materialları. 17 may, BDU, s.247–253.
9. Səfərov P. (2021). Nizami Gəncəvinin hüquq düşüncəsi. 16 mart. http://injuria.az/news/nizami-gencevinin-huquq-dusuncesi

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 3 (277), 129-134
doi.org/10.48445/m1997-9750-8359-c

A Z Ə R B A Y C A N   Ə D Ə B İ Y Y A T I

# Cənubi Azərbaycan poeziyasının inkişafında yeni mərhələ

***Elnurə Abdullayeva***
Dissertant, AMEA Nizami Gəncəvi adına Ədəbiyyat İnstitutu. Azərbaycan.
E-mail: elnura.abdullayeva@yahoo.com
https://orcid.org/0009-0001-5032-9045

**XÜLASƏ**
1941–1946-cı illər Cənubi Azərbaycan poeziyasının əsas mənzərəsi, demək olar ki, “Şairlər məclisi” və onun nəşr etdiyi məcmuədə öz əksini tapmışdır. Məqalədə həmin illərə aid Cənubi Azərbaycan ədəbiyyatında anadilli poeziyanın coşqun inkişaf mərhələsi araşdırılır. Həmçinin “Azərbaycan”, “Vətən yolunda” qəzetlərində, “Şairlər məclisi” məcmuəsində və digər mənbələrdə dərc olunan poetik nümunələr mövzularına görə qruplaşdırılaraq təhlil olunur, imkan daxilində dövrün ədəbi simaları haqqında da məlumatlar verilir. Mövcud dövr ədəbiyyatın inkişafında yeni mərhələ adlandırılır və hesab edilir ki, bu illərin poeziyasını “milli kimlik uğrunda mübarizə poeziyası” da adlandırmaq olar. Vətənpərvərlik, xalqa, onun amal və arzularına xidmət, azadlığa, istiqlala çağırış bu dövr Cənubi Azərbaycan ədəbiyyatının əsas ideya istiqamətini təşkil edirdi.

**AÇAR SÖZLƏR**
Cənubi Azərbaycan, poeziya, milli kimlik, poetik əsərlər

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 17.07.2023
qəbul edilib: 27.08.2023

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO. 3, VOL. 277, 129-134
doi.org/10.48445/m1997-9750-8359-c

AZERBAIJAN LITERATURE

# A new stage in the development of South Azerbaijan poetry

***Elnura Abdullayeva***
Dissertatist, Institute of Literature named after Nizami Ganjavi of ANAS. Azerbaijan.
E-mail: elnura.abdullayeva@yahoo.com
https://orcid.org/0009-0001-5032-9045

**ABSTRACT**
The main illustration of South Azerbaijan poetry in 1941–1946 is virtually reflected in collection made based on texts chosen from "Shairlar majlisi". In the article, in the literature of South Azerbaijan of those years, being a separate stage of vigorous development of native language poetry in South Azerbaijani literature, is examined in detailed form and according to principles specified by the author. In those years, the poetic examples published in the newspapers "Azerbaijan", "Vatan yolunda", in the collection "Shairlar majlisi" and other sources are grouped and analyzed according to their themes, and information about the literary figures of the period is also given. This period is called a new stage in the development of literature, and it is believed that the poetry of these years can also be called the poetry of struggle for national identity. Patriotism, service to the people, their actions and dreams, calling for freedom and independence were the main ideas of South Azerbaijani literature of these years.

**KEYWORDS**
South Azerbaijan, poetry, national identity, poetic works

**ARTICLE HISTORY**
Received: 17.07.2023
Accepted: 27.08.2023

## Giriş / Introduction

İkinci Dünya müharibəsi (1939−1945) dünya ölkələrinin bir çoxunda olduğu kimi, İranda və onun tərkib hissəsi olan Güney Azərbaycanda da milli şüurun oyanışına, azadlıq hərəkatının geniş şəkildə vüsət almasına zəmin və tarixi şərait yaratdı. Mütərəqqi fikirli azadlıqsevər Azərbaycan ziyalıları şəraitin yaratdığı imkanlardan istifadə edərək gizli və ya açıq şəkildə Rza şah diktaturasına qarşı genişlənən inqilabi-siyasi mübarizəyə qoşuldular. Bu dövrdə yaranan poetik əsərlərin böyük əksəriyyəti inqilabi ruhlu, şahlıq istibdadına qarşı birbaşa və kəskin etirazı ilə diqqəti cəlb etməyə, özündən əvvəlki ədəbi-bədii nümunələrdən əhəmiyyətli dərəcədə fərqlənməyə başladı.

1941–1946-cı illər Cənubi Azərbaycan poeziyasının əsas mənzərəsi, demək olar ki, "Şairlər məclisi" və onun nəşr etdiyi məcmuədə öz əksini tapmışdır.

"Şairlər məclisi" 1945-ci ildə "Vətən yolunda" qəzetinin nəzdində təşkil olunmuşdur. Məclisin yaranmasının bilavasitə iştirakçısı olan professor Cəfər Xəndan 1947-ci ildə yazdığı "Vətən yolunda" qəzeti" adlı məqaləsində məclisin təşkili ilə bağlı bir sıra məsələlərə aydınlıq gətirmişdir. Müəllifin yazdıqlarından anlaşılır ki, belə bir məclisin yaradılmasında əsas məqsəd, bir tərəfdən Azərbaycan ədəbiyyatı tarixinin görkəmli nümayəndələrini öyrənmək, digər tərəfdən də müasir şairlərin yaradıcılığını inkişaf etdirmək, onları bir təşkilat halında birləşdirməkdən ibarət olmuşdur.

C.Xəndan qeyd edir ki, *"Şairlər məclisi"nin təşkili haqqında hazırlıq işləri 1944–cü ilin axırlarında görülsə də, məclis rəsmi surətdə 1945-ci ilin əvvəllərində təşkil olunmuşdur"* [5, s.164]. Müəllifin yazdığına görə, məclisin birinci məşğələsi yanvar ayının 7-si axşam saat beş tamamda "Vətən yolunda" qəzetinin redaksiyasında olmuş, birinci iclasda "Azərbaycan ədəbiyyatı tarixinə ümumi bir baxış" məruzəsi dinlənilmiş, ... Fitrət, Etimad və başqaları öz sevinclərini şeirlə bəyan etmişdilər.

Professor C.Xəndanın yazdıqlarından belə məlum olur ki, rəhbərliyində Fitrət, Etimad, Hilal Nasiri və başqalarının təmsil olunduğu məclisin yığıncaqları hər on beş gündən bir keçirilirmiş. Müəllif fikrinə davam edərək yazır: *"Yeddi-səkkiz nəfərin təşkilatçılıq fəaliyyəti ilə yaradılmış, sonralar 15–20 nəfərlik heyətə malik olmuş "Şairlər məclisi" sıralarına 50–60 daimi üzv cəlb edilmişdi. Azərbaycan Sovet şeirini dərindən öyrənən məclis üzvlərinin yaradıcılığında az zaman ərzində məzmun və forma cəhətdən böyük yeniliklər nəzərə çarpmağa başlamışdı. Onlar epik əsərlər, siyasi-lirik şeirlər, vətənpərvərlik ruhunda gözəl əsərlər yaradırdılar"* [5, s.167].

"Şairlər məclisi"nin yaranması, onun fəaliyyəti haqqında dolğun və səhih məlumatlar verməsi baxımından Rza Quliyevin "Təbrizin "Şairlər məclisi" adlı məqaləsi maraq doğurur. Müəllif belə hesab edir ki, *"Təbrizdəki "Şairlər məclisi"nin təşkili təsadüfi bir hadisə deyildir. Şairlər vətəni olan Azərbaycanın tarixini varaqladıqca hələ çox-çox əsr bundan əqdəm Azərbaycanda məşhur şairlər məclisinin olduğunu və ədəbiyyatımız tarixində o məclislərin görkəmli rol oynadığını görürük"* [4, s.385].

Tarix boyu Azərbaycanda yaranmış bir sıra ədəbi məclislər barədə məlumat verən müəllif, daha çox Təbrizdə təşkil edilmiş "Şairlər məclisi"nin fəaliyyəti üzərində dayanır.

Məqalədən o da məlum olur ki, məclisdə yalnız təbrizli şairlər deyil, Cənubi Azərbaycanın digər şəhərlərində yaşayan şairlər də mütəmadi olaraq iştirak etmişlər. Son zamanlarda "Şairlər məclisi"ndə daimi iştirak edən üzvlərin sayı 50 nəfərə çatmışdır. Məclisdə həmçinin daimi üzvlərindən əlavə, Cənubi Azərbaycanın və İranın başqa şəhərlərində yaşayan Azərbaycan dilində yazan şairlər də iştirak edirdilər. *"Bu kimi şairlərin sırasında Azəroğlu, Qulamhüseyn Səbri, Əli Tudə, İbrahim Zakir (Ərdəbil), Rza Əlyarzadə (Mərənd), Əzhəri (Sərab), Əli Nişani (Urmiya), Seyid Haşım Hüseynzadə (Tehran), Kəmali (Xoy), Huşyar (Qaradağ) və başqalarını göstərmək olar* [4, s.387].

"Şairlər məclisi"nin nəşriyyat işləri, müxtəlif şəhərlərdə keçirdiyi tədbirlər, məclis üzvlərinin Şəbüstərdə Mirzə Əli Möcüzün evini və məzarını ziyarət etmələri, radiodakı çıxışları barədə məlumat verən müəllif yazısını belə yekunlaşdırır: *"Öz Milli Hökumətini quran Azərbaycan xalqı öz ədəbiyyatı ilə də fəxr edə bilər. Çünki bu ədəbiyyat xalqın milli qürurundan ilham alır. Azərbaycan Milli Hökumətinin bayraqdarı olan Azərbaycan Demokrat Firqəsinin rəhbərliyi altında ana dilində elmi, mədəni müəssisələr yarandığı kimi, "Şairlər və Yazıçılar Cəmiyyəti" də yaranmışdır. "Şairlər məclisi" bu cəmiyyət üçün gözəl bir zəmin olmuşdur"* [4, s.393].

"Şairlər məclisi"ndə çap olunan poetik əsərlərin əsas mövzularından biri xalqın qəhrəmanlıq tarixinin təsvir və tərənnümü idi. Bu günün qəhrəmanının bədii obrazını yaratmaq üçün şairlərin xalqın qəhrəmanlıq tarixinə müraciəti səbəbsiz deyildi. Onlar bu yolla milli ruhu dirçəltmək, oxucularda, xüsusilə gənclərdə milli kökə qayıdışı təbliğ etmək istəyirdilər. Onların nəzərində Milli Hökumət xalqın qəhrəmanlıq salnaməsinin mühüm bir səhifəsi olduğundan, tarixlə bərabər təsvir və tərənnüm obyektinə çevrilirdi. Ədəbi nümunələrin əksəriyyətində Milli Hökumətlə xalq birlikdə, vəhdətdə götürülürdü. Bədii söz sahibləri Milli Hökumətin yaranmasını və qələbəsini xalqın – Azərbaycan türklərinin və onlarla birgə yaşayan digər xalqların ən

böyük tarixi qələbəsi, nailiyyəti kimi qələmə alır, bu tarixi hadisəni sevinc, pafosla təbliğ və tərənnüm edirdilər. Bu baxımdan müəlliflərin qələminin müştərək məhsulu olan "Azərbaycan" şeiri təqdirəlayiqdir. Şeirdə deyilirdi:

Tarixin simasını minlərlə insanlar yazıb
Kani-qeyrət olduğun hər yerdə dastanlar yazıb,
Qəhrəman keçmişlərindən al bu dərsi yadigar,
Qəhrəman ol, qəhrəmanlıq şivəsin eylə şüar,
Var nə qədər canımız hifz eylərik heysiyyətin,
Qoymarıq, məhv eylərik düşmənlərin milliyyətin
[4, s.6].

Xalqın qəhrəmanlıq tarixini, şanlı keçmişini əks etdirən bu əsərdə millətin faciəsi olan "ayrılıq dərdi"nə də yer ayrılır. Vətənin iki yerə parçalanmasını bir canın iki yerə bölünməsi kimi qiymətləndirən müəlliflər bu pay-bölüşü yalnız bir xalqın faciəsi deyil, həm də tarixin ədalətsiz qanunu, XIX əsrin ürəkparçalayan, üzqaraldan hadisəsi adlandırırlar. Onların qənaətinə görə, ayrılığın bünövrəsi qoyulan gündən bəri Araz "iki canın arasında bir qılınc"a dönmüşdür. İkiyə bölünmüş ürəyin bir parçası güləndə, o biri parçası ağlayır, gülündən ayrı düşmüş bülbül zəmanəyə nifrət yağdıraraq həzin-həzin sızlayır, həsrət yaşı axıdıb dününinə və bu gününə yas saxlayır.

Azərbaycan Milli Hökumətinə ithaf olunan "Azərbaycan" əsərini həm bu məcmuədəki əsərlərin, həm də, ümumiyyətlə, 1941–1946-cı illər Cənubi Azərbaycan şeirinin "manifesti" də adlandırmaq olar.

"Ey müqəddəs məskənim, ey şanlı Azərbaycan,
Biz səninlə fəxr qıllıq yer üzündə hər zaman"
[4, s.3].

Yuxarıda verilən misralarla başlayan əsərdə Azərbaycanın tarixi keçmişinə nəzər salan, torpağını "müşki-ənbər", daşlarını "dürri-nab", övladlarını "qeyrətli" və "alicənab" adlandıran müəlliflər hesab edirlər ki, xalqın müstəqilliyi üçün ələ düşən fürsət qaçırılmamalı, milli kimliyini dərk edən millət dili, adət-ənənəsi, azadlığı uğrunda canından keçməyi bacarmalıdır. Bu torpaq bir çox istilalara məruz qalsa da, övladları hər cür sitəmlərlə üzləşsə də milli qürur və mənliyini itirməməsini, əl-ələ verib yadellilərə tutarlı cavab verdiklərini bəyan edən şairlər oxuculara Cavanşiri, Babəki, Xətaini, Koroğlunu, Səttarxanı, Xiyabanini xatırladaraq bu millətin əyilməz, torpağın isə alınmaz bir qala olduğunu böyük şövq və həvəslə tərənnüm edirlər.

Şairlər təkcə Azərbaycanın qəhrəman oğulları haqqında deyil, bu xalqın və torpağın şöhrətini bütün dünyada tanıdan Nizami, Xaqani, Şeyx Səfi, Qazi Bürhanəddin, Həbibi, Füzuli, Vaqif kimi dahilərdən, "Kitabi-Dədə Qorqud" dastanlarından da söz açır, dilimizi dünyanın ən ahəngdar dili kimi vəsf edirlər.

**Nəticə / Conclusion**

"Şairlər məclisi" məcmuəsində dərc olunmuş ədəbi-bədii nümunələrin təhlili göstərir ki, 1941–1946-cı illərin ədəbiyyatı milli ruhu və antifaşist mövqeyi ilə seçilmiş və əvvəlki illərdən fərqli olaraq, əsasən, anadilli ədəbiyyat olmuşdur. Xalqın istiqlal haqqında olan arzu və istəkləri, ana dili məsələsi bu dövr ədəbiyyatının aparıcı mövzusu olmaqla yanaşı, milli şüurun formalaşmasında da əvəzsiz rol oynamışdır.

**İstifadə edilmiş ədəbiyyat / References**

1. "Azərbaycan" qəzeti. (1941); (1320). № 1, 12, 17, 30.
2. Azəroğlu B. (1945). Bakı səfəri. "Vətən yolunda" qəzeti, №109.
3. "Azərbaycan" qəzeti, "Şairlər məclisi" məcmuəsi. (1945). № 3-4, s.3.
4. "Şairlər məclisi". (1945). Təbriz, № 3-4, 424 s.
5. Xəndan C. (1980). Ədəbiyyatımızın dünəni və bu günü. Bakı, Yazıçı. 245 s.
6. Əmirov S. (2000). Cənubi Azərbaycan milli-demokratik ədəbiyyatı (1941–1990-cı illər). Bakı, Elm. 257 s.

# MÜƏLLİFLƏRİN NƏZƏRİNƏ

*«Azərbaycan dili və ədəbiyyat tədrisi» jurnalında dərc ediləcək məqalələr üçün texniki tələblər*

**Məqalələrin məzmunu**

Məqalələr aktual mövzulara həsr olunmalı, jurnalın məzmun və üslubuna uyğun akademik tələblərə cavab verməli, "Giriş" (Introduction), "Əsas hissə" (Main part) və "Nəticə"dən (Conclusion) ibarət olmalıdır. "Giriş"də mövzunun aktuallığı əsaslandırılmalı, "Əsas hissə"də tədqiq edilən məsələlər, qaldırılan problemlər bölmələr üzrə ətraflı şərh edilməli, "Nəticə"də isə elm sahəsinin və məqalənin xarakterinə uyğun olaraq, müəllifin gəldiyi elmi qənaət, işin elmi yeniliyi, tətbiqi əhəmiyyəti və s. aydın şəkildə verilməli, təklif və tövsiyələr irəli sürülməlidir.

**Məqalələrin strukturu və tərtib edilmə qaydaları**

1) Redaksiyaya təqdim edilən məqalələr Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının dövri elmi nəşrlərin qarşısında qoyduğu şərtlər də daxil olmaqla aşağıdakı tələblərə cavab verməlidir:

- ✓ Məqalənin adı, müəllifin adı və soyadı, vəzifəsi, elmi dərəcəsi (əgər varsa), işlədiyi qurumun adı, elektron poçt ünvanı və ölkə adı məqalənin titul səhifəsində yazılmalıdır.
- ✓ "Xülasə" Azərbaycan və ingilis dillərində eyni məzmunda olmaqla, təxminən 70-120 söz həcmində verilərək, tədqiqat işinin əhatə dairəsini təsvir etməlidir.
- ✓ "Açar sözlər" Azərbaycan və ingilis dillərində verilərək 3-5 söz və ya söz birləşməsindən ibarət olmalıdır.

2) Məqalənin mətni Microsoft Word proqramında, A4 (210x297mm) formatda, Times New Roman – 14 şriftində yığılmalı, intervalı – 1,15, həcmi 6-15 səhifə olmalıdır.

3) Məqalənin adı və yarımbaşlıqları yalnız ilk hərfi böyük olmaqla, qalın şriftlə yazılmalıdır. Başlıq və yarımbaşlıqlardan, cədvəl və şəkillərdən (həmçinin tənliklər və düsturlardan) əvvəl və sonra bir sətir ara boşluğu buraxılmalıdır. Səhifələr ardıcıl olaraq aşağı sağ küncdə nömrələnməlidir.

4) Cədvəl və şəkillərin adı olmalı və bu ad cədvəllər üçün cədvəlin üstündə sol küncdə, şəkillər üçün şəklin altında sol küncdə yerləşdirilərək, ardıcıl nömrələnməlidir.

5) Məqalənin mövzusu ilə bağlı elmi mənbələrə zəruri istinadlar olmalı, sonda verilən "İstifadə edilmiş ədəbiyyat"da istinad olunan ədəbiyyatlar mətnin içində [Kazımov Q. Bakı, 2007] və ya [1, s.52] kimi verilməli, sonda isə əlifba ardıcıllığı ilə nömrələnməlidir. Elmi ədəbiyyata mətndə onlayn istinad olarsa 1 qoyaraq aşağıda internet linki göstərilməlidir. Ədəbiyyat siyahısında verilən hər bir istinad haqqında məlumat tam, dəqiq və orijinalın dilində olmalıdır. İstinad olunan mənbənin biblioqrafik təsviri onun növündən (monoqrafiya, dərslik, elmi məqalə və s.) asılı olaraq verilməlidir. Elmi məqalələrə, simpozium, konfrans və digər nüfuzlu elmi tədbirlərin materiallarına və ya tezislərinə istinad edərkən məqalənin, məruzənin və ya tezisin adı göstərilməlidir. Mətndə istinad olunan bütün mənbələr, səhifə nömrələri ilə birlikdə «İstifadə edilmiş ədəbiyyat» siyahısında aşağıdakı nümunələrdə göstərilən qaydada verilməlidir:

a) *Kitablara istinad:* Kazımov Q. (2007). Müasir Azərbaycan dili. Sintaksis. Bakı, Təhsil. 496 s.

b) *Jurnallara istinad:* Həsənova S. (2021). Aşıq Ələsgər və ədəbi dilimiz. "Azərbaycan dili və ədəbiyyat tədrisi", № 4. Bakı, "N print studiya", s.25-34.

c) *Toplularda məqaləyə istinad* (konfrans, simpozium və digər): "Azərbaycan iqtisadiyyatında keçid dövrünün başa çatması: təhlil və nəticələr. Milli inkişaf modelinin formalaşması problemləri". (2010). Respublika elmi-praktiki konfransının materialları. Bakı, Şərq-Qərb, s.314-316.

ç) *Dissertasiyalar və avtoreferatlar:* Məmmədov H.B. (2013) Azərbaycan Respublikası müasir beynəlxalq siyasi proseslərin aktoru kimi. Elmlər doktoru dissertasiyasının avtoreferatı. Bakı, Elm. 44 s.

d) *Müəlliflik şəhadətnamələri və patentlər*: Алиев С.Г., Джалалов К.Х. А.С. 163514, СССР Б.И. 1988, № 4, s.50 Langsam M., Savoca A. C.L. Pat. 4759776, USA, 1988.

e) *İnternet səhifələri:* İnternet səhifələrinə istinadlar tam göstərilməlidir. Məsələn: http://www.tall.edu.az

6) Məqalədə son 5-10 ilin elmi məqalələrinə, monoqrafiyalarına və digər etibarlı mənbələrinə üstünlük verilməlidir.

7) Məqalə redaksiyaya 3 formada: ya elektron poçtla (*tall@edu.gov.az*), ya jurnalın saytı (http://*tall.edu.az)* üzərindən, ya da çap formasında müəllifinin özü tərəfindən təqdim edilməlidir. Orijinal nüsxədə müəllif(lər)in imzası vacibdir.

**Məqalələrin qəbul edilməsi və dərci**

Təqdim edilən məqalələr redaksiyada nəzərdən keçirildikdən sonra oxunuş üçün (müəllifin adı gizli saxlanılmaqla) mütəxəssislərə göndərilir. Məqalə jurnalın profilinə uyğun olduğu təqdirdə və tələblərə cavab verərsə, çapa təqdim edilir. Müəllif istəsə, ona məqaləsinin qəbul edilməsi barədə sənəd verilə bilər. Məqalələr növbəlilik prinsipi ilə dərc edilir.

**Müəlliflik hüquqları**

Jurnalda dərc edilən məqalələrdə müəlliflik hüququ qorunur və bu məqalələrin bütün nəşr hüquqları *"Azərbaycan dili və ədəbiyyat tədrisi"* jurnalına aiddir. Jurnalda çap edilmiş məqalələrin eyni ilə digər nəşrlərdə (məqalənin tezis şəklində dərc olunmuş variantı istisnadır) dərcinə yalnız redaksiyanın yazılı icazəsi, sitatların verilməsinə isə mənbə göstərilmək şərti ilə yol verilir. Əvvəllər çap olunmuş və ya çap olunmaq üçün başqa bir dövri nəşrə göndərilmiş əlyazmaların jurnala təqdim edilməsi müəlliflik etikasına ziddir. Yuxarıda göstərilən tələblərə cavab verməyən məqalələr qəbul edilmir. Dərc olunmuş məqaləyə görə müəllifə jurnalın bir nüsxəsinin verilməsi nəzərdə tutulur.

## FOR AUTHORS

*Requirements to the articles submitted for publication in «Teaching of Azerbaijani language and literature»*

### Content of articles

The articles should be devoted actual topics, meet the academic requirements of journal's style and content and consist of «Introduction», «Main part», and «Conclusion». The «Introduction» should contain a thesis that will assert the main argument. In the «Main part», the studied issues and the raised questions should be explained and analyzed in detail in the sections. In the «Conclusion», the author should reinforce the importance of the main idea, emphasize his scientific contention and appreciate his topic in personally relevant ways, and it is notable to shine the scientific novelty and the benefits of the work and to offer suggestions and recommendations.

### Rules of preparing of articles and scope

1) The articles submitted for the editorial must meet the following requirements, including the conditions set out for the periodical scientific publications presented by the Higher Attestation Commission under the President of the Republic of Azerbaijan:

- ✓ Title of the article, author's name, surname, position, academic degree, name and address of the organization where he works, E-mail address should be written on the title page of the article.
- ✓ Abstract (in Azerbaijani and English) should be approximately 70-120 words, with the same content.
- ✓ Keywords (in Azerbaijani and English) should consist of 3-5 words or phrases.

2) The text should be typed in Microsoft Word, A4 (210x297mm), Times New Roman – 14, interval – 1, 15, size 6-15 sheets.

3) The title and subheadings of the article should be written in bold, with only the first letter capitalized. Before and after the headline and subheadings, tables and figures (also equations and formulas), a single line spacing should be added. Pages should be numbered in the lower right corner.

4) The table and pictures must be named, and the name should be placed in the left hand corner above the table, and pictures name should be placed in the left-hand corner under picture.

5) There should be references to scientific sources related to the topic of the article, as well as the sources noted at the end in "used works" should be mentioned in the text as [Kazimov G. Baku, 2021] or [1, p.52], and finally numbered in alphabetical

order. If there is an online reference in the text, you should put an internet link below and number it from one. The information on each reference in the Literature List must be in full, accurate and the native language. The bibliographic description of the source should be based on its type (monograph, textbook, scientific article, etc.). The name of the article, report or thesis should be cited when referring to scientific articles, materials or theses of symposium, conference or other prestigious scientific events. All sources referenced in the text should be cited in the “Used Works or References” list, along with the page numbers, as specified in the following examples:

a) *References to books:* Kazimov G. (2007). Modern Azerbaijani language. Syntax. Baku, Tahsil. 496 p.

b) *References to journals:* Hasanova S. (2021). Ashug Alasgar and our literary language. "Teaching of Azerbaijani language and literature", № 4. Baku, “N print studio”, p.25-34.

c) *Reference to the articles in scientific events:* «End of a transitional period in Azerbaijan economy: analysis and conclusions. Problems of National Development Model Formation" (2010). Materials of the scientific-practical conference of the Republic. Baku, East-West, p.314-316.

d) *Dissertation thesis and abstracts*: Mammadov H.B. (2013) The Republic of Azerbaijan as an actor in contemporary international political processes. Doctoral dissertation abstract, Baku, Science. 44 p.

e) *Copyright and Patents:* Aliev S.G., Jalalov K.Kh. A.S. 163514, USSR // B.I. 1988, No. 4, p.50 Langsam M., Savoca A. C.L. Pat. 4759776, USA, 1988.

f) *Internet pages* (references to web pages should be indicated in full): For example: http://www.tall.edu.az

6) The article should give preference to scientific materials, monographs and other reliable sources for the last 5-10 years.

7) The article must be submitted to the editorial office in 3 forms: by e-mail *(tall@edu.gov.az)*, or through the journal's website *(http://tall.edu.az)*, or in printed form by the author of the article. The original signature of the author is important.

**Acceptance and publication of articles**

After review, the presented article will be sent to experts to be read out. If the article corresponds to the journal profile and meets the requirements, the printing is provided. If the author wishes, a document on his / her article acceptance may be issued. Articles are published on the principl of rotation.

**Copyright**

# К СВЕДЕНИЮ АВТОРОВ

*Технические требования к статьям опубликованным в журнале «Преподавание Азербайджанского языка и литературы»*

**Содержание статей**

Статьи должны быть посвящены актуальным темам и соответствовать академическим требованиям в соответствии с содержанием и стилем журнала. Статьи должны состоять из «Введение» (Introduction), «Основной части» (Main part) и «Заключения» (Conclusion). В «Введение» должно обосновываться актуальность темы, в «Основной части» исследуемые задачи и поднятые проблемы должны быть объяснено подробно по разделам, а в «Заключения» должно основываться на характере области статьи. Важность приложения, научный вывод, сделанный автором, научная новизна работы, экономические выгоды и т. д. должны быть четко указано и должны быть выдвинуты предложение и рекомендации.

**Структура и правила составления статей**

1) Статьи, представленные в редакцию, должны соответствовать следующим требованиям, в том числе условиям, установленным Высшей Аттестационной Комиссией при Президенте Азербайджанской Республики, для периодических научных публикаций:
   - ✓ На титульном листе статьи должны быть указаны название статьи, имя и фамилия, должность, ученая степень, название и адрес организации, адрес электронной почты автора.
   - ✓ Ключевые слова (на азербайджанском и английском языке) должны состоять из 3 - 5 слов или фраз.
   - ✓ Резюме (на азербайджанском и английском языке) должна составлять примерно 70-120 слов с одинаковым содержанием.

2) Текст статьи должен написан в программе Microsoft Word, A4 (210x297 мм), Times New Roman – 14, интервал – 1, 15, объем 6-15 страниц.

3) Названия статьи должен писаться с жирным шрифтом с большой буквой. До и после заголовка и подзаголовков, таблиц и рисунков (также уравнений и формул) должен быть выпущен один междустрочный интервал. Страницы должны располагаться последовательно в правом нижнем углу.

4) Таблицы и рисунки должны иметь имя и это имя для таблиц должен перемещаться над таблицей в левом углу, а для рисунков под рисунки в левом углу и последовательно пронумероваться.

5) Необходимые ссылки на научные источники, относящиеся к теме статьи, должны быть приведены в тексте как ссылки на «Использованную литературу» в тексте [Казымов Г. Баку, 2021 г.] или [1, с.52] и в конце должны быть упорядочены в алфавитном порядке. Если в тексте есть онлайн-ссылка на научную литературу, интернет-ссылка должна быть показана ниже, поставив 1. Информация по каждой ссылке в списке литературы должна быть полной, точной и на языке оригинала. Библиографическое описание справочного источника следует представить в зависимости от его типа (монография, учебник, научная статья и т). При ссылке на научные статьи, материалы или тезисы симпозиумов, конференций и других престижных научных мероприятий необходимо указывать название статьи, доклада или диссертации. Все источники, на которые есть ссылки в тексте, должны быть включены в список «Использованная литература» вместе с номерами страниц в следующих примерах:

а) *Ссылки на книги:* Казимов Г. (2007). Современный азербайджанский язык. Синтаксис. Баку, Тахсил. 496 с.

б) *Ссылка на журналы:* Гасанова С. (2021). Ашуг Алесгар и наш литературный язык. «Преподавание азербайджанского языка и литературы». № 4, Баку, «N print studio», с.25-34.

в) *Ссылки на статьи в сборнике (конференция, симпозиум и т. д.):* «Конец переходного периода в экономике Азербайджана: анализ и итоги. Проблемы формирования модели национального развития». (2010). Материалы республиканской научно-практической конференции. Баку, Восток-Запад, с.314-316.

г) *Диссертации и авторефераты:* Мамедов Х.Б. (2013) Азербайджанская Республика — современная международная политика как актер в процессе. Автобиография докторской диссертации, Баку, Наука, с.44.

д) *Авторские свидетельства и патенты:* Алиев С.Г., Джалалов К.Х. А.С. 163514, СССР. БИИ 1988, № 4, с.50 Langsam M., Savoca A. C.L. Патент 4759776, США,1988

е) *Ссылки на веб-страницы:* Ссылки на веб-страницы должны быть полностью показаны. Например: http://www.tall.edu.az

6) В статье предпочтение отдается научным статьям, монографиям и другим надежным источникам написанном последние 5-10 лет.

7) Статью можно представить в редакцию в 3-х формах: либо по электронной

почте *(tall@edu.gov.az)*, либо через сайт журнала *(http://tall.edu.az)*, либо в печатном формате автором статьи. В оригинале обязательна подпись автора(ов).

**Прием и публикация статей**

Представленные статьи после ознокомлений в редакции отправляют (после того, как имя автора останется конфиденциальным) экспертам для прочтения. Если статья соответствует профилю журнала и требованиям, тогда предоставляется в печать. По желанию автора может быть выдан документ о его принятии статьи. Статьи публикуются по принципу очереди.

**Авторские права**

Авторские права на статьи, публикуемые в журнале защищены и все права на публикации этих статей принадлежит журналу *«Преподавание Азербайджанского языка и литературы»*. Статьи, опубликованные в журнале, допускаются только с письменного разрешения редакции для других опубликованных публикаций (кроме статьи, опубликованной как тезис). А для использования цитатов можно только с одним условиям показать источника. Рукописи, отправленные для печати в другое периодическое издание или в раннем времени напечатанные в другом журнале подача в редакцию, противоречит этику авторов. Статьи, не соответствующие вышеуказанным требованиям, не принимаются. Для опубликования статьей предназначен представить автору одну копию журнала.

